*Bu kitab “**Əlağa Vahid.** Seçilmiş əsərləri. İki cilddə”*
(*Bakı, Azərnəşr, 1975*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edənlər: **Qulam Məmmədli**
**Rəşid Quliyev**
**Ataxan Paşayev**

Ön sözün müəllifi: **Safurə Quliyeva**

**894.3611 - dc 21**
**AZE**
**Əlağa Vahid. Seçilmiş əsərləri**. Bakı, “Lider nəşriyyat”, 2005, 472 səh.

Azərbaycanda, eləcə də Yaxın Şərqdə məşhur qəzəl şairi kimi şöhrət qazanmış Əlağa Vahidin yaradıcılıq bioqrafiyası maraqlı və özünəxas cəhətlərə malikdir. Dahi Füzulini özünün böyük ustadı adlandıran Əlağa Vahid, onun bədii üslubundan, işlətdiyi əruz bəhrlərindən, təsvir və ifadə vasitələrindən, qafiyə və rədiflərindən bilavasitə faydalanaraq öz yaradıcılığında bədii sözün məna dolğunluğuna, ifadə səlisliyinə nail olmuşdur.

Əlağa Vahid qəzəl yaradıcılığında püxtələşdikcə, klassik qəzəl məktəbinin istedadlı davamçısı kimi, öz dəsti-xətti ilə seçilmiş, qəzəlləri və satirik şeirləri xalq arasında sürətlə yayılmış, ürəklərə yol tapmış, sevilmiş və dillər əzbəri olmuşdur. Şair qəzəl janrının mövzu dairəsini xeyli genişləndirmiş, Vətənə, xalqa məhəbbətini sadə, adi xalq danışıq dilində əruzun ritmik bəhrlərində, qoşa misralarla uğurla şerə çevirmişdir.

Əlağa Vahidin “Seçilmiş əsərləri”nə müxtəlif illərdə qələmə aldığı qəzəlləri, şeirləri və poeması daxil edilmişdir.

**ISBN 9952-417-33-9**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## POEZİYAMIZIN VAHİDİ

İyirminci yüzilliyin əvvəlində Bakıda ictimai-iqtisadi, mədəni həyat ildən-ilə daha dolğun məzmun alır, hər sahədə böyük bir canlanma, irəliləyiş müşahidə olunurdu. Şəhərdə yeni-yeni binalar, müəssisələr, məktəblər tikilir, maarif işləri genişlənir, getdikcə çeşidi artan qəzet və jurnallar daha çox evlərə yol tapırdı. "Molla Nəsrəddin" əhvalatları danışılmayan, "Hophop"un (M.Ə.Sabirin) şeirləri deyilməyən ailə tapmaq mümkün deyildi.

...Əlağanın on-on iki yaşı olardı (o, 1894-cü ildə Bakı şəhərində dünyaya gəlmişdi). Yarıkönül getdiyi mollaxanada o, iki il oxuduqdan sonra yoxsulluq üzündən təhsilini yarımçıq qoyub işləməyə başlamışdı. Əvvəl tütün fabrikində çilingər şagirdi, sonra dülgər işləmişdi. Atası çox erkən vəfat etdiyi üçün əmisinin himayəsində böyüyürdü. Yeni üsullu məktəblərdə isə təhsil almaq istəyinin əlçatmaz olduğunu başa düşürdü.

O dövrdə Bakıda və ətraf kəndlərdə yaşayanlar arasında "meyxana" deyilən xalq şeri növü geniş yayılmışdı. Müəyyən bir səbəbdən toplaşmış şənlik məclislərində, daha geniş miqyasla toylarda "söz qoşmaq" qabiliyyəti olan bir neçə adam (gənc də, yaşlı da ola bilərdi) ortaya çıxırdılar. Onlar məclisdəkilərdən birinin təklif etdiyi qafiyəli misranın məna və ahənginə uyğun bədahətən (fikirləşmədən) bəndlər deməyə başlayırdılar. Məzmun şux, yumorlu; ahəng oynaq ritmli olur, meyxananın sözləri məclisdəkilərin çırtıq çalmasıyla yaxud nağara, dəf ilə müşayiət edilirdi. Meyxana deyənlər arasında bir növ sənətkarlıq yarışı gedirdi. Məclisdəkilər daha mənalı, hazırcavab və sözü məharətlə yerində işlədə bilənləri öz alqışları ilə fərqləndirir və qiymətləndirirdilər. Çox güman ki, yeniyetmə Əlağanın söz sənətinə marağı, şeir qoşmaq istedadının münbit zəmini elə bu meyxana məclisləri olmuşdu. Çünki artıq gənc yaşlarında onun meyxana ustadı kimi ad çıxarması barədə müasirlərinin xatirələrində maraqlı məlumatlar mövcuddur.

Əlağanın cəmiyyət həyatına fəhlə kimi gəlməyinə baxmayaraq, şerə olan marağı, həvəsi onu mütaliəyə sövq edirdi. Erkən yaşlarından dahi qəzəl ustadı Məhəmməd Füzulinin bir çox qəzəllərini əzbər bilir, Mirzə Ələkbər Sabirin satiralarının ahəngdar bəhrlərdə sadə deyim tərzindən təsirlənir, Seyid Əzimin mənzum hekayələrini, qəzəllərini

dönə-dönə oxuyurdu. Bədii parçaların sıx-sıx verildiyi qəzet və jurnalları da müntəzəm mütaliə edir, bədii yaradıcılıqla dərindən maraqlanır, dövrün problemlərinə, tələblərinə diqqət yetirirdi. Az keçmir ki, özü də Sabiranə şeirlərlə mətbuatda görünməyə başlayır.

Gənc Vahid "Babayi-Əmir", "Tuti", "Məzəli", "Ovraqi-nəfisə" kimi jurnallarda 1915-1916-cı illərdə çoxlu satirik şeirlər dərc etdirmişdir. Bu şeirlərin həm ideya-məzmununda, həm poetikasında ustadı M.Ə.Sabirin təsiri aydın duyulsa da, getdikcə ahəngdə, məcazlı deyimlərdə və bədii ifadə vasitələrində gənc şairin dəsti-xətti özünü hiss etdirirdi. Təsirlərdən durulmaqda olan Vahidin bədii üslubunda meyxana poetikasının da izləri sezilirdi:

Bir kəndçi ola xam, gələ at almağa nagah,
Vay halına, dəllallar işindən ola agah,
Bir növi soyarlar onu, göstərməsin Allah!..
Qəssablığı bunlar kimi şeytan da bacarmaz,
Şeytan nəçidir, cin nədi, xortdan da bacarmaz

Yaxud:

Aqilin hər işi dünyada fənadır, görürəm,
Arif olmaq özü, bil, başa bəladır, görürəm.

Ə.Vahidin 1916-cı ildə ayrıca nəşr olunmuş "Tamahın nəticəsi" adlı ilk kitabçasında uşaqlar üçün nəzmə çəkdiyi üç mənzum hekayəsi verilmişdir. Bu kitabça istedadlı gəncin necə bir ciddiyyət və qətiyyətlə yaradıcılıq aləminə gəldiyini sübut edirdi. O, qəzəl janrına xüsusilə həvəs göstərdiyi üçün ustad qəzəlxanların toplaşdıqları məclislərdə olmağa isə daha çox can atırdı. Hərdən ürəklənərək belə yığıncaqlarda öz şeirlərini oxuyur, deyişmələrdə iştirak edir, ustad şairlərin razılıq etdiklərini görüb daha da həvəslənirdi. Klassik şeir ənənələrini, əruzun musiqili bəhrlərini zəngin mütaliəsi sayəsində kamil mənimsəmişdi. Bədiiliyin şərtlərini yaxşı bilirdi, sözləri vəznə görə, mənaya xələl gətirmədən ahəngdar səsləndirə bilmək qabiliyyəti xüsusilə üstün idi. Bir dəfə Bakı ədəbi mühitinin tanınımış qəzəl şairi Mirzə Əbdülxalıq Yusifi Ələğaya "Vahid" təxəllüsünü götürməyi məsləhət bilir. Sonralar o, qəzəllərindən birində yazırdı:

Mənə təxəllüsü Yusif verib dedi: Vahid,
Gərək də fərqlənəsən sən buxudnimalar ilə.

Yaradıcılığının ilk dövrünə aid şeirlərində, istər satirik, istərsə də qəzəl janrında olsun, bədii dilin hədsiz klassik poeziya dilinə yaxınlığı müşahidə olunur. Ənənəvi məcazlar, təşbehlər, ərəb-fars izafətləri, qafiyə və rədiflərdə Vahidin özünəməxsus yazı tərzi çətinliklə seçilirdi. Nisbətən, satirik şeirlərində Vahid bədii görümünün, Vahid poetik deyiminin əlamətləri daha tez üzə çıxmağa başladı və diqqət çəkdi. Bu şeirlərin əsas tənqid hədəfi yoxsul, aciz insanlara qənim kəsilən, aqil kəslərə zülm edən cahillər idi. Onlar molla, dəllal, qoçu libası geyinsələr də, mənəviyyatca bir sifətdə idilər və şairin kəskin istehzası ilə ifşa olunurdular. Həmçinin bu satirik şeirlərdə meyxana üslubuna xas bir məzəlilik duyulur, qafiyələrin daha səlis, ahəngin daha ritmik olması nəzərə çarpırdı. Təsadüfi deyil ki, Vahid bu xalq şeri janrını məhəlləçilikdən çıxarıb, ona ictimai məzmun gətirir və mətbuatda çap etdirib yaşadığına hökm verirdi.

İyirminci illərdə Bakı ictimai-mədəni həyatında Tənqid-Təbliğ teatrının fəaliyyəti qabarıq idi. Teatrın əsas məqsədi cəmiyyətdəki nöqsanları, yaramazlıqları qamçılayıb, geriliyin köklərini aşkara çıxarmaq idi. Tamaşalarda artistlər tərəfindən oxunan satirik kupletlərin böyük bir qismi Vahid tərəfindən qələmə alınmışdı. 1925-ci ildə nəşr olunmuş “Meyxanalar” kitabının üç müəllifindən biri də Ə.Vahid idi.

Göründüyü kimi, gənc Vahidin yaradıcılığı iki istiqamətdə inkişaf edirdi: satirik şeir və klassik poeziyanın qəzəl janrı. İyirminci illərin əvvəllərində Azərbaycanda yeni ictimai quruluş – sosializm cəmiyyəti yaranmaqda idi. Fəhlə-kəndli dövləti kimi fəaliyyətə başlayan yeni hakimiyyətə yoxsul təbəqələr böyük ümidlər bəsləyirdilər. Mədəni-maarif sahəsində aparılan kütləvi savadlanma tədbirləri, bir qisim adamların güzəranını yaxşılaşdıran yeni istehsalat müəssisələrinin yaradılması ilə sovet dövləti xalqın etimadını qazan bilmişdi. Ancaq keçmiş adət və ənənələrə, minillik kökü olan ədəbi-mədəni irsə qarşı aparılan təbliğat-təşviqat işləri ziyalı insanları düşünməyə vadar edir, onları seçim faktı qarşısında qoyurdu.

Göründüyü kimi, Vahid öz ədəbi təhsilini xalqın mənəvi-mədəni varlığında yaşayan sənət məktəblərindən almışdı. O, əvvəl-əvvəl ustad meyxanaçı kimi məşhurlaşsa da, böyük məhəbbəti Füzulidən yadigar

qalan qəzələ idi. Yeni cəmiyyətin aparıcı qüvvələri isə “feodalizm dövrünün qalığı” kimi qəzəli də, əruzu da, hətta Füzulinin özünü də yeni quruluş üçün yararsız hesab edirdilər.

Vahid böyük ustada məhəbbətində, sədaqətində “sabitqədəm” idi. O, yaradıcılığının ilk mərhələsində Füzulinin bədii üslubundan, işlətdiyi əruz bəhrlərindən, qafiyə və rədiflərdən bilavasitə faydalanaraq, bədii sözün məna dolğunluğuna, ifadə səlisliyinə nail olmağa səy edir, onun qəzəllərinə nəzirə və təxmislər yazırdı. Vahid özünü “Böyük Füzulilərin “xaki-payinin biri” adlandırır, klassik qəzəlin məzmun və forma ənənəsinə böyük əhəmiyyət verirdi. O, Füzuli ədəbi dili üçün səciyyəvi olan metaforik ifadələr, məcaz və təşbehlər işlədir, lirik məzmunu mürəkkəb ərəb-fars tərkibləri ilə mənalandırmağa xüsusi səy göstərirdi:

Ey hilaləbru, degil xurşid, hər gün sübhdəm
Çərx əksin görməyə göydən yerə güzgu tutub.

Çeşmi məxmurun müsəxxər qıldı canü könlümü,
Gör necə səyyadi mahirdir, iki ahu tutub.

Ay batıb, ya gün tutulmuş, əbri zülmətdir məgər,
Yoxsa yarın gül üzün geysuyi ənbərbu tutub.

Əlağa Vahid öz lirik “mən”ini də ustadın poetik məcazlarına uyğun “dideyi-giryan”, “hali-pərişan”, “qəmi pünhan”, “bülbüli-şeyda” – deyə adlandrır, gözəlini “güli-xəndan”, “zülfi-siyah”, “çeşmi-xumar”, “mahi-camal” – deyə təşbehləndirirdi. Böyük ustadın “Qəzəl de ki, məşhuri dövran ola, Oxumaq da, yazmaq da asan ola” tövsiyəsini Vahid söz sənətinin kamillik zirvəsi kimi dərk etmiş və bütün yaradıcılığı boyu bu zirvəyə doğru yol almışdır.

Vahid qəzəl yaradıcılığında püxtələşdikcə klassik qəzəl məktəbinin istedadlı yetirməsi kimi, öz dəsti-xətti ilə seçilməyə başlayırdı. Otuzuncu illərdə və sonralar, onun qəzəlləri ədəbi tənqiddəki yanlış meyllər nəticəsində dövrü mətbuata buraxılmasa da, xalq arasında böyük sürətlə yayılır, tanınmış müğənnilərin oxuduqları muğamat və mahnı mətnləri kimi ürəklərə yol tapır, sevilir, dillərdə əzbər olurdu.

Yaşadığı tarixi-ictimai mərhələdə bütün ədəbi-mədəni yaradıcılığın ideya-məzmununu hakim dövlət siyasətinə uyğun istiqamətləndirmək cəhdlərinə və tələblərinə baxmayaraq, Vahidin aşiqanə qəzəl yaratmaq yolundakı dəyanəti, bir növ, Füzuli sənətinə dərin məhəbbətin, ən gözəl bədii təsdiqi idi. O yazırdı:

Cahanda baqi qalan eşq mülküdür,
Ondan qalan nə varsa da viranədir mənə.

Klassik qəzəl nümunələrindən fərqli olaraq, Vahidin şeirlərində emosional-hissi çalarlar daha gurşad idi, lirik ovqatda nikbinlik, çeviklik tədricən artmaqda, onun bədii üslubunun parlaq təzahürünə çevrilməkdə idi. Görkəmli ədəbiyyatşünas alim Ə.Mirəhmədov doğru olaraq yazırdı: "Vahidin qəzəlləri sevən aşiqin psixologiyasının saysız-hesabsız təzahürləri haqqında təsəvvür yaradır: şikayət,sevinc, şuxluq, qürur, küskünlük, ümid, peşimanlıq, xeyir-dua, tənqid, məşuqəyə valehlik, zarafat, istehza, dialoq, hətta qarğış..." Belə zəngin mənəvi-hissi rəngarənglik qəzəllərrin həm obrazlı deyim tərzində, həm də ritmik ahəngində təkrarsız poetik vasitələrlə bədiiləşirdi:

Bu şirinlik, bu lətafət ki, sənin var gözəlim,
Sənə güldən də mən əla deməyim, bəs nə deyim?!..

Yaxud:

Heç kəs ki, yeni meyvəsin istərsə baharın,
Baxsın bu gözəl dilbərə – xalis çiyələkdir...

Vahidin qəzəllərində, sadə adi xalq danışıq dilində işlənən söz və ifadələr ahəngdar bir vəhdətdə yeni məzmun kəsb edir, səmimi, mülayim təbiətli, zarafatcıl bir Aşiq obrazı yaranırdı. O, əlçatmaz gözələ olan məhəbbəti sarıdan ah-nalə etməkdən çox, adi insani hiss və münasibətlərdən bəhs açır, bədii dilin özünəməxsus xalları sayəsində iyirminci əsrdə də qəzəlin sevilən bir janr olduğunu sübuta yetirirdi. Şairin "Bir dənəsən" , "Gözlərin qaradır", "Kimin istəkli yarısan", "Xoşum gəlir", və s. qəzəlləri məhz xalq duyum və bədii deyim tərzinə son dərəcə yaxınlığına görə geniş yayılmış, müəllifinə şöhrət qa-

zandırmışdı. Bundan başqa ilk dəfə idi ki, qəzəl janrında xalqa, Vətənə bəslənilən saf duyğulardan bəhs açılır, sosial mövzulara yer verilirdi.

Bəlkə də qəzəl janrının əbədi yaşarlığını bir daha təsdiq naminə, Vahid onun movzu dairəsini xeyli genişləndirmiş, Vətənə, xalqa məhəbbətini də əruzun ritmik bəhrləri ilə qoşa misralarda uğurla şerə çevirmişdir. Yalnız ona xas dərin bir səmimiyyətlə yazırdı:

Əsiri aşiqiyəm öz xalqımın, öz yurdumun,
Sevməyən öz xalqını, öz yurdunu divanədir.

Yaxud:

Xalqına fürsət var ikən xidmət et Vahid, müdam,
Ta ki, sən də bu sədaqətlə cahanda ad qıl.

Yaradıcılığında qəzəl janrına üstünlük verdiyi üçün öz dövründə ədəbi-ictimai mühit tərəfindən sənətkar qiymətini ala bilməyən şair, həmişə xalqın ona bəslədiyi rəğbət və məhəbbətdən təsəlli tapmış, şeirlərində iftixarla yazmışdır:

Bu fəxrdir mənə Vahid ki, xalq şairiyəm,
Böyük Füzulilərin xaki-payinin biriyəm,
Bütün bəşər yaşadıqca mən ölmərəm, diriyəm...

Vahidin bir sıra qəzəllərində mühitlə, xalqın taleyi, güzəranı ilə bağlı elə beyitlər də var ki, onları bütün dövrlər üçün əhəmiyyətli sayıla biləcək müdrik kəlamlar cərgəsinə qoşmaq mümkündür. Şair yazırdı:

Aciz xəta qılırsa, ətayə ümidi var,
Heç yerdə yox xilas yolu zülmkar üçün...

Torpaq dolsun çeşminə torpaq satan namərdlərin,
Mərd odur ki, düşmənə can versə, torpaq verməsin...

Xalqın evi bərbad olamaz bil bunu Vahid,
Hərgah onu təmir edə memari-ədalət.

Əlağa Vahidin qəzəlləri otuzuncu illərdən bəri geniş yayılmış, dəfələrlə nəşr edilmişdir. Bu sahədə xüsusilə M.Müştaqın, M.Rzaquluzadənin, Q.Məmmədli, R. Quliyev və A.Paşayevin xidməti sayəsində şairin əsərləri toplanıb, klassik divan ədəbiyyatının layiqli incisi kimi tərtib edilmişdir. Ə.Vahid irsinin tədqiqatçısı Məmməd Nuruoğlu "Əsər ki qaldı cahanda" (Bakı, 1983) elmi əsərində əvvəlki nəşrlərə böyük diqqətlə yanaşaraq, özünün tərtibində (1982) daha kamil toplu yaratmağa səy etmişdir. O, tutarlı dəlillərlə və bu vaxtadək Ə.Vahidin kitablarında verilən 64 satirik şerin həqiqi müəlliflərini müəyyənləşdirmiş, bir sıra beytlərdə buraxılan səhvləri aşkar etmişdir. Təəssüf ki, şairin əsərlərinin son nəşrlərində də müxtəlif səpgili qüsurlara yol verilmişdir. Şairin divanını latın qrafikası əsasında tərtib edərkən mümkün qədər nəzərə çarpan nöqsanları aradan qaldırmağa çalışmış, bütün əvvəlki nəşrləri müqayiəsli şəkildə daha bitkin külliyyat yaratmağa səy etmişik.

Ə.Vahid ömrünün kamil çağında böyük təvazö ilə yazmışdır:

Deyərdim, əhli-qələm, Vahid, əfv edərsə məni,
Böyük Füzulinin yadigarı mən özüməm.

İyirminci yüzilliyin böyük qəzəl şairi Əlağa Vahidin ədəbiyyatımız tarixində mövqeyini, onun məhz yaşadığı sosial mühitdə əruza, qəzələ göstərilən təzyiqlər, qadağalar fövqündə dayanaraq, poeziyamızın bu zərif, mənalı, müdrik janrını qoruyub yaşatması, zənginləşdirməsi müəyyənləşdirilmiş, möhürlətmişdir. Onun qəzəlləri milli poeziyamızda özünə xas rəngi, rayihəsi, ahəngi olan qiymətli sənət inciləri kimi əbədi qərar tutmuşdur.

***Safurə Quliyeva***

* * *

Yanında dilbərimin etibarım olmasa da,
Yenə qəmin çəkərəm, qəmküsarım olmasa da.

Bədəndə yarı canım qalmayıb, gedib yarım,
Gərək dözəm qəmi-hicranə, yarım olmasa da.

Günüm ki, tar olub o zülf əlindən, ey tari,
Tərənnüm eylə, səni tari, tarım olmasa da.

Üzün xəyali bəsimdir behişti-kuyində,
Yüz il xəyalıma gəlməz, baharım olmasa da.

Ləbinlə məst gözün hər düşəndə xatirimə,
Şərabə rəğbətim artır, xumarım olmasa da.

Mənim bir ahim ilə şəmlər yanır gecələr,
Toxunma, şöleyi-eşqəm, şərarım olmasa da.

Kəməndi-zülfilə, Vahid, özüm şikar oldum,
Mənim o ahu baxışlı şikarım olmasa da.

* * *

Vardır indi, gözəlim, başqa məlahət Bakıda,
Gəl edək şövq ilə hər yanı səyahət Bakıda.

Gələcək nəslə bu tarixi şərafətdir ki,
Görürük özgə səfa, özgə lətafət Bakıda.

Bu gözəl ölkə işıqlandırır hər bir tərəfi,
Gülür insan üzünə nuri-səadət Bakıda.

Çıx tamaşaya, xüsusən Xəzərin sahilinə,
Baği-cənnət, daha tərifə hə hacət Bakıda.

Get-gedə qalmayacaq köhnə binalardan əsər,
Tikili, gör, yeni minlərcə imarət Bakıda.

Hansı bir sahə olursa, vətən oğlanlarının,
Borcudur, göstərə hər işdə məharət Bakıda.

Əsrlərdir, qocaman Qız qalası qalmışdır,
Göstərir xalqa vüqar ilə iqamət Bakıda.

Bakıdır yurdumuzun mərkəzi, Şərqin qapısı,
Haqlıdır, xalqımız eylərsə fəxarət Bakıda.

Daha bundan belə öz ölkəmizin məhsuli
Edəcək xəlqə məramınca kifayət Bakıda.

Sülhə doğru nə çətinlik, nə fəlakət var isə,
Onu dəf etməyə var bizdə cəsarət Bakıda.

O gün olsun ki, bütün düşmənimiz xar olsun,
Eyləyək şadlıq ilə gündə ziyafət Bakıda.

Vahidəm, mən də bu yurdun, bu elin şairiyəm,
Artırır zövqümü artdıqca təravət Bakıda.

* * *

Könüllər qan olur sənsiz güli-həmrayə baxdıqda,
Gözəllər yad edər xurşidi-ruyin ayə baxdıqda.

Dəhanın gərçi söz yox, nöqteyi-elmi-müəmmadır,
Vəli, bu barədə çox şərh var mənayə baxdıqda.

Gözümdə tifltək oynar dəmadəm əksi-ruxsarın,
Xəyali-arizinlə hər zaman dəryayə baxdıqda.

Qiyamət macərasından məni qorxutma, ey zahid,
Qiyamətdir mənə ol qaməti-rənayə baxdıqda.

Tapılmaz dəhrdə təşxis edən əlavü ədnani,
Hərə öz fəhminə məğrurdur dünyaya baxdıqda.

Əgər gül ləblərin mey məclisində keçsə xatirdən,
Əlimdə qan olur badəm meyi-minayə baxdıqda.

Fəzayi-eşqdə divanəlikdən başqa şey yoxdur,
Birər əfsanədir Məcnun ilə Leylayə baxdıqda.

Mənim aşiqliyim Məcnundan artıqdır, bilir aləm,
Onu yad eyləməz hər kim məni-rüsvayə baxdıqda.

Təbiətdə nə gizli sirlər var, indi zahirdir,
Qalır heyrətdə insan hər büti-zibayə baxdıqda.

Səni gülzar içində gül görərkən yad edər ellər,
Məni xatırlayarlar bülbüli-şeydayə baxdıqda.

Məhəbbətsiz, gözəlsiz gün keçirmək heç nədir, Vahid,
Yenə sevmək, sevilmək yaxşıdır dünyaya baxdıqda.

* * *

Ey gül, yanıram qeyrilə sən həmdəm olanda,
Bülbül alışar xar ilə gül məhrəm olanda.

Çoxlar olub ol zülfi-pərişanın əsiri,
Yığ, topla bu Məcnunları fikrin cəm olanda.

Tər qətrəsi vermiş üzünə başqa lətafət,
Gül yarpağı ziynətli olur şəbnəm olanda.

Təklikdə cəhənnəm keçir eşq əhlinə hər yer,
Yar ilə ona cənnət olur bahəm olanda.

Canană ürək sirrini dəmsiz demək olmaz,
Hal əhli cəsarətli olurmuş dəm olanda.

Düşmən ola dünya qədəri, onlara batmaz,
Hərgah iki dostun arası möhkəm olanda.

Bir naz ilə can qoymadı məndə hələ gəl, gör
Aləm nə olur ortada yüz çəm-xəm olanda.

Qiymət verər ol qaşı hilalın sənə, Vahid,
Başın ağarıb onda ki, qəddin xəm olanda.

* * *

Dindir məni hərdən, gözəlim, fürsət olanda,
Vəslin bizə bir an, nə olar, qismət olanda?

Bax gör, məni zülfün nə pərişanlığa saldı,
Bir gün açaram dərdimi cəmiyyət olanda.

Yüzlərcə cəfa etsən, unutmaz səni könlüm,
Fikrimdəsən, ey gül, yenə hər söhbət olanda.

Biganə əgər olmasa, tez vəslə yetərdik,
Kim xeyr görüb düşməni kəmfürsət olanda?

Zülfün ki, tutub ruyini, çox qorxuram ondan,
Aləm toxunar bir-birinə zülmət olanda.

Könlüm necə sənsiz, gözəlim, naləsiz olsun,
Bülbül dayanarmı gülünə həsrət olanda?

Vahid, hələ qarşında böyük bir gələcək var,
Dünya bizə ləzzət verəcək cənnət olanda!

* * *

Şərab ola, mən olam, bir də nazlı dilbər ola,
Bir özgə aləmi vardır, əgər müyəssər ola.

  

Səfayi-məclisi-mey min behiştdən artıqdır,
Bir əldə gül tuta canan, bir əldə sağər ola.

Olanda məst, aça zülfün nigar, nəşəsi var,
Ümumə zövq verə bəzmi-mey, müəttər ola.

Büsati-badədə hal əhlinin fədası olum,
Şərabı qal ilə içmə, əgər peyəmbər ola.

Əsiri-zülfünəm, ey şux, gəl acıqlanma mənə,
Əsirə hörmət edərlər, əgərçi kafər ola.

Nə Leyli sən kimi olmuş, nə mən kimi Məcnun,
Nəkarədir gəlib onlar bizə bərabər ola?!

Görəndə, Vahid, üzün yarımın, əsir könlüm,
Nə növ sakit olum: od ola, səməndər ola?!

* * *

İstərəm mən o gülü, öz güli-xəndanım ola,
O da öz könlünü versin mənə, cananım ola.

Təki canan ilə bir yerdə günüm xoş keçsin,
Arizu eyləmərəm bağü gülüstanım ola.

Qıymayan canını aşiq deyil öz yarı üçün
Mən fəda eyləyərəm yarıma min canım ola.

Gündə yüz yol edərəm canımı qurban o gülə,
O da bir yol dolanıb başıma qurbanım ola.

Bu pəriçöhrələrin bircə gözəllikləri var,
Sevmərəm heç birin, əldə əgər imkanım ola.

Neyləyim könlümə, bir qoymadı asudə məni,
Görüm, ey kaş ki, viran dili-suzanım ola.

Vahid, hər şuxə inandımsa, vəfasız çıxdı,
Bu gözəllərlə mənim həşrdə divanım ola.

* * *

Yüzlərcə xəlq içində əgər əhli-naz ola,
Mümkün deyil ki, sən kimi bir sərvnaz ola.

Bülbül gülün sevir, səni mən, tuti şəkkəri,
Eşq əhli bir şeyə gərək, əlbəttə, baz ola.

Əsl gözəlliyin iki şeydir nişanəsi:
Zülfü qara, sineyi-safi bəyaz ola.

Aşiq gərək düşüb qədəmi-yarə yalvara,
Aşiqlər içrə bəlkə o bir sərfəraz ola.

Bülbül həmişə öz gülünə arizu çəkər,
Vay onda, xardan buna da etiraz ola.

Yar inciyib küsəndə onun başqa zövqü var,
Hərdənbir ortalıqda gərək ərk-naz ola!

Dünyaya gəlməyib elə bir nazənin gözəl,
Dərd əhlinə təsəlli verə, dilnəvaz ola.

Sultani-aləm olsa da Vahid zəmanədə,
Əvvəl gərək əsiri-kamali-Əyaz ola.

* * *

Bir səbəb yox, demə, rüsvayi-cahan olmağıma,
Qönçə ağzın kimi xəlq içrə nihan olmağıma.

Məni, səd heyf, qocaltdı bu gözəllər sitəmi,
Yoxdur ümmid dəxi bir də cavan olmağıma.

Qamətin cilvəsi çeşmimdə gəzər, vəchi odur,
Çeşmətək hər yana, ey sərv, rəvan olmağıma.

Mumiyanın həvəsi, qönçə dəhanın fikri
Səbəb oldu belə binamü nişan olmağıma.

İntizarəm ki, verəm canımı görcək üzünü,
Nola, ey gül, bir əlac et nigaran olmağıma!

Ey Müniri[1]! Yanıram eşq oduna, Azərə[2] de,
Azər olsa, yanacaq şöləfəşan olmağıma.

Vahidəm, dərdü qəmi-qürbətə tabım yoxdur,
Var ümidim yenə ölkəmdə əyan olmağıma.

* * *

Könül, vəfasız olan nazlı yarə yalvarma,
Nə etibar ona, bietibarə yalvarma!

Darıxma, yaxşı-yaman ruzigarımız keçəcək,
Bu beş gün ömrə görə ruzigarə yalvarma!

Sənin də bir gün olar novbaharın, ey bülbül,
Bu zövqsüz, bu səfasız baharə yalvarma.

Fəqirə, acizə, məzlumə ehtiram eylə,
Əduyə, qaniçənə, zülmkarə yalvarma!

Vətən yolunda ölüm mərd üçün səadətdir,
Həyat üçün fələki-kəcmədarə yalvarma!

Müxalif əhlinə baş əymə, sən də Mənsur ol,
"Həqiqət" üstə çəkilsən də darə, yalvarma!

Nə oldu dövləti-Cəmşid, mülki-İsgəndər?
Nə tacidarə, nə bir şəhriyarə yalvarma!

Əgər həyatını, Vahid, xoş etmək istərsən,
Nə gül cəfasını çək, nə də xarə yalvarma!

---

[1] Şair Ağadadaş Müniri
[2] Şair Məşədi Azər Hacı Məmmədzadə

* * *

Demə, ey gül, öləröm, getmə gözümdən o yana,
Gərək aşiq dözüb hər cövrünə yarın, dayana.

Aləmi-eşqdə qanuni-məhəbbət belədir:
Bülbül həsrət gülə, pərvanə gərək odda yana!

Mən də hicran qəmini, qismət ola, çəkdirərəm,
Sənin ol gül üzünə könlümü həsrət qoyana.

Aqibət atəşi-ahimlə rəqib od tutacaq,
Öz cəzasın çəkəcək, qaçsa əlimdən hayana.

Bir mübariz igidəm, qoymaram əğyarı, gülüm,
Cənnəti-kuyinə yol tapsın o gündən bu yana.

Yar üçün aşiq odur, şövqlə candan keçsin,
Kim vəfa bəsləyəcək dostuna can qıymayana?

Sən də, Vahid, vətən uğrunda çalış mərd kimi,
İncə qəlbində böyük hissü-məhəbbət oyana.

* * *

Gərçi dərd əhli içir badəni cansağlığına,
İçirəm mən onu bir afəti-can sağlığına.

Qanmayan kimsə bu qan olmuşa qiymət verməz,
Arif ol, iç meyi-gülgunü qanan sağlığına.

Bil, nə mənayə qədəhlər toxunur bir-birinə,
Qaldırın cami-şərabı yaradan sağlığına.

Cam tut nazlı gözəllərlə, əgər ruhun var,
Qocalar zövq alar içdikcə cavan sağlığına.

Mən cahan zövqünün aludəsi olsaydım əgər,
Məst olardım əbədiyyətlə cahan sağlığına.

Zahidin təninə baxma, rəmazan ayı mey iç,
Qoy o, kövsər suyu içsin rəmazan sağlığına.

Tərki-adət özü cansağlığının düşmənidir,
Durma, iç badəni, ver fikrini cansağlığına.

Xatirimdən keçir əyyami-cavanlıq, Vahid,
Qaldırardım qədəhi piri-muğan sağlığına.

* * *

Ey gül, dağıtma sünbüli-zülfün üzarına!
Ahəstə şanə çək ki, tökülsün kənarına.

Bəsdir, bu qədr naz ilə öldürdün aləmi,
Dünya verilməyib, gözəlim, ixtiyarına.

Meydən ziyadə nəşə verir xəstə könlümə,
Hər dəm baxanda nərgisi-məsti-xumarına.

Kuyində xoş keçər günüm, əğyarə baxmasan,
İndi bu iş qalıb sənin öz etibarına.

Biganə gördü ləzzətini lalə ruyinin.
Bir rəhmin olmadı bu dili-dağdarına.

Hər kim ki, aşiqəm dedi, Mənsurtək sənə,
Düşdü kəməndi-silsileyi-tabdarına.

Vahid, biz öz nigarımızın mübtəlasıyıq,
Sən də çalış ki, könlünü ver öz nigarına.

* * *

Buraxma, ey könül, ol nazlı yarı özbaşına!
Rəva deyil, qala ellər nigarı özbaşına.

Gözilə kirpiyi birlikdə qan tökür gecələr,
Əcəb qalıb yenə dərya kənarı özbaşına!

Qərara gəldi rəqib, əl götürsün ol güldən,
Nə etibar ona, dəysin qərarı öz başına!

O qarə gözlünü gözdən kənara qoyma, könül,
Buraxmaz ovçu gözəl bir şikarı özbaşına!

Gülüzlülər nə qədər varsa, bağbanı mənəm,
Necə qoyum belə bir gülüzarı özbaşına?!

Rəqibi yarə tərəf qoymayın, yaxın gəlsin
Ki, gül solar, görə gülşəndə xarı özbaşına!

Ümumə xidmət elə, qorxma Vahid, artarsan,
Ki, sanma el qazanıb etibarı özbaşına!

* * *

Nə qəm, əldə dolu peymanə olandan sonra?!
Sənə ümmid evi meyxanə olandan sonra.

Cami-mey zövqünə vaqif deyil irad eləyən,
Əhli anlar onu, məstanə olandan sonra.

Ya əsir eylə qəra zülfə və ya zəncirə,
Fərqi yox aşiqə, divanə olandan sonra.

Anladım şəm qəmindən nə çəkir pərvanə,
Yarımın şəminə pərvanə olandan sonra.

Ey yaxan könlüm evin, indi gəl abad eylə,
Kim baxar bir evə viranə olandan sonra?!

Eşqi-Leylada nələr çəkdiyini Məcnunun
Bilmişəm aqilü fərzanə olandan sonra.

İndi, Vahid, nə edək bəs, əlimizdən nə gələr
Aşinalar bizə biganə olandan sonra?

* * *

Gəlməsə üstümə yarım mən öləndən sonra,
Tutmaz aram məzarım mən öləndən sonra.

Hansı gülçöhrəni məşhuri-cahan eyləmədim,
Qoy desin şanlı diyarım mən öləndən sonra?!

Gördüyüm hər gözəli şövq ilə təsvir elədim,
Sən də xatırla, nigarım, mən öləndən sonra.

Vətənə, xalqa çalışdım, əbədi xidmət edəm,
Solmasın bağü baharım mən öləndən sonra.

Aşiqəm sənətə, şerə və gözəl musiqiyə,
Dillən, ey sevgili tarım, mən öləndən sonra.

Vahidəm, qaldı sözüm dəhrdə bir dürr kimi,
Yaşayar eldə şüarım mən öləndən sonra.

* * *

Mən neylirəm o dilbəri, şirindil olmasa?
Bülbül baharə eşq yetirməz gül olmasa!

Məcnunun eşqi Leylinin artırdı şöhrətin,
Qədri bilinməz idi gülün, bülbül olmasa!

Əhd etmişəm ki, hər gözələ mail olmayım,
Mənsiz bəlalı könlüm əgər mail olmasa!

Dərdi-fəraqə badə özü bir əlac edər,
Yoxsa bu dərdə kim dayanar, qafil olmasa?!

Canan cəfasını çəkən aşiq rəva deyil,
Vəsli-nigarinə o əgər nail olmasa!

Cövr eylədikcə yar mənə, istərəm onu,
El sevməz, hər ağacda bəhər hasil olmasa!

Vahid, könüldə eşqimi mən gizli tutmaram,
Ürfanıma təərrüz edən cahil olmasa!

* * *

Neyləsin biçarə aşiq, yar əgər yar olmasa?
Xarə yalvarmazdı bülbül, eşqi-gülzar olmasa!

Məstdir ol gül hələ, qoy cövr qılsın bülbülə,
Məstlikdən nifrət etməz kim ki, huşyar olmasa!

Nə gülündən bülbül ayrılmaz, nə aşiq yardən,
Ortada söz gəzdirən naəhl əğyar olmasa!

Sevdiyim canan Züleyxadan da artıqdır mənə,
Yusifin qədri bilinməzdi, xiridar olmasa!

Şəmidə pərvanənin şövqün, çəməndə bülbülün
Kimsə bilməz, eşq dərdinə giriftar olmasa!

Eyşü işrət məclisi, əlbəttə, rövnəqdən düşər,
Naleyi-ney, şuri-mütrüb, nəğmeyi-tar olmasa!

Sənəti-şer ilə, Vahid, sən də göstər bir hünər,
Layiqi-təhsin deyil, kim ki, sənətkar olmasa!

* * *

Ölməzdim, əgər sən kimi bir dilbərim olsa,
Bir afəti-can, şuxi-mələkmənzərim olsa.

Hər gün dolanıb başına qurbanın olardım,
Pərvanəsifət uçmağa balü pərim olsa.

Mən də sevilərdim bütün aşiqlər içində,
Ahuləri Məcnun eləyən gözlərim olsa.

Şövq ilə nisar eylərəm hər bir qədəmində,
Dərya qədəri əldə dürü gövhərim olsa.

Kuyində mənə, qoy nə bilir, eyləsin əğyar,
Əlbəttə, cəzasın çəkər, Allah kərim olsa.

Biganəyə mən bir belə minnətmi edərdim,
Könlüm kimi bir yari-vəfapərvərim olsa.

Vahid, demərəm dərdimi mən başqa nigarə,
Yarım bilir, eşqində nə dərdi-sərim olsa.

* * *

Yar əgər mehrü vəfanı düşünən yar olsa,
Qəm deyildir, bütün aləm bizə əğyar olsa.

Əhli-dil zövqü səfanı ləbi-canandan alır,
Zülmdür aşiqə, cananı dilazar olsa.

Var nə qəm, gözlərinin xəstəsinə yoxdur əlac,
Ləblərin çarə edər, hər necə bimar olsa.

Zülfü, xalı o məhin göz yaşım eylər rövşən,
Gecə aydınlıq olar, sabitü səyyar olsa.

Yar əgər aşiqə qəmxarlıq etməzsə, nə qəm,
Qəm odur, özgəyə məşuqəsi qəmxar olsa!

Gözlərin şövq ilə qan tökməyə çox rağibdir,
Məstdir, bunca xəta eyləməz, huşyar olsa.

Var ümidim mənə, Vahid, daha zülm eyləməyə
Hali-zarımdan o məhparə xəbərdar olsa.

* * *

Zülfünə mişki-xəta söylədi dil, qıldı xəta,
Zülfünün bir telinə müşk ola bilməzdi bəha.

Dili-pürxunimə min yarə vurub qəmzən oxu,
Ney kimi cismimə vurduqca edər ahü nəva.

Dönə-dönə ürəyim qan olu gördükdə ləbin,
Ləli-nabindən alıb baqidə gül zövqü səfa.

Taği-qaşın kimi xəm oldu qəddim gördükdə,
Səcdə etdikdə o xəm qaşına, ey mahliqa!

Zülf tək incəlib hicrində bu nazik bədənim,
Var ümidim, yetirə vəslə məni badi-səba.

Səri-kuyində gədalıqda qəbul eylə məni,
Kim ki şah olsa, nigarım, ona lazımdı gəda.

Müttəsil Vahidə cövr eyləmək olmuş karın,
Bəsdi bu zülmü əziyyət, bu qədər cövrü cəfa.

* * *

Gəlməsəydi, gözəlim, sən kimi canan Qubaya,
Deyən olmazdı, inan, bağı-gülüstan Qubaya.

Bu gözəllik, bu məlahət ki tutub hər tərəfi,
Olacaq məncə, təbiət özü heyran Qubaya.

Lalələr, güllər açılmış, oxuyur bülbüllər,
Desələr, səhv deyil, cənnətü-rizvan Qubaya.

Bu səfa gülşəninin zövqünü hal əhli bilər,
Gör necə şur salır bülbüli-xoşxan Qubaya.

Mümkün olsaydı, inan ki, gözəlim, aşiqinə,
Həm sənə eylər idi, həm də fəda can Qubaya.

Sevgilim, çox da qara gözlərinə fəxr eləmə,
Gündə yüzlərcə gəlir sən kimi ceyran Qubaya.

İndi abad olur hər bir tərəfi cənnət tək,
Tutan olmaz daha bundan belə nöqsan Qubaya.

Vahidəm, sevgilim, arzum bu idi, qismət ola
Ki, olaq hər ikimiz şövqlə mehman Qubaya.

* * *

Gün cəmalin görsə, cana, məh yəqin eylər həya,
Əxz edər çünki məhü xurşid ruyindən ziya.

Sən Məsiha nitqsən, əhya edərsən mürdələr,
Kim, nədir İsa sənə həmtaliq etsin, dilbəra!

Zülfünü çək bir kənarə səfheyi-ruxsaridən,
Aşiqə məşuqəsi eylərmi bu qədri cəfa?

Bənd olubdur mürği-dil zənciri-dami zülfünə,
Bir tərəhhüm qıl mənə, gəl, ey büti-möcüznüma.

Çox sənintək nazəninlər naz edibdir aşiqə,
Gəlcəyin xətt ruyinə çəkmişlər xiclət bərməla.

Dilbəra, incitmə, bəsdir, bu dili-sədparəni,
Sən təbibi-rəhmdilsən, eylə dərdimə dəva.

Vahida, etmə təmənna bivəfa məşuqədən,
Xubrulər bivəfadır, bivəfadır, bivəfa.

* * *

Sən də, ey şair, əcəb dəmlər keçirdin əvvəla,
Mey içib meyxanənin babində çəkdin əssəla.

Çox dolular nuş edib, çox camlar sındırmısan,
Neyli-meyli bəzmlərdə qaldı səndən xoş nəva.

Şişələr yox, boçkalar azlıq edirdi keyfinə,
Bəhrü ümmanı çəkirdin başına həm basəfa.

Çeşm məxmur, ləb püratəş, sinə suzan, səs bülənd,
Küçələr dolmuşdu şövqünlə sənin, ey bivəfa.

İndi noldu tövbəkar oldun füsuni-zövqdən,
Çıxmısan imanü-dindən, kafər, oldun biriya?

Kim şərab içməz, ərəq tökməz və sındırmazsa cam,
Kəbeyi-ömr içrə yoxdur ona bir cayi-rəha.

Bəxti gör, bir misrainda min qədəh tənnan ikən,
Bu əcəbdir ki, özün oldun qədəhlərdən cüda.

Təneyi-zahid səni qılmış iraq meyxanədən,
Ol keçən əyyami-işrətə ömür vahəsrəta.

Öylə bir əlhadə düşdün ki, daha piri-muğan
Yovmi-məhşərdə sənə etməz şərarət, Vahida!

* * *

Gülsə hər kimsə bizim dideyi-giryanımıza.
Düşsün aləmdə, görüm, hali-pərişanımıza.

Eşq çox dilbəri-bimehrə əsir etdi bizi,
Biri rəhm eyləmədi naləvü əfqanımıza.

Dost sandıq görüb hər şuxu, bəlasın çəkdik,
Düşmən oldu yenə axırda bizim canımıza.

Zövq alar eşqdə bizdən, görüb əhvalımızı,
Hansı dərd əhli əgər gəlsə bizim yanımıza.

Zülf zəncirinə əql ilə əsir olmamışıq,
Eşq divanəsiyik, baxma bu nöqsanımıza.

Gəldi gül fəsli, bizi saqi nəzərdən saldı,
Piri-meyxanə gərəkdir baxa divanımıza.

Dəm qənimətdi, mey iç, Bədrini[1], Vahid, başa sal,
Bir əlac olsa, odur dərdi-firavanımıza.

* * *

Qılmış ol məhvəş üzünə zülfi-purçinin niqab,
Çöhreyi-xurşidi guya göydə basmışdır səhab.

Ey günüzlüm, arizin zülf içrə gər göstərməsən,
Mahi-nov bəs nuri hər şəb qandan eylər iktisab.

Ləmə-ləmə nur peydadır üzündə ol məhin,
Qətrə-qətrə kim tökər ləli-sədəfdən dürri-nab.

Gün üzünlə qarşı durmaz, göydə xurşidi-fələk,
Kim yetər bilmiş zəvalə oldur eylər ictinab.

Gərçi ol qönçə ləbə sordum dəhanin sirrini,
Təng qıldı könlümü, ta vermədi bir dəm cavab.

Tökmə qanım, dilbəra, var isə cürmüm əfv qıl,
Şahisən nola, peyəmbər xislət ol, eylə səvab.

İstəməz Vahid behiştü kövsərü qılmanü hur,
Yar ilə həmbəzm olub, meyxanədə içsə şərab.

* * *

Ta ki yetdi ləbi-ləlinə nigarın meyi-nab,
Rəngidən bağrını qan eylədi cam içrə şərab.

[1] Şair Bədri Seyidzadəyə işarədir

Badədən arizi-alində ərəq etdi zühur,
Damdı gül-gül güli-ruyündən onun ətri-gülab.

Tari-geysulərini qıldı pərişan üzünə,
Atdı əl şanəyə min işvə ilə çün mizrab,

Pərtovi-mehri-cəmal ilə işaqlandı cahan,
Eylə ki, açdı cəmalından o məhparə niqab.

Durdu ayinə ilə ayə müqabil ol mah,
Mahi məhv etdi həsəd, qalmadı ayinədə tab.

Şövqi-ləli o məhin qıldı məni badəpərəst,
Yoxsa hərgiz bu qədər olmaz idim xanəxərab.

Vahidəm, guşeyi-vəhdətdi məqamım daim,
Ürəyim qəmli, gözüm nəmli, əlacım nayab.

* * *

Pərtov almış mehr ruyindən göy üzrə mahitab,
Ol səbəb pürnur olub, üzdən götürmüşdür niqab.

Zülfüdürmü, arizin tutmuş sərasər, bilməzəm,
Ya göy üzrə arizi-xurşidi tutmuşdur səhab.

Dəmbədəm ahu gözündür, qarşı durmuş çeşmilə,
Bu əcəbdir, seyd səyyadindən etməz ictinab.

Hər zaman peykanların surrax eylər cismimi,
Eyləməz müjganlarından zərrə cismim iztirab.

Daima, ey qönçələb, əğyarə qıldın lütfilər,
Atəşi-eşqində eşq əhlini qıldın dil-kabab.

Təşnədir Vahid şərabi-eşqinə, müddətdi kim,
Şərbəti-vəslindən, ey gül, onu qıl bir kamiyab.

* * *

Bütün gözəlliyi tanrım o sərvinazə verib,
O hər nə etsə, təbiət ona icazə verib.

Ol ahugözlü məni qorxuram xətayə sala
Ki, fitnəsilə çox aşiqləri güdaza verib.

Əyildi səcdəyə, mehrab gördü qaşlarını,
Odur ki, əhli-riya meylini namazə verib.

Gülərdi qırx gözəl eşqilə, ağlayardı Xəzər,
Həmin o zövqü səfanı Kürə, Arazə verib.

Cəmalı Yusifə, cahü cəlali Məhmudə,
Kəmalü mərifəti, sirri var, Əyazə verib.

Gözəllik aləminin şəhriyarıdır bu pəri,
Buna bu səltənəti-hüsni indi tazə verib.

Bu fəqrimiz bizə, Vahid, böyük səadətdir,
Zəmanə, sərvət ağır yükdür, annamazə verib.

* * *

Məclisi-əğyardə gördüm ki, dün yar əyləşib,
Sanki əqrəb bürcünə ol mahi-məhvar əyləşib.

Dami-zülfiylə məni bənd eylədi ol şuxi-şəng,
Mən xəyal etdim ki, sərvə sarmaşıb mar əyləşib.

Söylədim, cana, əsirəm zülfünə, ey tazə gül,
Söylədi, səslənmə, aşiq, gülşənə xar əyləşib.

Çəkmə, məşşatə, nigarın zülfünə sən şanəni,
Hər telində şanənin, min aşiqi-zar əyləşib.

Vahida, çəkmə ayaq hərgiz dəri-meyxanədən,
Məst olanlar Vahidi görsünlər, huşyar əyləşib.

* * *

Kim der ki, ləli-nabinə kövsər deyilməyib?
Mehri-cəmalına məhi-ənvər deyilməyib?

Yüz dəfə zikr olunsa kəlamın, xoşum gəlir,
Heç bir kəlamə bunca mükərrər deyilməyib.

Əyri qılınc deyən çox olub kəc hilalına,
Müjganların xədənginə xəncər deyilməyib.

Hər kim görüb, cəmalına min afərin deyib,
Bir mahiruyə bir belə afər deyilməyib.

Hicrində çəkdiyim bu qədər ahü nalələr,
Ol şuxi-nazəninə, deyirlər, deyilməyib.

Meyxanələrdə söhbəti-ruyin çox etmişik,
Ləlin yanında badəyə əhmər deyilməyib.

Cananə kim demişisə Səyyari[1], Vahidi,
Odlara taleyi yanan Azər deyilməyib.

* * *

Dedi ol yar mənə: dəftərimiz evdə qalıb,
Eşqə dair yazılan sözlərimiz evdə qalıb.

Naz ilə, qaş-göz ilə can alırıq aşiqdən,
Ev yıxan, qan axıdan xəncərimiz evdə qalıb.

Bu gözəlliklə ki, biz naz ilə min can alırıq,
Hələ bizdən də gözəl dilbərimiz evdə qalıb.

Çeşmi-cadumuza heyran olan aşiq çoxdur,
Fitnələr yağdıran afətlərimiz evdə qalıb.

[1] Şair Həsən Səyyar

Biz əsir eyləmişik zülf ilə biçarələri,
Neçə Məcnuni-vəfapərvərimiz evdə qalıb.

Şeyx Sənan kimi aşiqləri yoldan çıxaran,
Dinü dil qarət edən kafərimiz evdə qalıb.

Hələ mən Vahidiyəm Azərbaycanımızın,
Atəşi-eşqə yanan Azərimiz evdə qalıb.

* * *

Könlüm kimi, o zülfə yenə şanə bağlanıb,
Can riştəsi o zülfi-pərişanə bağlanıb.

Ahəstə şanə çək, gözəlim, tari-zülfünə,
Hər bir telində min dili-divanə bağlanıb.

Saqi, aparma məst məni xüm ayağına,
Məstanələr yatıb, dəri-meyxanə bağlanıb.

Könlüm üzün qəmindən olub bənd zülfünə,
Pərvanə sanki şəmi-şəbistanə bağlanıb.

Meyxanələr açıldı, qədəhlərdə nəşə var,
Möhnət binası xaneyi-viranə bağlanıb.

Sənan əgər ki, bağladı zünnar, bilmədi,
Aşiq həmişə türreyi-cananə bağlanıb.

Vahid, zəmanə xubləri keçdi cənnəti,
Zahid hənuz rövzeyi-rizvanə bağlanıb.

* * *

Firqətindən, ey ləbi qönçə, bu bağrım qan olub,
Adətim bülbül kimi şamü səhər əfğan olub.

Kim, iki sərçeşmədir, cana, dü çeşmin, qıl yəqin,
Qorxum oldur, qərq olam, əzbəs axıb ümman olub.

Atəşi-ahim sədasi çulğayıb səhraləri,
Ahü naləmdən fələk müddətdi, sərgərdan olub.

Həddi olmaz ola həmta, eşqdə Sənan mənə,
Qeysü Fərhad ahü naləmdən mənim pünhan olub.

Sən məhi-övci-vəcahətsən, sənə yoxdur zəval,
Vəslinə yetsəm, çətin can verməyim asan olub.

Vahidi salma, amandır, çeşmidən, ey mahru,
Neçə müddətdir qapında kim, sənin dərban olub.

* * *

Sünbülü gül öylə kim, zülfü rüxünlə xu tutub,
Gül üzündən ətr alıb, sünbül saçından bu tutub.

Guşeyi-əbrulərində xaldırmı, bilmirəm,
Ya qılınclardır əlində bəççeyi-hindu tutub?

Ey hilaləbru, deyil xurşid hər gün sübhdəm,
Çərx əksin görməyə göydən yerə güzgu tutub.

Çeşmi-məxmurun müsəxxər qıldı canü könlümü,
Gör necə səyyadi-mahirdir, iki ahu tutub!

İntizari-qamətü ruyinlə olmuş müztərib,
Sərvü gül bağ içrə müddətdir, kənari-cu tutub.

Ay batıb, ya gün tutulmuş, əbri-zülmətdir məgər,
Yoxsa, yarın gül üzün geysuyi-ənbərbu tutub?

Naz ilə, Vahid, yenə qan tökmək istər xatiri,
Tiri-müjganın əlində ol kamanəbru tutub.

* * *

Qəmli könlüm yenə şad oldu, ruxi-yarı görüb,
Arizində o məhin türreyi-tərrarı görüb.

Zülfi-purçinini gördükdə könül qıldı fəqan,
Çəmən içrə, sanasan, mürğ o şəhmarı görüb.

Şəmi-ruxsarını dövr eylədi pərvaneyi-dil,
Yandırar özünü pərvanə necə narı görüb.

Bülbülün naləsi dünyanı tutar gülşəndə,
Hər zaman xar ilə həmdəm güli-bixarı görüb.

Daim əğyar ilə həmdəm olur ol simbədən,
Zülfi-bihədd qılır, hərdəm məni-zarı görüb.

Şövq ilə qıldı həvəs ləli-ləbi-dilbərimə,
Tutivəş mürği-dil ol ləli-şəkərbarı görüb.

Adət etmiş özünə ağlamağı Vahidi-zar,
Çünki yar ilə o gündən kim o əğyarı görüb.

* * *

Ey könül, eyləmə bülbül kimi əfqan bu gecə,
Sən gərəkdir, olasan gül kimi xəndan bu gecə!

Biz bu şadlıq gününü fəxrlə təbrik edirik,
Göstərir aşiqə öz lütfünü canan bu gecə!

Gül üçün bülbüli-şeyda niyə fəryad eləsin,
Zövqü şövqilə səfalandı gülüstan bu gecə!

Şüəra əhlnə tarixi gözəl gündür bu,
Qədrilə yetdi mükafata Süleyman[1] bu gecə!

[1] Xalq şairi Süleyman Rüstəm

Otuzillik – bu əziz şairə qiymət verilir,
Yeri var, fəxr eləsə Azərbaycan bu gecə!

Xəlqimiz hərgiz unutmaz bu şərafətli günü,
Bizə göstərdi bu xoş taleyi dövran bu gecə!

Hamının qəlbi sevinc ilə, fərəhlə doludur,
Bu böyük hörmətə heyran qalır insan bu gecə!

Yaşasın elmü maarif, yaşasın sənətü şer,
Güldü öz nuru ilə çöhreyi-ürfan bu gecə!

Nə olar, Vahid, əgər məclisimiz sakit ola,
Oxusun bu qəzəli Zülfü[1] ilə Xan[2] bu gecə.

* * *

Ey könül, var bu ziyafətdə şərafət bu gecə,
Bir gözəl növrəs üçündür bu ziyafət bu gecə.

Xəlqimiz qüssəyi-qəmdən uzaq olsun, yarəb,
Bu səfa məclisinə yetməsin afət bu gecə.

Toplaşıb bir yerə dost-aşna, hamı xatiri şad,
Gül, danış sübhə kimi eylə zərafət bu gecə.

Musiqi zövq verir ruhinə pəjmürdələrin,
Tapacaq dərdinə hər şəxs şəfaət bu gecə.

Yusifi-Misr, sanırsan ki, Züleyxayə görə
Qurdurub izzət ilə təxti-xilafət bu gecə.

Olmamış bir kəsə dünyada müyəssər belə toy,
Hamı şadlıqla olur məclisə dəvət bu gecə.

___________
[1] Müğənni Zülfü Adıgözəlov
[2] Müğənni Xan Şuşinski

Bu gözəl məclisə bir şer yazarsan, Vahid,
Sən də göstərməlisən xəlqə nəzakət bu gecə.

* * *

Bir az da, gəlin, gözləyək ol yar gəlincə,
Min naz ilə ol sevgili dildar gəlincə!

Yetməz gülünün vəslinə, səbr etməsə bülbül,
Dözmək gərək ol yari-vəfadar gəlincə!

İzn olsa, məhəbbətlə deyərdim sənə: saqi,
Sal məclisi tərtibə səbəbkar gəlincə!

Öz yarımız, öz dostumuz, öz məclisimizdir,
Məxsusi, gəlin, zövq alaq əğyar gəlincə.

Şövq ilə, məhəbbətlə keçirdik bu büsatı,
Məclisdən iraq, bəzi dilazar gəlincə!

Gəzdir qədəh, ey dost, xərab olmadan ömrün,
Sərməst olaq, ol gözləri xumar gəlincə!

Sən indi bu gülşəndəsən, ey bülbüli-şeyda.
Fövt eyləmə bu fürsəti, ta xar gəlincə!

Vahid, bizə bir şer oxu bu məclisə dair,
Bir zövqə yetək çəngü dəfü tar gəlincə!

* * *

Saqi, bu məclisin eşqilə dolandır badə,
Ömrümüz həsrəti-meylə niyə getsin badə?!

Hamının sevgisi, bir arzusu var qəlbində,
Çünki bülbül gülün eşqində gəlir fəryadə.

Nəsl ilə ad qalar aləmdə, həqiqətdir bu,
Meyvəsiz bir ağac, əlbəttə, gedər tez badə.

Başqa bir ləzzəti vardır, bir ata sağkən özü,
Atalıq həqqini ifa eləsin övladə.

Yığa öz başına hörmətli qohum-qardaşını,
Bundan artıq nə gözəl arzu olar dünyadə?!

Bir səbəb var bu ziyafətdə, səbəbsiz də deyil,
Gəlmişik biz bura şadlıqla mübarəkbadə.

İki növrəstə cavanın bu gecə şirnisidir,
Yəni Şirini nikah eyləmişik Fərhadə.

Arizu eyləyirik kim, hamının oğlu, qızı,
Sürələr ömrlərin sevgi ilə azadə.

Bəxtiyar olmağını istə həmişə xəlqin,
Qorxma, Vahid, səni ellər salacaqlar yadə.

* * *

Könül mürğü düşübdür seydvəş bir dami-səyyadə,
Salıbdır boynuma zənciri-zülfün misli-qülladə.

Səri-zülfi-nigarə dil verib, yüz min bəla çəkdim,
Yox imiş etibar heç kimsəyə bu dar dünyadə.

Mənimtək eşqdə olmazdı kimsə zarü sərgərdan,
Vəfa görsəydi gər Sənan ki, bir mucan o tərsadə.

Olur qan bu dili-zarim meyi-gülfamtək hər dəm,
Düşəndə, ey güli-qönçə, o ləli-ləblərin yadə.

Baş əyməz zahidi-kəcbin hərgiz taqi-mehrabə,
Xəmidə qaşların taqin görə bir dəfə röyadə,

Dalınca sayəvəş, cana, dolannam, bir budur qəsdim,
O yer kim sən durursan, can edim təslim o məvadə.

Nə müddətdir, könül, cana, təmənnayi-vüsal eylər,
Rizayəm can verim hicrində, ey məh, bu təmənnadə.

Mənə vəsf eyləmə, zahid, bu qədri Yusifin vəsfin
Ki, haşa Yusifi-Kənan ola bu hüsnü zibadə.

Salıbdır Vahidi ayrı vətəndən el şəmatətlə,
Odur, Məcnun kimi tutmuş məkan bir kuhü səhradə.

* * *

Bəzmi-şərabxanədə durdum ayağidə,
Verdi şərab saqi mənə bir ayaqidə.

Şəmi-şüai-hüsnünə yandırdı könlümü.
Pərvanə rəsmdir ki, yanar şəbçirağidə.

Görmüş məgər o qönçə ləbin gülşən içrə gül,
Olmuş şüküftə gülşən əra gül budağidə.

Ətri-gülab zülfünü hər kimsə iyləsə,
Getməz ölüncə ətri qalar ol dəmağidə.

Sərvim ki naz ilə qədəmin qoydu gülşənə,
Qıldı şikəst sərvi-qədi sərvi-bağidə.

Zülfü içində məskən edib könlümün quşu,
Dil riştəsini incidib ol məh dərağidə.

Hər kim yetişdi dəhrdə vəsli-nigarinə,
Vahid həmişə can verir rahi-fəraqidə.

* * *

Könlüm vurulub bir güli-reyhanə Lerikdə,
Bülbül kimi gəldim yenə əfğanə Lerikdə.

Yarım dağıdır zülfünü rüxsarinə hərdən,
Eylər məni Məcnun kimi divanə Lerikdə.

Bülbül oxuyur, gül açılır badə əlində,
Naz ilə gəlir məclisi-cananə Lerikdə.

Dağlar, təpələr aşiqi heyrətdə qoyurlar,
Cəh-cəh səsi düşmüş yenə hər yanə Lerikdə.

Gəldikdə bahar fəsli çiçəklər açılırlar,
Bülbül oxuyur aşiqi-məstanə Lerikdə.

Bülbül oxuyur, bir mən olam, bir də nigarım,
Tən etsə də, neylər mənə biganə Lerikdə?

Vahid, o gün olsün, bizə də qismət olaydı,
Ağuşa çəkəm yarımı mərdanə Lerikdə.

* * *

Olur şüküftə könül zülfi-yarə şanə dəyəndə,
Necə ki, ovçu olur şad oxu nişanə dəyəndə.

Fərəhlənir ürəyim hər zaman ki, ol gözəlin,
Xədəngi-qəmzəsi bu çeşmi-xunfişanə dəyəndə.

Zəmanə əhli olur cəm xalinin nəzarəsinə,
Bahar zamanı çıxar xəlq seyrə danə dəyəndə.

Sitarələr yanar, ol mahə zərrəcə əsər etməz,
Haçan ki, ahim odu taqi-asimanə dəyəndə.

Gələndə gərdişə əldən alır ünani-taqətimi
O şəhsəvarın əli hər zaman ünanə dəyəndə.

Dübarə can verir insanə, Vahid, ol pəri, guya
Bir özgə nəşəsi var tiri-nazi canə dəyəndə.

* * *

Dil nalə edər ol güli-xəndanı görəndə,
Bülbül gələr əfğanə gülüstanı görəndə.

Görcək o gülün ləblərini rəğbətim artır,
Tuti həvəs eylər şəkəristanı görəndə.

Zənciri sevir, gör necə divanədi könlüm!
Məcnun olur ol zülfi-pərişanı görəndə.

Şad olsa da vəslin ilə hərdəm dili-aşiq,
Əlbəttə, düşər möhnətə hicranı görəndə.

Eşq əhlinin artar, gözəlim, dərdi, məlalı,
Əğyar ilə öz sevdiyi cananı görəndə.

Qanı qaralır, tirə olur gözləri birdən,
Öz sevgilisi bir işi pünhanı görəndə.

Görcək səni aləm sevinir qaş qaralanda,
Ellər sevinirlər məhi-tabanı görəndə.

Vahid, edib ol şux səni zülfünə bəstə,
Bilir divanə əsir olmağı zindanı görəndə.

* * *

Narazıyam, ey gül, mənə imdad eləsən də,
Naşad eləyən könlümü dilşad eləsən də.

Öz səhvinə bir vaxt peşiman olacaqsan,
Olmaz yetişən dadına, min dad eləsən də.

Sındırmısan, əl vurma sınıq könlümə, zalim,
Viranə düzəlməz, necə abad eləsən də.

Vəslin həvəsi indi başımdan necə çıxsın,
Zülfündə əsirəm, əgər azad eləsən də.

Öz yarına bax, başqa gözəllər məni sevməz,
Bülbül kimi yüz naləvü fəryad eləsən də.

Sən bir mələk olsanda inanmaz sənə könlüm,
Şəxsən özünü huri, nərizad eləsən də.

Əğyarə uyub, Vahidə yadlar kimi baxma,
Yaddan o çıxarmaz, sən onu yad eləsən də.

* * *

Minlərcə gözəl olsa da hər millət içində,
Olmaz sənə bənzər, gözəlim, xilqət içində.

Hicrində nələr çəkdiyimi, vəslinə yetsəm,
Bir-bir sənə ərz eyləyərəm söhbət içində.

Ol zülfi-pərişanə o gündən ki, əsirəm,
Məcnun deyilir adıma cəmiyyət içində.

Kuyində səfa çəkməyə yol vermə rəqibə,
Yoxdur yeri xain adamın cənnət içində.

Biganə sözün açma mənə, qüssədən ölləm,
Bimarə içirtmə zəhəri şərbət içində.

Min cazibə vardır, gözəlim, məst gözündə,
İnsan sənə baxdıqca qalır heyrət içində.

Vahid, məni hərdəm ki, görüb dindirir ol şux,
Könlüm açılır, ruhum uçur ləzzət içində.

* * *

Çürütdük ömrümüzü bivəfalər eşqində,
Rəqibə qəmzə satan məhliqalər eşqində.

Sədaqət ilə vəfa aləmində can qoyduq,
Vəfadan əl götürən aşinalər eşqində.

Xəyali-vəsl ilə zənciri-zülfə bağlandıq,
Rəqibə naz eləyən dilgüşalər eşqində.

Büküldü bel, baş ağardı, qocaltdı qüssə bizi,
Bu sərv boylu, bu zülfi-qarələr eşqində.

Bizim nəvayə gələn neydən eşqimiz çoxdur,
Biz indi də gəzirik binəvalər eşqində.

Bəlayi-eşqdə hər cövrə dözmüşük, Vahid,
Bu daş ürəkli olan dilrübalər eşqində.

* * *

Mən aləmə minnət çəkirəm yar həvəsində,
Yarımsa gəzir şövqlə əğyar həvəsində.

Bilməm, bu necə sirridir, hikmətdir, əzəldən
Bülbül gülə mail, gül olar xar həvəsində?

Mey oxşamasa ləblərinə qırmızılıqda,
Bir kimsə tapılmaz meyi-gülnar həvəsində.
Hər gün üzünü görməyə həsrət çəkir aləm,
Gül fəsli olar el hamı gülzar həvəsində.

Bilməm, nə görüb zülfdə Məcnun kimi könlüm?
Sərgəştədir ol türreyi-tərrar həvəsində.

Aşiq sevir ol şuxi, təəccüblü budur ki,
Yüzlərlə gözəllər də onun var həvəsində.

Vahid! Yenə qiymət çoxalıb Yusifi-şerə,
Gövhər satılır, olsa xiridar həvəsində.

* * *

Dün oldum zövqi-meydən eylə kim üftadə bir yerdə,
Özüm bir yerdə düşdüm, məst qaldım, badə bir yerdə.

Büsati-meydə, söz yox ki, deyirlər, hal olur əmma,
Ola gər badə bir yerdə, nigari-sadə bir yerdə.

Yenə, zahid, əqəllən bir səfa var süfreyi-meydə,
Nə göstərmiş küdurətdən səva səccadə bir yerdə?

Alıbdır könlümü, heyrətdəyəm ki, gözlərin fikri,
Necə bir seyd olub qismət iki səyyadə bir yerdə.

Əsiri mən kimi minlərlə var ol sərvi-rənanın,
Nə bir dəm öldürür, nə eyləyir azadə bir yerdə.

Mənim ol dağlar ki, sinəmə ol lalərux çəkmiş
Ki, hərgiz etməmiş Şirin onu Fərhadə bir yerdə.

Məqami-şənin istərsən, ucalsın, Vahid, aləmdə,
Çalış, ta xidmət et təkmil olan ustadə bir yerdə.

* * *

Keçib daim günüm meyxanələrdə,
Yəqin bir sirr var peymanələrdə.

Nə bilsin yanmayanlar eşq odunda,
Yanır, məqsəd nədir pərvanələrdə?

Riyakarın gözəldir, söhbətindən,
O “nuş olsun” ki, var məstanələrdə.

Məni zənn etməyin Məcnundan əskik,
Mən  ondan yüksəyəm əfsanələrdə!

Kəməndi-zülfi-yarə mail olmaz,
Əgər eşq olmasa divanələrdə.

Məni, fəqr əhliyəm, təhqir qılma,
Neçün kim, gənc olur viranələrdə.

Sənin şerinlə, Vahid, nazəninlər
Dəmadəm zövq alır kaşanələrdə.

* * *

Fələk salıbdı məni yüz cəfayə qürbətdə,
Gərəkdi səbr eləmək hər bəlayə qürbətdə.

Olubdu tirə günüm həsrətindən ol mahın,
Gecə-gündüz gəlirəm ahu vayə qürbətdə.

Nedim, nə çarə qılım, olmuşam bəlayə düçar,
Şikəstə dil qalıb həsrət dəvayə qürbətdə.

Həqiqi yoxdu mənə aşina, sora halım,
Deyim bu dərdimi ol aşinayə qürbətdə.

Nə vaxtdır, mənə gəlməz o yardən namə,
Varımdı, gər eləsəm min gilayə qürbətdə.

İlahi, könlünü şad et qəribi-bivətənin,
Tüfeyli eyləmə mərdi gədayə qürbətdə.

Xudaya, Vahidi lütfünlə tez yetir Vətənə,
Ki, yarisiz dözə bilməz cəfayə qürbətdə.

* * *

Nigara, aşiqin sənsiz qalıb avarə qürbətdə,
Necə gör hicrin etmişdir günümü qarə qürbətdə.

Düşəndə yadına zülfün olur daim gözü giryan.
Gecələr sübhədək əşkin tökər rüxsarə qürbətdə.

Fələk qıldı cüda səndən məni, ey şuxi-məhparə,
Tikibdir aşiqin sənsiz gözün yollarə qürbətdə.

Vətən avarası oldum, həbibim, sevgilim, rəhm et,
Düşübdür aşiqin Məcnun kimi kuhsarə qürbətdə.

Olub sənsiz ənisim qəm, nigara, munisim nalə,
Bu dərdi-hicrə yox ölməkdən özgə çarə qürbətdə.

Tərəhhüm qıl, nigara, Vahid olmuş eşqdən xəstə,
Ləbin derlər dəva, ey məh, məni-bimarə qürbətdə.

* * *

Keçdi min naz ilə ol dilbəri-məhparə belə,
Bir də dönsə, vuracaq sinəmə yüz yarə belə.

İncimə, aşiqə cövr eyləsə, biganəyə naz,
O gülün bülbülə nazı belədir, xarə belə.

Zövqüm artar, üzü göyçəklərə düşdükcə yaxın,
Hələ pərvanə özün vurmamış odlarə belə.

Hər kimə söylədim eşqində əsir olduğumu,
Dedi: kim saldı bu dərdə səni, biçarə, belə?

Gözümün yaşını kuyində görənlər dedilər:
Sevgilin tək nə gül olmaz, nə fəvvarə belə.

Dedim, ağ üstə nə növi görünür qarə, o məh
Tökdü zülfün üzə, ağ üstə, dedi, qarə, belə.

Vahid, hər kimsədə ki eşq, məhəbbət yoxdur,
Almaram mən onu bir dirhəmü dinarə belə.

* * *

Gözəlim, el duyar axır, mənə az qaş-göz elə!
Bir də aldanmaram, ölsəm də, vəfasız gözələ.

Alacaqsan, bilirəm, canımı min naz ilə,
Çox gecikdirmə, gülüm, hər nə bilirsən, tez elə!

Çıx çəmən seyrinə, bülbüllər ölür dərdindən,
Xəstə aşiqlərinin ruhini güldür, təzələ.

Naz ilə gül, bizim ellərdə də güllər gülsün,
Solsun əğyarın açılmış gülü, dönsün xəzələ.

Bu gözəl ölkə yetirmiş bu məlahətdə səni,
Hər pəriçün bu səadət, bunu bil, düşməz ələ.

İnciyib məndən, eşitdim o gözəllər gözəli,
Aramız, bəlkə, bu günlərdə, güman var, düzələ.

Dəli ceyran kimi naz ilə o süzgün baxışın,
Vahidin şövqünü artırdı bu şirin qəzələ.

* * *

Gözəlim, tutma bərabər məni pərvanə ilə;
O əgər şəmə yanır, mən ruxi-canənə ilə.

Qorxuram, el düşüb ardınca ola heyranın,
Ehtiyat ilə dağıt zülfün üzə şanə ilə.

Bundan artıq qəmi-hicranına tabım yoxdur,
Ölərəm, bir də görəm gər səni biganə ilə.

Bu qədər göz görə zülfündə əsir olmazdım,
Mümkün olsaydı bacarmaq dili-divanə ilə.

Mən durarkən, yenə el söhbəti-Məcnunə uyur,
Nə zamandır, keçirir ömrünü əfsanə ilə.

Tövbə camın necə sındırmayım, insafım var?
Dilbərim saqi olub, mey verə peymanə ilə.

Mən əgər badəni tərk eyləməsəydim, Vahid!
Çürüyüb məhv olacaqdım rəhi-meyxanə ilə.

* * *

Gül sənə olmaz lətafətdə bərabər, Rahilə,
Sən özün bir nazənin gülsən sərasər, Rahilə.

Gör nə mahir canalandır gözlərin mərdümləri,
Gizlənib kipriklərində qanlı xəncər, Rahilə.

Çəkdi sərvindən xəcalət, bağban qəddin görüb,
Gözlərin bimarı oldu nərgisi-tər, Rahilə.

Gül üzün görmək təmənnasındadır ellər sənin.
Həsrətin çəkməkdədir rəna gözəllər, Rahilə.

Əsrimizdə nazənin, ziba gözəllər az deyil,
Gəlməmiş bənzər sənə aləmdə dilbər, Rahilə.

Yusifi sevmiş Züleyxa, haqlıdır, haqsız deyil,
Gər sənə yüzlərlə Yusif olsa çakər, Rahilə.

Tanrı məhrum etməsin bir nazlı Yusifdən səni,
Çünki olmuş Yusifi-Kənanə madər, Rahilə.

Bir səvab et, gül üzün gizlətmə əhli-eşqidən,
Qoy desinlər qüdrətə minlərlə afər, Rahilə.

Bilmirəm, bütsən, mələksən, ya müsəlmanzadəsən,
Görsə göftarın, gəlir imanə kafər, Rahilə.

Nazəninsən, məhliqasən, xubrusən – hər nəsən,
Ol, fəqət, insanpərəst, olma sitəmkər, Rahilə.

Yüz kərə eşq atəşilə yansa, xoşdur Vahidə,
Əslini hərgiz unutmaz əhli-azər, Rahilə.

* * *

Keçsəydi xoş günüm gər o zülfi-siyah ilə,
Hərgiz şikayət etməz idim suzi-ah ilə.

Ahu baxışlı gözlərinin mübtəlasiyəm,
Çox baxma, sevgilim, mənə süzgün nigah ilə.

Ruyin yanında zərrəcə gəlməz xəyala gün,
Müşkül, gəda bərabər ola padişah ilə.

Zahid sözüylə, yaxşı ki, mey tərkin etmədim,
Bəsdir səvabım eşqdə bir bu günah ilə.

Bilməz cəmalını məhü xurşidə bənzədən,
Çoxdur təfavütün, gözəlim, mehrü mah ilə.

Mehrabi istəyərmi sevən kəc hilalini,
Daşda nə zövq var, bir ola qibləgah ilə?

Zülfün düşəndə ruyinə, artar məlahətin,
Gül bağlananda qiyməti artar giyah ilə.

Nəyyirlə[1] çox mübahisə oldu bu şerdə,
Vahid, qalıb bu məsələmiz iştibah ilə.

* * *

Hər kəs cahanda dost ola bir xeyirxah ilə,
Keçməz həyatı naleyü fəryadü ah ilə.

[1] Bakıda yaşamış fars şairi Qulamhüseyn Novruz Nəyyir

Könlüm gülüzlü bir gözəlin mübtəlasıdır,
Hərgiz dəyişmərəm mən onu mehrü mah ilə.

Kuyi-nigarımın mən əzəldən gədasıyam,
Bəhs eylərəm bu rütbəmlə padişah ilə.

Dəşti Xətada seyr edən ahuyə vermərəm,
Ol nazənin baxanda mənə kəc nigah ilə.

Yarın cəfası olmasa biçarə aşiqə,
Səhrayi-eşq dolmaz idi əşki-ah ilə.

Vahid, bu nazəninlərə çox bivəfa dedik,
Tanrı bağışlamaz bizi böylə günah ilə.

* * *

Bir ləhzə gülmədi üzüm ol gülcamal ilə,
Ömrüm yetişdi axirə yüz min xəyal ilə.

Hicran qəmilə eylə ki, mən adət etmişəm,
Şad olmaram ölüncə ümidi-vüsal ilə.

Öz eşqim ilə fəxr edirəm kainata mən,
Şahlar öyünməsin mənə cahü cəlal ilə.

Yar ilə xoş dəqiqələrin başqa zövqü var,
Yar olmayanda gün keçəcək qilü qal ilə.

Bir də cahana gəlməyəcəksən dübarə sən,
Mümkünsə, qoyma keçməyə ömrün məlal ilə.

Tədric ilə qocaldacaq axır fələk səni,
Vəhşiliyi burax, dolan əhli-kamal ilə.

Vahid, mənimlə düz dolanan yar tapmadım,
Çünki fələk də kəc dolanır əhli-hal ilə.

* * *

Ey deyən, xar yaxınlaşdı vəfasız gül ilə,
Gül bu az ömrü ilə bəhs qılır bülbül ilə.

Kaş ki, bir də bizə o vəslin olaydı qismət,
Yenə həmsöhbət olaq bir neçə əhli-dil ilə.

Hansı göylərdə mələklərlə gəzirsən gecələr?
Məh camalın bizə görsənməyir ayla, il ilə.

Könlümü odlara cəzb etdi xəyali-zülfün,
Yandırar xəlq çirağın gecələr məftil ilə.

Əhli-hal ilə cəhənnəm mənə cənnət görünür,
Həmdəm olmaqdan isə tərbiyəsiz cahil ilə.

Eylə ki, Vahid, o gülçöhrə sevir əğyarı,
Zənn edir, sanki mələk göydən enib zənbil ilə.

* * *

Günəşlə bəhs edirəm mən bu gül cəmalım ilə,
Necə bərabər olur ay iki hilalım ilə?

Mən istəsəm, salaram əhli-eşqi zəncirə
Kəmənd zülflərimlə, xəyali-xalım ilə.

Bir ay səfayi-vüsalimdən istifadə edən,
Yüz il də ömr eləsə, fəxr edər vüsalım ilə.

Nəzakət əhli bilər, var nə şivələr məndə,
Əsirdir mənə aləm bu xoş xisalım ilə.

Məni təbiət əzəl gündən nazənin yaradıb
Ki, layiqəm bu qədər şənə öz kəmalım ilə.

Məni sevən gərək eşqimdə min bəla çəksin,
Keçirdə xoş gününü möhnətü məlalım ilə.

O bağiban mənə layiqdir, əhli-dərd olsun
Ki, bəsləsin məni tər qönçətək bu halım ilə.

Mənim də dərdimi, Vahid, deyərsən ol şuxə,
Nədənsə, mən bacara bilmədim o zalım ilə.

* * *

Ürəkdən eyləmişəm mən bu əhdi tarım ilə,
Günüm keçəydi həmişə o nazlı yarım ilə.

Vəfalı bülbülüyəm bir gülüzlü cananın,
İnanmışam  ona öz doğru etibarım ilə.

Şərəflə ömr keçirmək böyük səadətdir,
Fədasıyam bu yolun mən öz ixtiyarım ilə.

Həmişə xoş keçəcəkdir həyatımız, günümüz,
Bir olsa hər sözümüz nazənin nigarım ilə.

Vətən oğulları nəslilə iftixar eylər,
Olur ki, fəxr edərəm mən də yadigarım ilə.

Behişti görməmişəm, arizu da eyləmirəm,
Vətəndə keçsə günüm yari-gülüzarım ilə.

Məhəbbət əhlinə, Vahid, çalış, yaxın gəlmə
Ki, qorxuram, yana qəlbin bu ahü zarım ilə.

* * *

Keçsəydi xoş günüm əgər ol gülüzar ilə,
Əğyarə minnət etməz idim ahü zar ilə.

Mən ol səfa ki, arizi-cananda görmüşəm,
Hərgiz dəyişmərəm onu yüz min bahar ilə.

Bilməz vüsal qədrini hər aşiqəm deyən,
Ta yanmayınca dərdü qəmü intizar ilə.

Məşuqə aşiqilə tanınmışdır aləmə,
Qiymətlənir qaş ilə üzük, zər əyar ilə.

Canana öz dilimlə dedim, aşiqəm sənə,
Zövqüm səninlədir, nə işim var kənar ilə.

Divanəyəmmi mən, yenə zəncirə bağlanam?
Salmış kəməndə eşq məni zülfi-yar ilə.

Kuyi-nigarə layiqi yoxdur hər aşiqin,
Mən tapmışam bu Kəbəyə yol etibar ilə.

Eşq əhlini təbiət özü imtahan edib,
Məcnunu dərdi-hicr ilə, Mənsuru dar ilə.

Aləm bizim diyarımızın həsrətin çəkir,
Biz mehribanlıq eyləyirik hər diyar ilə.

Ahu baxışlı Azərbaycan gözəlləri
Bir bax, çəməndə seyr eləyirlər qatar ilə.

Vahid, bu şeri Təbrizə göndərmək istərəm,
Qismət olaydı, bir görüşək Şəhriyar[1] ilə.

* * *

Görsəm, ey gül, ölərəm bir də səni xarilə,
Əvvəl öldür məni, get sonra gəz əğyar ilə.

Əhd qıldın ki, vəfasızlığı tərk eyləyəsən,
Varsan, əhsən sənə öz etdiyin iqrar ilə.

---

[1] Şair Məhəmmədhüseyn Şəhriyara işarədir

Sünbüli-zülfünə çoxdan vurulub badi-səba,
Gecə-gündüz keçirir ömrünü gülzar ilə.

Tapmamışdır hələ bülbül sənə bənzər bir gül,
Bağdən-bağə gəzir dideyi-xunbar ilə.

Qamətin sərvi, gözün nərgisi gözdən saldı,
Dəhənin qönçəni lal eylədi güftar ilə.

Dil gözün fikrinə çox düşdü, xəyal eyləmədi:
Rahət olmaz qoşulan məsti-xətakar ilə.

Dövlətim,  simü zərim olmasa, Vahid, xoşdur,
Gənci-təbim doludur gövhəri-əşar ilə.

* * *

Sevimlisən, gözəlim, gəzmə bivəfalar ilə,
Məhəbbət ilə dolan yarü-aşinalər ilə.

Gözəlliyinlə qürur eyləmə, müvəqqətidir,
Zəmanəmiz doludur nazlı məhliqalər ilə.

Vətəndə xəlq baxır zülmükara nifrətlə,
Fəqirə, acizə, məzlumə mərhəbalər ilə.

Gözəllərin sitəmindən sızıldayır ürəyim,
Toxunma, pərdə dolub ney kimi nəvalər ilə.

Bu nalələr səni də yandırıb-yaxar bir gün,
Yox isə mərhəmətin gəzmə binəvalər ilə.

O şux baxışlarının fitnədir, xətadır işi,
Min ehtiyat gərək gözləri qəralər ilə.

Mənə təxəllüsü Yusif[1] verib dedi, Vahid,
Gərək də fərqlənəsən sən bu xudnümalər ilə.

[1] Şair Əbdülxalıq Yusif

* * *

Xoş ol aşiqə kim, ömr edər məhəbbət ilə,
Həyatını keçirər zövqü eşqü ləzzət ilə.

Nigarım olsa mənimlə, keçər həyatım xoş,
Mənim nə zövqüm olardı behiştü cənnət ilə?!

Maarif əsri deyir el bizim zəmanəmizə,
Maarif ilə varam, yox işim cəhalət ilə!

Birisi yerlərin altın, biri səmada gəzir,
Müsəxxər eyləyir aləmləri cəsarət ilə.

Həmişə xəlqinə qarşı sədaqət ilə dolan,
İnan ki, çox yaşamaz zövq olan xəyanət ilə.

Açıq göz ilə çalış, kainata eylə nəzər,
Həyatını başa vur sülh ilə, ədalət ilə.

Cəfayə, zülmə bütün nifrət eyləyir aləm,
Xilas elə bəşəri zülmdən cəsarət ilə.

Lətif üçün bu sözü yadigar edib Vahid!
Həmişəlik qala gültək sözüm lətafət ilə.

* * *

Könül, vəfalı olan yarə etibar eylə,
Vəfalı olmayanı cəhd qıl, kənar eylə.

İnanmadıqlarına gizli sirrin olsa, demə,
İnandığın adama, qorxma, aşikar eylə.

Məhəbbət ilə, sədaqətlə xalq içində yaşa,
Ümumə yaxşılıq et, şərrdən fərar eylə.

O kəslərin ki, sənə eşqi var, məhəbbəti var,
Yolunda sən onların canını nisar eylə.

Gözəl günündə səni istəyənlərin çox olar,
Çək imtahana, yaman gündə bərqərar eylə.

Zəmanə əyrilər ilə həmişə düşməndir,
Çalış ki, xalqın ilə doğruluq şüar eylə.

Əlində, Vahid, əgər yoxsa başqa bir əsərin,
Bu şeri yaz, vətənə, xalqa, yadigar eylə.

* * *

Məni hər kim ki, sevir, gəl ona divanə demə!
Aşina bildiyin öz dostuna biganə demə!

Aşiqin qəlbini get piri-qələndərdən sor,
Sən xərabati olan mənzilə viranə demə!

Yanmayıb mən kimi pərvanə də eşq atəşinə,
Özünü hər oda çırpan quşa pərvanə demə!

Məni sərməst eləyən gözlərinin həsrətidir,
Nəşeyi-camilə, ey gül, mənə məstanə demə!

Xeyirxah ol, gözəlim, aşiqi-biçarələrə,
Bisəbəb onların haqqında bir əfsanə demə!

Ağzının sirrini sərrafə, gülərkən söylə,
Qədrisiz hər daşa gövhər demə, dürdanə demə!

Başqa cananlara hər dərdini, Vahid, de, nə qəm,
Ancaq öz istədiyin sevgili canane demə!

* * *

Pabəstə olmasaydım o geysuyi-pürxəmə,
Divanəlikdə şöhrətim irməzdi aləmə.

Hər dəm düşəndə ruyinə ol zülfi-pürxəmin,
Bənzər xəzinə üstə duran mari-ərğəmə,

Ləlin dirildir, öldürür üşşaqı, ey sənəm,
Yox ehtiyacımız dəxi İsəbni-Məryəmə.

Bir danə üçün etməz idi tərk cənnəti,
Xalın xəyalı bais olub, derlər, Adəmə.

Zahid bilərmi sirrini qönçə dəhanının?
Vaqif olarmı nabələd əsrari-mübhəmə?

Zövqi-həyatımız rəhi meyxanələrdədir,
Verdik behişti biz sənə, zahid, cəhənnəmə!

Vahid, zəmanə içrə tapılmaz bir əhlidil,
Sanma vəfalı, bağlama bel yarü həmdanə.

* * *

Ah, kim hər gün yetər min qəm dili-naşadimə,
Bir gün ol bimehr məh yetməz mənim fəryadimə.

Gülşəni-eşqində könlüm qan olur qönçəsifət,
Hər zaman kim, ey güli-rəna, düşərsən yadimə.

Bəsdir, ey gərdun, mənə hicran qəmi, təni-rəqib,
Sən nə hacət daş atırsan xaneyi-bərbadimə?!

Yel dəyib hər sübhdəm eylər xəmidə qamətin,
Hər zaman eylər həsəd sərv ol qədi-şümşadimə.

Qətlim üçün dəmbədəm gərdun cəfa tiğin çəkib,
Həqq özü bir rəhm versin rəhmsiz cəlladimə.

Kafirəm, versəm əgər meyxanə küncün məscidə,
Eybi yoxdur, qoy desinlər küfri-aləm adimə.

Vahida, bu şeri yaz, göndər hüzuri-Müznibə,[1]
Nola gər, ustaddır o, çəksə qələm iradimə.

---

[1] Şair Ələbbas Müznib

* * *

Səbr eylə, könül, möhnəti-hicranə, tələsmə,
Dərd əhli yetər səbrlə dərmanə, tələsmə.

Kam almayacaq ayrılığa bais olanlar,
Aşiq yetəcək sevgili cananə, tələsmə.

Yusif də Züleyxanı məhəbbətlə sevirdi,
Saldırdı Züleyxa onu zindanə, tələsmə.

Dünyayə vəfa eyləmə, çox ağlama, könlüm,
Dünya nə vəfa qıldı Süleymanə, tələsmə.

Pərvanə əgər yansa da şəmin sitəmindən,
Şəmin də yaxar ömrünü pərvanə, tələsmə.

Zahid çalışır yıxmağa meyxanə binasın,
Məscid qalacaq əksinə viranə, tələsmə.

Gül zövqünü çəkmək əbədi xarə də qalmaz,
Bülbül gələr, əlbəttə, gülüstanə, tələsmə.

Gündən-günə artır bu gözəl huriliqalər,
Dünya dönəcək cənnətü rizvanə, tələsmə.

Vahid, içəcəksən, demə ki, tövbələr olsun,
Cəlb eyləyər axır səni meyxanə, tələsmə.

* * *

Qara zülfün o məhrüxsarə, ey gül, sayəban etmə!
Hilalı zülməti-şəbdə bulud içrə nihan etmə!

Ləbindən dişlədim – qan eylədim, sanki xəta qıldım,
Amandır, zalım olma, tökmə qanım, qanə qan etmə!

Güli-ruyindəki xali-siyəhdən ehtiyat eylə,
Behiştin bağına hindunu, gözlə, bağiban etmə!

Qəmindən təngə gəldim, sərv boylum, böylə naz olmaz,
Tərəhhüm eylə, kuyində gözüm yaşın rəvan etmə!

Könül, vəhm eylə canından, düşərsən seydvəş damə,
Gedib hər nakəsin zülfün özünə aşiyan etmə.

Apardı könlümü zülfün, a zalim, barı insaf et,
Heç olmazsa, alıbsan könlümü, gəl qəsdi-can etmə!

Rəqibin başqadır kuyində gəzməkdən təmənnası,
İnanma, sevgilim, hər xainə, məhrəm güman etmə!

Özün, Vahid, müqəssirsən, sənə canan nə cövr etsə,
Könül vermə gözəllər zülfünə, ahü fəğan etmə!

* * *

Salıbdır, dilbəra, zülfün üzündə sayə hər yanə,
Görünmür taği-əbrulər, düşübdür bəs ki pünhanə.

Ki, sən mahi-münəvvərsən, sənə yoxdur zaval, ey şux,
Görə ruyin əgər tərsa, gəlir din ilə imanə.

Məni Məcnun edib eşqin, salıb səhrayə sərgərdan,
Olub abad olan könlüm sənin eşqində viranə.

Mənə rəhm eylə, ey məhru, mənim nazlı nigarımsan,
Məni, Allah rizasına, bu qədər salma hicranə.

Fəraqi-həsrətin çəkməkdə, billah, zarü giryanam,
Sənin bil, rahi-eşqindir, məni salmış biyabanə.

Tənuri-eşqdə üşşaqlar könlün kəbab etmə,
Tərəhhüm qılmasan, ahım salar dünyanı tufanə.

Təmənna bəsdir, ey Vahid, bu qədri etmə dilbərdən,
Gələr insafə məhrulər, səni salmazlar əfqanə.

* * *

Mənə hərdən baxır ol sevgilim biganə-biganə,
Qızıl qanlar içirdir könlümə peymanə-peymanə.

Əli daşlı uşaqlar düşmüş arxamca, deyirlər ki,
Budur zənciri-zülfə bağlanan divanə-divanə!..

Gülüzlü yar ilə həmsağər olmaqdan budur qəsdim:
Ürək sirrin ona şərh eyləyim məstanə-məstanə.

Görüb rüsvayi-aləm olduğum tən eyləyən çoxdur,
Düzəldibdir hərə həqqimdə bir əfsanə-əfsanə.

Dil açmış şölədən guya, axıtmış şəm göz yaşı,
Yanarsan, ehtiyat ilə dolan, pərvanə-pərvanə!

Nə qalmış mülki Daranın, nə təxtü taci Cəmşidin,
Hanı Şəddad, Firondan qalan kaşanə-kaşanə?

Vəfadan dönmərəm, Vahid, əgər yüz min bəla çəksəm,
Varam canan yolunda mən yenə mərdanə-mərdanə.

* * *

Aşiqəm hüsnünə, ey gül, deyiləm biganə,
Yanıram atəşi-eşqə, necə bir pərvanə.

Demədim bir kəsə zülfündə əsir oldüğümü,
İstərəm, sirrimə yol tapmaya hər divanə.

Nə cəfa çəksə vəfa əhli, bəladan qaçmaz,
Rəhmət ol kəslərə, hər dərdə dözüb mərdanə.

Zairi-kuyin olan cənnətə rəğbət qılmaz,
Aşiqi-vəslin olan meyl eləməz rizvanə.

Qəlbimin şişəsi zövqi-meyi-eşqinlə dolub,
Unudarmı səni, şövqündə olan məstanə?

Ləblərin badə müzürr olduğun öyrətdi mənə,
Uduzub əqlimi mey, zail edir peymanə.

Vahid, aydındır, uzatmaq nə gərək məsələni,
Xalq xoşlanmaz, əgər olsa uzun əfsanə.

* * *

Zülm qılma, gözəlim, rəhm elə, gəldim canə,
Ürəyim dərdi-fəraqinlə dönübdür qanə.

Gül əgər olmasa, bülbül niyə fəryadə gəlir,
Eşqi var, odlara çırpır özünü pərvanə.

Xəstə könlüm o qara zülfünün avarəsidir,
Görsə zənciri necə sakit olur divanə?

Nə mənə badə gərəkdir, nə gülüstan seyri,
Olmuşam gözlərinin şövqü ilə məstanə.

Məhrəmi-vəslin olan gün belə nəzr eyləmişəm:
Can verəm sən kimi bir naz eləyən canane.

Leyliyə eşqdə Məcnun olub aşiq, sənə mən,
İndi dillərdə bizimçün deyilir əfsanə.

Şad olardım, o gülün vəslinə yetsəm, Vahid,
Əgər etməzsə əcəl könlüm evin qəmxanə.

* * *

O gül ki, naz qılardı məni-pərişanə,
Mən indi naz edirəm ol gülüzlü canane.

Bu eşq aləmini eşqə düşməyən bilməz,
Bilərmi, yanmasa şəmin şərəfni pərvanə?

Məni əsir eləmişdi o şux leylivəşim,
Dönüb o indi olub eşqim ilə divanə.

Vəfasız olmağını bundan ol gülün bilirəm,
Əziz olub ona məndən, nədənsə, biganə.

Nə eylə talibəm, ol dilbərin vüsalinə mən
Ki, səbr edim, dözüm, əlbəttə, dərdi-hicranə.

Nə Yusifəm, nə də ki, sevdiyim Züleyxadır,
Əsir edib məni salsın sitəmlə zindanə.

Cahanda bəsdi mənə, Vahidəm, bir öz yarım,
Behişt içində gözüm yoxdu hurü qılmanə.

* * *

Vaqif

Salıbdı fitnə iki gözlərin cəhanə yenə,
Dəyibdi bir-birinə mərdümi-zəmanə yenə.

Vahid

Güman ki, xar ilə gül kəsməmişdir ülfətini,
Çəməndə bülbüli-şeyda gəlir fəğanə yenə.

Seyid Zərgər

Xəyalı var o qara gözlərin ki, naz oxuna,
Kaman qaşınla edə sinəmi nişanə yenə.

Vahid

Nə müddət idi, sənin həsrəti-cəmalın idim,
Edibdi zülfünü dil mürği aşiyanə yenə.

Seyid Zərgər

Tərəhhüm eylə, əya, mahi-cəhrə, sal yadə,
Gəlibdir aşiqi-dilxəstə ələmanə yenə.

Vahid

Təvafi-Kəbeyi-kuyin xuda nəsib eləsin,
Ki, bir də üz qoyum ol xaki-asitanə yenə.

Fəraqın atəşinə könlümü düçar elədin,
Xəyali-vəslin ilə dil dönübdü qanə yenə.

Əgərçi kəc baxasan bir nigahi-tünd ilə,
Qəsəm o caninə, aşiq gəlir fəğanə yenə.

Vəfalı olduğumu yüz yol imtəhan etdin,
İnanmasan, gözəlim, gəl çək imtəhanə yenə.

Vüsali-dilbərə, Vahid, yetərdi bir dəm əlim,
Düzəldə bilsə idim əldə bir bəhanə yenə.

* * *

Məni hicran qəminə saldı o məhparə yenə,
Zülfü tək eylədi aydın günümü qarə yenə.

Xoş o günlər, sənə vəslində deyərdim dərdim,
İndi hicrin deyirəm hər dərü divarə yenə.

Bir vurub sinəmə müjgan oxunu getmiş idi,
Fikri var, bir də edə, könlümü sədparə yenə.

Nəqdi can əldə tutar kim ki, xiridarı ola,
Yusifi gər çəkələr səhneyi-bazarə yenə.

Kəndumi-xalini könlüm quşuna göstərdi,
Edəcəkdir məni-biçarəni avarə yenə.

Dün eşitdim səni, əğyar ilə həmsöhbətsən,
Vədeyi-vəsl veribsən, gülüm, əğyarə yenə.

Xəstə bülbül kimi, Vahid, işim əfğan oldu,
O gül həmdəm olubdur, dedilər xarə yenə.

* * *

Çox etmə qaş-göz ilə, sevgilim, işarə mənə,
Ürəkdə hər nə sözün var, de aşikarə mənə.

Xoşam qılınc qaşını göstərincə əğyarə,
Cəfa ilə vurasan yarə üstə yarə mənə.

Üzündə xalını gördükcə şad olur könlüm,
Nə ay verər bu səfanı, nə də sitarə mənə.

Kitabi-eşqini bir-bir vərəqlədim, baxdım,
Vüsalə yetməyə xoş gəldi istixarə mənə.

Təbiət eşq bəlasın mənə vəzifə verib,
Odur ki, cövr edir hər nazlı mahparə mənə.

Gözəl ki, aşiqin incitmədi, burax getsin,
Sevinnəm, etsə cəfa sevgilim dübarə mənə.

Diyari-eşqdə öz dərdü möhnətin unudar,
Bu halidə edən olsa əgər nəzarə mənə.

İşi girişmə, gəhi nazdır, gəhi qəmzə,
Nə qaldı, etməmiş olsun o zülfü qarə mənə?!

Dedim təbibə: – Məni, qoyma, yıxdı nəşeyi-mey,
Ləbi-nigarımı yazdı birinci çarə mənə.

Şərabı vəqf edərəm, Vahid, öz səvabıi üçün,
Şərabxanələri versələr icarə mənə.

* * *

Axır ağlatdın məni, biganələr gülsün mənə,
Şəm tək yaxdın məni, pərvanələr gülsün mənə.

Mən də yalvarram gözüm yaşilə piri-meykədə
Eylə məst etsin məni, məstanələr gülsün mənə.

Pərtövi-xurşidi-ruyin cami-mey içrə görüb,
Ağlaram, qoy dövrədə peymanələr gülsün mənə.

Qorxuram, sirri-dəhanın mey içib faş eyləyəm,
Məst olam kim, arifi-meyxanələr gülsün mənə.

Bağla ol zənciri-zülfinlə məni-sərgəştəni,
Qoyma kim, səhranişin divanələr gülsün mənə.

Leylivəş zülfündən ayrı istərəm, Məcnun olam,
Qoy eşitsin bu sözü, fərzanələr gülsün mənə.

Yıxa bilməzdi, fələk olsaydı, yıxdı hicri-yar,
Vahidəm, qoy sakini-viranələr gülsün mənə!

* * *

Sənsiz yerim behişt ola, qəmxanədir mənə,
Kim aşina deyil sənə, biganədir mənə.

Hər kəs ki, payibəndi-səri-zülfün olmasa,
Yüz aqiləm desə, yenə divanədir mənə.

Şövqi-rüxünlə şəm kimi yandım hər gecə,
Həmdəm sirişki-çeşmlə pərvanədir mənə.

Abi-həyatı bir belə zahid ki, vəsf edir,
Ləli-ləbin yanında bir əfsanədir mənə.

Eşq aləmində bunca bəlalər ki, çəkmişəm,
Məqsəd təvafi arizi-canadir mənə.

Zülfünlə olsa, eyləməz aşüftə könlümü,
Düşmən o zülf içində gəzən şanədir mənə.

Vahid! Cahanda baqi qalan eşq mülküdür,
Ondan qalan nə varsa da, viranədir mənə.

* * *

Ey vətən övladı, bir an vermə fürsət düşmənə!
Qəhrəman zərbənlə göstər dərsi-ibrət düşmənə.

Qoy alov yağsın tüfəngindən, topundan cəbhədə,
Eylə öz dünyasını qəhr ilə zülmət düşmənə.

Süngü tək sancıl faşistin qəlbinə, yar bağrını,
Zərbə üsdən zərbə vur xain təbiət düşmənə!

Partlasın qoy Hitlerin alçaq başında bombalar,
Hər tərəfdən ver cəsarətlə xəsarət düşmənə!

Yıx, dağıt, yansın cəhənnəmtək faşistin cəbhəsi,
Qismət olsun, qoyma bu gülzari-cənnət, düşmənə.

Bildi aləm Hitlerin xainliyin, ədnalığın,
Yağdırır milyonla dünya xalqı nifrət düşmənə.

Hazırıq, Vahid, sədaqətlə vətən uğrunda biz,
Hər zaman göstərməyə qəti cəsarət düşmənə!

* * *

Nədən yaraşmadım, ey yari-mahiparə, sənə
Ki, bəlkə, xəlvəti əğyar edib işarə sənə?

O gül cəmalını, bilməm, nə üzlə vəsf eləyim,
Günəş deyim, gözəlim, ya deyim sitarə sənə?!

Sənin gözəlliyinin mən də çoxdan aşiqiyəm,
Nə xəlvəti demək olmur, nə aşikarə sənə.

Kəməndi-eşqdən, əlbəttə ki, xilas olmaz,
Bu zülf ilə vurula hansı bəxtiqarə sənə.

Cavanlıq aləmidir, indi dil verən çox olar,
İnanma, eyləyə müşkül günündə çarə sənə.

Rəqibdən özünü gözlə, şənin əksiltmə.
Kənardən eləyər qeyrilər nəzarə sənə.

O gün dedim sənə, Vahiddən əl götür, əfsus,
Həmin sözü deyirəm indi mən dübarə sənə.

* * *

Canan, nə etmişəm, belə biganəyəm sənə?
Məcnun olan da mən evi viranəyəm sənə!

Yüzlərlə nazlı yar ola, könlüm səninlədir,
Olsan nə yerdə, mən yenə həmxanəyəm sənə.

Canan da böylə cövr edər öz mübtəlasına?
Sən zülmkarsan, demə, cananəyəm sənə.

Şövqi-ləbinlə eyləyəli badə tərkini,
Sərməst gözlərin kimi məstanəyəm sənə.

Ancaq kəməndi-eşqə giriftar olan bilir,
Zülfün qəmində mən necə divanəyəm sənə!

Göstərmə gül cəmalını, yandırma könlümü,
Qoy bilməsinlər, eşqdə pərvanəyəm sənə.

Eşq aləmində mən də sədaqətli Vahidəm,
Hər bir işimdə doğru və mərdanəyəm sənə.

* * *

Ürəyimdə o qədər sevgi varımdır Vətənə,
Necə ki, bülbüli-şeyda olur aşiq çəmənə.

İndi Fərhadı gərəkdir mən olaydım bu günün,
Çünki mən aşiqəm hər Xosrovi şirinsüxənə.

Gər Züleyxadə vəfa olsa idi aləmdə,
Cövrlər qılmaz idi Yusifi-gülpirəhənə.

Qan olur lalə kimi eşqdə aşiq qəlbi,
Hər baxan ləhzədə bir dilbəri-qönçədəhənə.

Ey könül, qan olasan, eşqə məni sən saldın!
Səndən oldu, o pəriçöhrə cəfa qıldı mənə.

Təki, ey gül, sənə, fəxr eylə ki, aşiq mən olum,
Yoxsa əskilmərəm hər dilbəri-nazikbədənə.

Nola, Vahid, azacıq sakit ola məclisimiz,
"Şur" dəsgahını bir xahiş edək tari zənə.

* * *

Aldı mey camini ol yari-güləndam əlinə,
Can fəda saqiyə! Verdi o gülün cam əlinə.

Badə zövqün nə bilir, kim ki, xiridarı deyil,
Qoymayın, ləli-giranmayə düşə xam əlinə!

Dəri-meyxanə səfasın niyə zahid bilsin?
Vermə cənnət açarın cahili-bədnam əlinə!

Badə tarixini Cəmşidi-Cəm etmiş icad
Ki, düşübdür bu qədər kafərü islam əlinə.

Rahəti-ruhini şad etmək üçün Xəyyamın,
Cam tut ki, necə almış onu Xəyyam əlinə!

Mən də bir cam ilə aram tutardım, saqi!
Gər yetişsəydi əlim yari-dilaram əlinə.

Vahid üçün bu şərəf ləzzəti-dünyayə dəyər,
Yar ilə alsa əgər badeyi-gülfam əlinə.

* * *

Əgər mən olsam, o geysuyi-müşkitər yerinə,
Öpüb, qucub, sarılardım o şuxun hər yerinə.

Şəkər nədir ki, onun həsrətin çəkəm sənsiz,
Mənə kifayət edər ləblərin şəkər yerinə.

Qızıl, gümüşsüz hanı məndə öylə tale ki,
Qucaqlayaydım o nazik belin kəmər yerinə?!

Könüldə qəmzən oxu – ölmədim, deyirlər bəs,
Sağalmaz, hər kimin ox dəysə gər sevər yerinə.

Xəyali-zülfü rüxünlə keçər gecəm-günüzüm,
Birisi şamə bərabər, biri səhər yerinə.

Fələk, həqir eləyən kəslərin muradinə yet!
Bu mərhəmət, gün olur ki, gəlib düşər yerinə.

O şuxi-məhvəşi tavusa bənzədir könlüm,
Üzündə türreyi-müşkini balü pər yerinə.

Cahanda hər kəsin öz qibləgahı, Məkkəsi var,
Mənim də qibləm üzün, xalların Həcər yerinə.

Bu sərvboyluların, Vahid, hər qəmin çəkdim,
Həmişə göz yaşı verdi mənə səmər yerinə.

* * *

İcazə ver, baxım, ey gül, o qarə gözlərinə,
Vurulmuşam, nə edim, aşikarə gözlərinə.

Qəm etmərəm, məni yüz dəfə gündə öldürəsən,
Baxanda bir də dirilləm, dübarə, gözlərinə.

Camalın açma, gülüm, qorxuram görüb üzünü,
Gün olsun hüsnünə aşiq, sitarə gözlərinə.

Olaydı qismət, öpəydim o nazik əllərini,
Ürəkdən eyləmişəm istixarə gözlərinə.

Kəməndi-ah ilə səyyadlar dalınca düşər,
Bu naz ilə əgər etsən işarə gözlərinə.

Gözüm götürməyir əğyarlar baxanda sənə,
Bir ayrı gözlə edirlər nəzarə gözlərinə.

Şikəstə Vahidə olmaz təbiblərdən əlac,
Qalıbdır indi sənin bircə çarə gözlərinə.

* * *

Mail oldu könlüm ol mahin ruxi-zibasinə,
Payibənd oldu siyəh geysuyi-müşkasasinə.

Kilki-qüdrət dişlərin tərhin yazıb Quranidə,
Bilmək istərsən əgər, bax ibtidayi-Yasinə.

Bənd olub bir Leyliveş yarın kəməndi-zülfünə,
Ruzü şəb Məcnunsifət düşdüm bəla səhrasinə.

Yar ilə həmbəzm olub, gər mey içəm meyxanədə,
Zahidin verməm o bəzmi-cənnəti-üqbasinə.

Ey ləbi qönçə, çıxar varü yox əldən, hər o kəs,
Gər düşə məntək səri-geysulərin sevdasinə.

Qəm əlindən sərvim azad etmədi bir dəm məni,
Zülm edib baxdı rəqibin hiyləvü fitvasinə.

Yarı əğyar ilə görməkdənsə, Vahid, yaxşıdır,
Qərq ola bu zövrəqi-cismim bəla dəryasinə.

* * *

Məcnuna deyən yoxdur: "Ey aşiqi-biçarə,
Leyliylə nə karın var, qoysun səni avarə"?

Eşq aləmi üşşaqə bir vadiyi-möhnətdir,
Fərhadı salıb dağə, Mənsuri çəkib darə.

Payani-qəmi-eşqi təfsirə nə hacət var,
Gör bir necə pərvanə şövq ilə yanır narə?

Dünya o qədər Leyli, Məcnun yetiribdir ki,
Saysan nə qədər göydə var sabiti-səyyarə.

Hər lalərüx eşqində öz bağrını qan etmə,
Hər dərdi çəkər bülbül, gül qismət olar xarə.

Bimehr gözəllərdən aləmdə vəfa umma,
Meylin salacaq bunlar axır yenə əğyarə.

Vahid! Biz ölüb getdik mehr ilə, məhəbbətlə,
Dünya dönəcək bir gün bir səhneyi-gülzarə.

* * *

Hər kim mənə tən eyləsə meyxanələr içrə,
Qan olsun onun badəsi peymanələr içrə.

Öz xəlqinə hər kim mey içib versə əziyyət,
Olsun yeri bayquş kimi viranələr içrə.

Mümkünsə, fəsad əhli ilə həmqədəh olma,
Nöqsan yetirər şəninə biganələr içrə.

Pərvanə əgər şəmə yanır atəşi-qəmlə,
Mən də yanıram hər gecə pərvanələr içrə.

Bir zülfü siyəh dilbərə çoxdandır, əsirəm,
Məşhuram o gündən bəri divanələr içrə.

Vahid, biləcək qədrini, sərraf əgər olsa,
Saxlar bu gözəl şerini dürdanələr içrə.

* * *

Ey namə, tez yetir özünü yar olan yerə,
Bülbüldən ərzi-hal elə, gülzar olan yerə.

Öz nazənin təbibinə de gizli dərdini,
Qoyma nigarı, yol tapa əğyar olan yerə.

Biganədən çətindir ayırmaq gözəlləri,
Mümkün deyil ki, getməyə gül xar olan yerə.

Çoxdandır, arizu edirəm bir görəm sizi,
Könlüm uçur həmişə vəfadar olan yerə.

Bir vaxt sən əsiri idin nazlı bir gülün,
Heç bir yolun düşürmü o dildar olan yerə?

Barı vəfasız olma ona, sən vəfalı ol.
Hərdən sifariş eylə o sərdar olan yerə.

Canan vəfasız olsa da, əl çəkmək olmayır,
Quş meyl edər həmişə giriftar olan yerə.

Sən yaz Kamal[1] müəllimə, biz eşq məstiyik,
Bizdən qaçırsa, getsin o huşyar olan yerə.

Bir ahu gözlü Vahidi heyran edib yenə,
Gəlmiş təbib naz ilə bimar olan yerə.

* * *

O qara zülf ki, hərdəm dolaşır şanələrə,
Göstərir eşq kəməndin dili-divanələrə.

Mehri-rüxsarını məndən kəsib ol mah tamam,
Düşdü fürsət yenə bundan belə biganələrə.

Yoxsa, ey gül, bu qədər badeyi-nab içməz idim,
Şövqi-ləlin məni cəlb eylədi meyxanələrə.

Qana dönsün görüm ol badeyi-gülgün sənsiz,
Bir də gər rəğbət edəm sağərü peymanələrə.

Həsrəti çeşmi-xumarın, ləbi-ləlin həvəsi
Göstərir guşeyi-meyxanəni məstanələrə.

Şövqi-rüxsarın ilə odlara yanmış könlüm,
Öyrədib şəmidə yanmaqlığı pərvanələrə.

Cövrün az et mənə, qorxum budu, bir ah çəkim,
Bir yanar od düşə başdan-başa kaşanələrə.

Vahidəm, şairi-azadpərəstəm, nə qəmim,
Qılmasam rəğbət əgər məscidə, bütxanələrə.

* * *

Əcəb oldu, gözəlim, uymadın əğyarlərə,
Layiq olmaz, gül əgər həmdəm ola xarlərə.

[1] Göyçay rayonunda əməkdar müəllimdir

Zülf zəncirinə bir kimsə giriftar olmaz,
Əgər etməzsə həvəs türreyi-tərrarlərə.

Bu məlahət, bu lətafətlə yaraşmaz, gözəlim,
Baxasan bir gül ikən bəzi dilazarlərə.

Əndəlibin nə qədər bağrını qan etsə də gül,
Yenə təsir edəcək naləsi gülzarlərə.

Ol səbəbdən bütün eşq əhli sevir Sənani,
Qarət etdirdi o öz dinini zinnarlərə.

Yarə can verməyən aşiq necə məqsudə yetər?
Niyə bəs eşqdə pərvanə yanır narlərə?!

Naz-qəmzəylə qara gözlülər öldürdü məni,
Kim bu təhsili veribdir bu xətakarlərə?

Dürrdür qiyməti ən yaxşı kəlamın, Vahid,
Sən də bu şerini sərf eylə xiridarlərə.

* * *

Ləbin rümuzi üçün çox baxıldı təfsirə,
Gələndə şərhinə, dil aciz oldu təqrirə.

Behişti-kuyinə yol tapsa idi vaiz əgər,
İnan ki, aşiqini başlamazdı təkfirə.

Nə Leylisən, gözəlim, qıldın aləmi Məcnun,
Saçın xəyalı çəkib kainatı zəncirə.

Tökəndə mahin üzə zülfi-pürxəmin guya,
Günəş tutuldu, cahan oldu sərbəsər tirə.

Bəlayi-eşqə düşən aşiqə əlac olmaz,
Əcəl ki, gəldi nə bir ehtiyac tədbirə!

Qaşın xəyalı çəkib aşiqini mehrabə,
Qoyanda səcdəyə baş, rast gəldi şəmşirə.

Nə Vahidə, nə də ki, Şərqiyə[1] vəfa qıldın,
Bir hörmət eyləmədin nə cavanə, nə pirə.

* * *

Bənd edib zülfünü dildar məni dilgirə,
Bildi divanəsiyəm, saldı yenə zəncirə.

Əbrtək zülf tutub mahi-cəmalın dövrün,
Ay tutulcaq, bəli, adətdir, olur şəb tirə.

Ahu gözlüm yenə bir dam qurub zülfündən,
Sanki səyyah qurub dami-bəla nəxcirə[2].

Xaldirmi o iki qaşın arasında düşüb,
Ya ki, hindubeçədirmi əl atıb şəmşirə?

Əhd qılmışdı nigarım ki, tökə qanımızı,
Biz ki həsrət çəkirik, salmış özü təxirə.

Civətək buteyi-hicrində yanıb məhv oldum,
Etmədi heç də əsər ol nəzəri-iksirə.

İstərəm, yarə yazam hicrdə hali-dilimi,
Vahida, nitq gələrmi bu çətin təhrirə?

* * *

Dilbərim yar olub əğyarə eşitdiyimə görə,
Gül gedib həmdəm olub xarə eşitdiyimə görə.

Bu qara gözlülərin eşqinə hər kim düşsə,
Zülf əlilə çəkilər darə eşitdiyimə görə.

---

[1] Şair Əlağa Şərqi
[2] Vəhşi keçi

Dözmədi cövrünə Məcnun bu pəriçöhrələrin,
Qaçdı səhralərə biçarə eşitdiyimə görə.

Həvəsi-silsileyi-eşqə düşən aşiqlər,
Bağlanır türrey-tərrarə eşitdiyimə görə.

Yıxma, ey gül, nəzərindən düşən aşiqlərini,
Tez düşər torpağa fəvvarə eşitdiyimə görə.

Gözlərin xəstəsiyəm, gəl bir öpüm ləlindən,
Mey verər səhhəti bimarə eşitdiyimə görə.

Yar əgər olmasa, Vahid meyi-nab içməyəcək,
And içib badeyi-gülnarə eşitdiyimə görə.

* * *

Yaşamaz aşiq olan dövlət ilə cahə görə,
Can fəda eyləmə, mehri yox olan mahə görə.

Sevsə Leylasını Məcnunə məzəmmət yoxdur,
Başqadır niyyəti qəlbində bu dilxahə görə.

Sevgilim, acizi-bikəslərin ahindən qorx,
Yıxılar zülm evi məzlum eləyən ahə görə.

İstə sən aləmi, qoy istəsin aləm də səni,
Qəlbi yanmaz bəşərin cahili-gümrahə görə.

Nazəninim, gözəlim, xəlqinə bədxah olma,
Yoxdur heç kimsədə rəğbət yeri bədxahə görə.

Qaşların xəlqi qılıncdan keçirir xalın üçün,
Can verir minləri bir zalim olan şahə görə.

Eşqdən Vahidi tənqid ilə islah etdin,
Əqli gəlsin başına, bəlkə, bu islahə görə.

* * *

Qaçdı səhralərə Məcnun, demə Leylayə görə!
Eşqə duşmuş o da bir başqa müəmmayə görə.

Hərə bir dərd ilə aludədir, eylər nalə,
Mən sənin hüsnünə bülbül güli-rənayə görə.

Bu təmənnadə idim vəslinə, ey gül, yetərəm,
Sındı məndən ürəyin tez bu təmənnayə görə.

Yusifin eşqi Züleyxanı şərəfdən saldı,
O da zindana düçar oldu Züleyxayə görə.

Başqa məhparələr eşqində gözumdən düşdu,
Qətrə gözdən düşər, əlbəttə ki, dəryayə görə.

Gül üçün bülbüli-şeyda keçir öz çanından,
Gül nəyindən keçəcək bülbüli-şeydayə görə?

Ömrümüz indi ki, Vahid, belə sürətlə keçir,
Mümkün olduqca bu gün gör işi fərdayə görə.

* * *

Hər kim məhəbbət əhlini salmış əziyyətə,
Yox özgə qarğışım ona, düşsün məhəbbətə!

Məndən nə bir kənarə qaçır, nə yaxın gəlir,
Kim öyrədib bu qəmzeyi-nazi ol afətə?

And içdim, ağladım, dedim: ey gül, əsirinəm!
Nə andıma inandı, nə gəldi mürüvvətə.

Aşiq gərəkdir, istədiyi yarə yalvara,
Cananı salsa da onu yüzlərcə zillətə.

Yarımla xoş keçəydi həyatım, bu əhdəyəm,
Tanrım da razıdır, gözəlim, beylə niyyətə.

Məcnun vəfasız olduğunu gördü Leylinin,
Tərk etdi öz diyarını, üz tutdu qürbətə.

Sağlıqda çox dedim sənə, incitmə Vahidi,
Biçarə həsrətinlə sənin getdi rəhmətə.

* * *

Töküb çin-çin siyəh zülfün nigarım məhcəmal üstə.
Sanırsan sayə salmış əbri-zülmətdir hilal üstə.

Göz üstə oynadır əbrulərin misri qılınclartək,
Misali-ləşkəri-hindu durub cəngü cidal üstə.

Nigahi-tünd ilə eylər cahanı məhv sərtasər,
Tutar afaqi, gərdişdən qalar əmri-məhal üstə.

Məlamət daşların çox atma, sınmış şişədir könlüm,
Nə hacət daş atırsan hicrdən sınmış səfal üstə.

Fələkdə ya bulud altında ulduzlar xəyal etdim,
Və ya yarım töküb geysulərin ol qarə xal üstə.

Gəhi könlüm çəkər canan qəmin, gəh özgədən minnət,
Nə möhnətdir, yağır bu binəvanın dalbadal üstə?

Xəyali-vəsli-dilbərlə yetirrəm ömrümü başə,
Cahanda razıyam, Vahid, ölüm böylə xəyal üstə.

* * *

Salıbdır əbrtək zülfün o məh ruxsarinə sayə,
Səbəb oldur ki, qaranlıq çökübdür səthi-dünyayə.

Gözəl, mən eyləmə hüsnün tamaşasından eşq əhlin,
Təzə ay başı, adətdir, baxarlar kim, yeni ayə.

Dəhanın sirrini, ey qönçələb, hər kimsədən sordum,
Dedi, hər nabələd olmaz bələd elmi-müəmmayə.

Göreydi gər səni Yusif bu hüsnü bu vəcahətdə,
Saleydi, kafərəm, meylin əgər bir də Züleyxayə.

Gözün cadu ilə qılmış könüllər bənd zülfündə,
Salıb divanəvar eşq əhlini, ey şux, səhrayə.

* * *

Sevgilim, əksin düşüb peymanədən-peymanəyə,
Artırıbdır zövqümü meyxanədən-meyxanəyə.

Leylinin divanəsi Məcnun olubdur, mən sənin,
Fərq qoya aqil gərək divanədən-divanəyə.

Şəm ilə pərvanə yandı, mən cəmali-yar ilə,
Bir təfavüt qoymalı pərvanədən-pərvanəyə.

Söylənir dillərdə çox aşiqlərin əfsanəsi,
Düşməmişlər mən kimi əfsanədən-əfsanəyə.

Yusifi göstərmək istərdi Züleyxa aləmə,
Çox gözəllər topladı kaşanədən-kaşanəyə.

Kəbədən bütxanəni hərgiz ayırmaz haqpərəst,
Eşqdir yol göstərən cananədən-cananəyə.

Tapmadı, Vahid, hələ heç kəs bu xəttin sahibin:
“Qaldı bu dünya evi divanədən-divanəyə”.

* * *

Yar eşitdim, edəcəkdir səfər, inşaallah,
Görüm, olsun səfəri bixətər, inşaallah.

Var ümidim, nə qədər nalə edəm bülbül tək,
Olur halımdan o gül baxəbər, inşaallah.

Nola şəb etmədi təxir o məhə ahim odu,
Edəcək sübh, yəqinən, əsər, inşaallah.

Bunca möhnət ki, mənə yar fərağında gəlir,
Yar gəlsə, hamı birdən gedər inşaallah.

Qeyrə bir söz demərəm ki, səbəbi-ahım olub,
Düşər ahımdan evinə şərər, inşaallah.

Dəri-meyxanəni sındırdı keçən şəb zahid,
Düşəcəkdir, bilirəm, dərbədər, inşaallah.

Bu qərar ilə nigarimlə mən əhd eyləmişəm,
Olmasın bir də arada kədər, inşaallah.

Çəkmişəm hicrini, ümidi-vüsal ilə xoşam,
Zəhmətim olmayacaqdır hədər, inşaallah.

Vahida, fürsət ikən hər nə işin var, gecə gör,
Səhərin fikrini qıllıq səhər, inşaallah.

* * *

Gülün fədası olan bülbülün nəvasına bax,
Üzari-yarı sevən aşiqin səfasına bax!

Ləbi-nigarım ilə gül çəməndə bəhs eləyir,
Nə şərm edib qızarır, bir onun həyasına bax!

Alaydı canımı, xoşdur, gülüzlü cananım,
Rəqib qoy deməsin, aşiqin vəfasına bax!

Əsiri-firqətiyəm bir nigari-gülbədənin,
Xəyali-vəsli ilə könlümün bəlasına bax!

Amandır, umma vəfa nazənin gözəllərdən,
Nə bir vəfalısın axtar, nə biədasına bax!

İşıq verən o gözəldir bizim həyatımıza,
Məhəbbət aləminin nuruna, ziyasına bax!

Fərəhli olsa da gər, zülfi-yarə bağlanma,
Uzun bir ömr gərək, ömrünün bəqasına bax!

Alışdım odlara pərvanələr tək aləmdə,
Dedim özüm-özümə, eşqin intəhasına bax!

Qədəhdə badə, nigarın yanında, gül əldə;
İtirmə fürsəti, öz ruhunun qəzasına bax!

Ziyalı bir gülə Vahid adıilə şer yazıb,
İnanmasan, oxu hər sətrin ibtidasına bax!

* * *

Daim cəmali-dilbərə məftun gözilə bax,
Eşq aləmində Leyliyə Məcnun gözilə bax!

Laqeyd baxma zülfünə bu dilrübalərin,
Olma əsir bunlara, şəbxun gözilə bax!

Rənci-xumaridən məni qurtardı gözlərin,
Bəzən təbibi-eşqə Fəlatun gözilə bax!

İbrətlə dinlə cəngü rübabın sədasını,
Şərən bu küfrdür, demə, qanun gözilə bax!

Dəhrin cəfasına, qəminə qılma etina,
Baxma kədərlə aləmə, məmnun gözilə bax!

Öz əsrinin mühitinə hər kim yanaşmasa,
Tez məhv olub gedər, ona mədfun gözilə bax!

Vahid həmişə eşq, məhəbbət əsiridir,
Məcnuni-əsrdir, ona vurğun gözilə bax!

* * *

O vəfasız mənə bundan sonra yar olma, dedi,
Sevmə hər bir gözəli, aşiqi-zar olma, dedi.

Bir gözəl eşqinə ver könlünü, sabitqədəm ol,
Coşma dərya kimi, xəzri, gilavar olma, dedi.

Bu qara zülfdə yüzlərlə əsirim vardır,
Ehtiyat eylə, bu zəncirə düçar olma, dedi.

Çəkmə, göz yaşı töküb gözlərimin həsrətini,
Gecə-gündüz bu xəyal ilə xumar olma, dedi.

Səni mən sevmirəm, ardımca düşüb yalvarma,
El içində düşün öz qədrini, xar olma, dedi.

Vermərəm izn, səri-kuyimə cənnət deyəsən,
Boş təmənna ilə bisəbrü qərar olma, dedi.

Əksi-rüxsarimə aləm olub heyran, şair,
Sən bu ayinəyə çox baxma, qubar olma, dedi.

Vahidəm, mən dedim, ey gül, qocalıq dövrü gəlir,
Eşq zövqündən uzaqlaşma, kənar olma, dedi.

* * *

O bivəfa mənim istəkli yarım onda idi,
Əsiri bir mən idim, ixtiyarım onda idi.

Rəqiblər yox idi, mən əsiri-eşqi idim,
Bu rütbə ilə mənim etibarım onda idi.

Gülərdi gül kimi, mən ağladıqca bülbültək,
Xəzan qəmin nə bilirdim, baharım onda idi.

Baxan zamanda məni öldürüb dirildərdi,
Mənim o eşq ilahisi tanrım onda idi.

Məni qoyub, gedib indi rəqiblərlə gəzir,
Yaxındı onda mənə, cümlə varım onda idi.

Hanı o dəm ki, nigarım mənimlə həmdəm idi?
Dəmim o dəmlər idi, ruzigarım onda idi!

Mənim də Vahid, olub eşqə düşdüyüm günlər,
O bivəfa mənim istəkli yarım onda idi.

* * *

Canandı, bir də mən, gecə on bir tamam idi,
Gizli deyib danışmağa əsli məqam idi.

Süzgün baxışla könlüm evin qarət eylədi,
Mahirdi fənni-sehrdə, zənn etmə xam idi.

Şövqi-ləbi nigar ilə bihuş, məst idim,
Bir də şəraba meyl eləsəydim, həram idi.

Eşq ilə sübhü şamımı sərxoş keçirmişəm,
Sübhüm də onda sübh idi, şamım o şam idi!

Hicran günündə naləmi bir kimsə bilmədi,
Yarın bu töhfəsi mənə bir ehtiram idi.

Hər bir suala yar cavabında müntəzir,
Heyran olurdum eylə ki, şirin kəlam idi.

Əvvəl mənimlə yar idi, sonra rəqib ilə,
Vahid, düşünmədim, bu nə həqqü səlam idi?!

* * *

Bu bəzmi-işrətə, saqi, piyalə gec gəldi,
Gözün fədası, bizi sal xəyalə, gec gəldi.

Tutubdu qəm ürəyim, ver piyalə peydərpey
Ki, nəfi-zövq verə bu məlalə, gec gəldi.

Yetir məni xüm ayağinə, tut əlim, saqi!
Xilasi-həsrət olum laməhalə, gec gəldi.

Bu ahü naləmi sanma əbəs ki, qorxum odur,
Yetər sənə mən edən ahü nalə, gec gəldi.

Qaşın xəyalına düşdükcə, ey kamanəbru!
Qəddim misal dönübdür hilalə, gec gəldi.

Günüm qaraldı mənim, badə tez gətir, saqi!
Ki, az qalıb yetə ömrüm zəvalə, gec gəldi.

Mürüvvət aləmidir, Vahidəm fərağında,
Yetir ümid əlimi bir vüsalə, gec gəldi.

* * *

Qəm çəkmə, könül, məclisə canan yenə gəldi!
Bu qalibi-biruhə verən can yenə gəldi!

Bir neçə gün olmuşdu günüm tirə qəmindən,
Şad etdi məni, ol mahi-taban yenə gəldi!

Ahəstə yığıb başına öz ləşkəri-zülfün,
Könlüm evini etməyə viran yenə gəldi!

Sal boynuma, canana dedim, həlqeyi-zülfün,
Güldü, dedi, divaneyi-dövran yenə gəldi?

Fərhadə deyin, eyləməsin dağdə fəryad,
Bu məclisə ol xosrovi-xuban yenə gəldi!

Qan ağlama, bülbül, dəxi gülzar həvəsində,
Əyyami-xəzan keçdi, gülüstan yenə gəldi!

Vahid, bilir aləm məni, ol zülfə əsirəm,
Sən çox demə, Məcnuni-biyaban yenə gəldi!

* * *

Bayram yeli əsdi, gülüzarım təzələndi,
Şadlıq gətirən xəlqə baharım təzələndi.

Hər il bu günü bayram edir xəlqimiz azad,
Tarixlərə səbt oldu vüqarım, təzələndi.

Gülşəndə açıb gül, eləyir aləmi xoşhal,
Eşq əhlinə xoş nəğməli tarım təzələndi.

Qızlar bürünüb al qumaşa işvə-naz ilə,
Könlüm sevən aşiq – deyə, yarım təzələndi.

Ellər geyinər fəxri libasın belə gündə,
Həftsin düzülən nəqşi-nigarım təzələndi.

Vahid yazacaq məmləkətə, millətə təbrik,
İl döndü, fələk döndü, diyarım təzələndi.

* * *

Öz yarimə, bilməm, niyə biganəyəm indi,
Onsuz, elə bil ki, dəli-divanəyəm indi.

Zülfündə əsir olduğum ol nazlı nigarın
Şəmi-ruxünün dövrünə pərvanəyəm indi.

Qan olsun o mey, bir də onu mən ələ alsam,
Səd şükr ola, tərki-rəhi-meyxanəyəm indi.

Gördükcə bu gülüzlülərin çeşmi-siyahın
Meysiz də həmin zövqlə məstanəyəm indi.

Nə hüsnünə, nə vəslinə möhtacam o şuxin,
Möhtac bir ol zülfi-pərişanəyəm indi.

Məcnunu mənəm indiki əsrin, hanı Məcnun?
Dillərdə mən ondan daha əfsanəyəm indi.

Divanə idim eşqdə xalqın nəzərində,
Şükr eylə, könül, aqilü fərzanəyəm indi.

Vahid, mənə kafər demə, mən eşqpərəstəm,
Nə talibi-məscid, nə də bütxanəyəm indi.

* * *

Günümü qıldı siyəh, ol məhi-taban getdi,
Bilməm, ol mah görüb məndə nə nöqsan getdi?

Sayəvəş düşdü dalınca fərəhindən ürəyim,
Hər yana naz ilə ol sərvi-xuraman getdi.

Tutivəş ayineyi-hüsnünə ol şəkkərləb
Qıldı axır məni sərgəştəvü heyran, getdi.

Ləşkəri-zülfünü cəm etmiş idi başında,
Qıldı aşüftə məni, ol şəhi-xuban getdi.

Xaneyi-qəmdə məni dideyi-giryan ilə
Qoydu Yəqubtək ol Yusifi-Kənan getdi.

Ağlaram, vəchi budur sübhü məsa bülbültək,
Saldı qəm içrə məni, ol güli-xəndan getdi.

Vahid, ol mahivəşin həsrətini çəkməkdən
Taqətü tabü təvan, səbri-dilü can getdi.

* * *

Bu nə meydir ki, içirkən məni bihuş etdi?
Xatirimdən qəmi-ənduhi fəramuş etdi!

Tapmadım çarə yanan könlümə meydən qeyri,
Məni eşqin nə qədər dərdü qəmə tuş etdi.

Gər əlim yetsə, ayağından öpərdim, saqi,
Xümi-meytək mey içərkən bədənim cuş etdi.

Cənnət əhli o adamdır ki, dönüb vaizdən
Piri-meyxanə nəsihətlərini guş etdi.

Mey əgər ləli-ləbi-dilbərə aludə deyil,
Bəs ayağinə sürahi niyə kürnuş[1] etdi?

Eşq bir şölə çəkib, yandı vücudum yeksər,
Gör ki, bir ah bu şəmi necə xamuş etdi!

Tökdü, Vahid, yenə yarım üzünə tellərini,
Cəm ikən xatiri-məhzunimi məğşuş etdi.

* * *

Olmuşam, ey tazə gül, hüsnü cəmalın aşiqi,
Bülbülasa ol ləbi-qönçə misalın aşiqi.

Məscidü mehrabə baş əyməz, yəqinimdir, əgər
Olsa zahid taqi-əbruyi-hilalın aşiqi.

Neylər ol kəs sünbülü gülzarü səbzü danəni,
Ola gər ruxsarü zülfü xəttü xalın aşiqi.

Gün düşüb hər gün ayağın altına eylər sücud,
Sayeyi-qəddinlə olmuş payimalın aşiqi.

Mahi-nov yetməz təmamə görməyincə gün üzün,
Kəsbi-nur istər, olub rüxsari-alın aşiqi.

Nola, gər hicrində olsa könlümüz dərdə düçar,
Ahü zar eylər, olub bəzmi-vüsalın aşiqi.

Vahidə eyb etməyin dərvişə olsa aşina,
Əhli-hal olsun gərəkdir əhli-halın aşiqi.

[1] Təzim etmək

* * *

Sanma, ey dil, hünəri növi-bəşərdən xali,
Ehtiyat et, deyil heç kimsə hünərdən xali.

Doğmamış madəri-əyyam hünərsiz bir zat,
Gəlməmiş dəhrə nə bir mərd təpərdən xali.

İftira eyləmə haqqında hünər sahibinin
Ki, deyil əhli-hünər məddi-nəzərdən xali.

Sahibi-əqlü hünərdir hərə öz qədrincə,
Bir nihalıq demə biz, hiç səmərdən xali.

Salik ol, gümrahə yol göstər, əgər arifsən,
Olsa hər kəs, tut əlin rahi-kədərdən xali.

Nəqd sərmayəsin, əlbəttə, verir yəğmayə,
Pasiban gər ola gəncineyi-zərdən xali.

Vadiyi-cəhlə qədəm qoyma, taparsan afət,
Filməsəl bəhr olamaz xovfü xətərdən xali.

Bu hünərdən deyil, aləmi atəş bürüyüb?
Bir gün olmaz, ola kim dərh şərərdən xali.

Bir dəm insaf ilə bax, açma hüsudanə gözün,
Elə mirati-dilin jəngi-kədərdən xali.

Vahida, tuli-kəlam eyləmə çox, saxla dilin,
Sözü az et, olasan, bəlkə, zərərdən xali.

* * *

Bəladəyəm, gözəlim, dərdi-eşqinə düşəli,
Əlacı səndədir, ey nazəninlərin gözəli!

Görəndə gül üzünü əndəlib olan könlün,
İnan, gözəlləşir hər ümidi, hər əməli.

Mənim məhəbbət ilə, eşq ilə yox idi işim,
Məni sən etdin əsirin o gül üzün görəli.

Həyatım, işrətim ancaq sənin xəyalındır,
Həyalı aşiqinəm, sirrimi kimə deməli?

Mənə yolunda sənin tənə eyləyən çoxdur,
Əgər vəfa ola, batmaz bizə rəqibin əli.

Dayan bir az da, gülüm, səbr qıl, görək nə olar,
Əlac səbrdədir, səhl sanma bu məsəli!

Unutma Vahidi, diqqətlə bax, bu şeri oxu,
Bizim bu sevgiyə bir yadigardır qəzəli.

* * *

Olsa hər kim, sevgilim, hüsnü cəmalın qaili,
Olmaz aləmdə, inan gülzari-cənnət maili.

İndi ki, rəna gözəllər can alırmış naz ilə.
Bilmirəm, tanrım neçin xəlq eyləmiş Əzrayili?!

Tutdu ol zülfi-pərişan dövri-ruyin yarımın,
San bulud olmuş fələkdə tazə ayın hayili.

Cənnəti-əlanı sevməz, hurü qılman istəməz,
Bu pərilər eşqinin hər kəs ki, olsa naili.

Məndən ikrah eyləmə, vəslin təmənna eyləsəm,
Padişahım, rəhm qıl, qovma qapından saili.

Məsti-mey gördükdə zahid tən edir aşiqlərə,
Faili-muxtar olan hər karın olmuş faili?

Kuyi-cananda yenə nəzr etdi Vahid canını,
San Mina dağına çəkmişdi Xəlil İsmayili.

* * *

Salmış olsa gər nəzərdən, zülm ilə gül bülbüli,
Yad qılmaz gülşən içrə bir zaman bülbül güli.

Gəl qiyamə, xalqa bərpayi-qiyamət zahir et,
Sərvdə yox sən kimi hərgiz qiyamət hasili.

Zahidi-bizövq etmiş nuş qəflət badəsin,
Vacib oldu eyləmək huşyar öylə qafili.

Əhli-qalə çərxi-dun daim inayətlər edir,
Eyləyir yüz min cəfa, gər görsə bir əhli-dili.

Ey könül, sevdayi-eşqə düşmə, canından saqın,
Eşq bir bəhri-girandır kim, görünməz sahili.

Vahida, Məcnunmisal aşiq görüb hər kim səni,
Boynuva zəncirvəş keçmiş o şuxun kakili.

* * *

Dağıtma gül üzə zülfün ay üzrə halə kimi,
Şərabdan bir əsər var ləbində lalə kimi.

Qızarmış arizinə tər əcəb gözəl yaraşır,
Nə yaxşı görsənir, ey gül, gül üzrə jalə kimi!

Ləbin xəyali ilə kaş məclisi-meydə
Gəzəydim əldən-ələ bir qızıl piyalə kimi.

Görəndə qamətini göz yaşım olur cari,
Çəməndə payinə sərvin axan şəlalə kimi.

Piyaləm əldə dolu söz açıldı-ləlindən,
Məni bu nəşə götürdü meyi-düsalə kimi.

Həvayi-eşq ilə guya ki, bir şikəstə neyəm,
Sızıldayır bədənim hər nəfəsdə nalə kimi.

Hədisi-zülfünü, Vahid, haçan ki, şərh elədim,
Uzandı məsələ məclisdə bir risalə kimi.

* * *

Atəşi-hicrin edibdir məni divanə kimi,
Olmuşam şəmi-cəmalın ilə pərvanə kimi.

Mürği-dil bənd olub, ey dilbəri-üşşaqi-həzin,
Görcəgin xalini ruxsarın əra danə kimi.

Tökülüb gül üzünə türreyi-tərrarələrin,
Rişteyi-dil ona bənd olmadadır şanə kimi.

Aşiqi-zarına rəhm eyləməsən, tanrı bilir,
Baş götürrəm, gedərəm səmti-biyabanə kimi.

Dilbəra, vardı rəqib ilə sənin mərhəmətin,
Sorgilən halımı bir dəfə də biganə kimi.

Dolanıb Kəbeyi-kuyində nigarın daim,
Sinəmi eyləyərəm ah ilə viranə kimi.

Eşqdən dəm vuran aşiq keçər öz canından,
Necə Vahid verib öz canını mərdanə kimi.

* * *

Zahirin düz görünsə də, amma
İçərin əyridir minarə kimi.

Günəş ol, kainatı yandırma,
Bombalardan çıxan şərarə kimi.

Cəhd qıl xəlq içində yekrəng ol,
Ləkə olma ağ üzdə qarə kimi.

Ney kimi nalə etməyin xoşdur,
Atılıb-düşmə boş nəğarə kimi.

Bulud olma üzündə dünyanın,
Nur saç ay kimi, sitarə kimi.

Heç kəsin ruhun incidib, yorma,
Bir para ləngidən idarə kimi.

Vahid, öz xəlqimin mənafeinə
İndidən ta varam məzarə kimi!

* * *

Yandım o şəmiruyünə pərvanələr kimi,
Oldum əsir zülfünə, divanələr kimi.

Könlümdə saxlaram ləbi-ləlin xəyalını,
Meyxanələrdə mey dolu peymanələr kimi.

Qaşınla həmpiyalədi, guya ki, gözlərin,
Çəkmişlər tiğ qətlimə məstanələr kimi.

Vurdun bu şişə könlümə səngi-məlaməti,
Etdin şikəst yerdə sınıq şanələr kimi.

Olma rəqibə yar, rəva görmə, aşiqin
Baxsın kənardan sənə biganələr kimi.

Yıxdın bu könlümün evini bir nigah ilə,
Etdin xarab xaneyi-viranələr kimi.

Vahid, deyirlər təzədən meypərəst olub,
Xəlqə nişan verim özüm, aya, nələr kimi?

* * *

Görmədim bir zülm edən ol dilbəri-bədxu kimi,
Kim tökər üşşaqilər qanini hər gün su kimi.

Ağlaram bülbül kimi bir gülruxin hicrində mən,
Axar ol sərvin ayağinə sirişkim cu kimi.

Dam qurmuş zülflə yarım mənə səyyadtək,
İstər ol damə əsir etsin məni ahu kimi.

Ol hilaləbrülərin fikrilə, ey dil, ruzü şəb
İncəlib zəf aldı cismim firqətində muk kimi.

Neylərəm, ayinəyə mən baxım əksim görməyə,
Yarımın ruxsarı olmuşdur mənə güzgü kimi.

Dudi-ahim göylərə çıxmış şəriri-ah ilə,
Kövkəbi-bəxtim qaralmış ol siyəh gəysu kimi.

Çəkmərəm əl, Vahida, mən damənindən yarimin,
Çün qulami-kəmtərəm ol şahimə hindu kimi.

* * *

Dün gecə açdı nigarım üzünü ay kimi,
Gördüm ol mahın əyilmiş qaşını yay kimi.

Sürəti-tiri-nigahını təsəvvür elədim
Ki, gəlir sinəmə şəst ilə tramvay kimi.

Eşq bazarının aləmdə mənəm həmmalı,
Almışam çiynimə qəm yüklərini tay kimi.

Saldı gözdən məni ol sərvi-rəvanım, getdi,
Gözümün yaşı fərağında axır çay kimi.

Gördüm həmsöhbət olub qeyr ilə şirin-şirin,
Bu həsəd qıldı əsər könlümə əzvay kimi.

Vahida, qaldın hamıdan geri, çox acizsən,
Ciddü cəhd eylə ki, lap olmuyasan zay kimi.

* * *

Bir qaragöz əldən aldı din ilə imanimi,
Bağlayıb zülfü ayağım, qaşı tökdü qanimi.

Yeddi əflaki fəğanım çuğladı hicrində, ah!
Bivəfa yarım eşitməzmi məgər əfqanimi?

Damənin tutdum, vüsalın istəyib ümmid ilə,
Kəsdi ümidim, dedi, aşiq, burax damənimi.

Əcz ilə, cana, dedim, sənsən təbibi-eşqi kim,
Bu mərizi-eşqə tapdım, şükürlər, dərmanimi.

Lütf qıl busə, nigara, Vahid olmuş müstəhəq,
De zəkat ilə qəni etdim mən öz dərbanimi.

* * *

Keçən şəb, Nuriya, könlüm pərişan oldu, bildinmi?
Mənə vəsli-nigarım döndü hicran oldu, bildinmi?

Şərabi-nab ki, canan ilə bir yerdə içmişdim,
Gözümdən gəldi, bağrım döndü al qan oldu, bildinmi?

Siz öz məşuqənizlə şadü xürrəm, eyşü işrətdə,
Mənim qəm içrə könlüm mülki-viran oldu, bildinmi?

Mənə söz verdi, öldürsün, qurtarsın dərdi-firqətdən,
Sözündən ol cəfapişə peşiman oldu, bildinmi?

Demişdim, kuyinə ol bivəfanın getməyim bir də,
Həqiqət böylə bir əhd ilə peyman oldu, bildinmi?

Vəfasız, rəhmsiz bütlər əsiri olduq axirdə,
Cahan eşq əhlinə getdikcə zindan oldu, bildinmi?

Bu insafsız gözəllərdən əziyyətlər çəkən Vahid,
Sənə qurban olum, xak ilə yeksan oldu, bildinmi?

* * *

Verdi şəmşiri-qaşın qətlim üçün fərmani,
Sanki məhbusinə sultandır, edər divani.

Hökm edib zülfünə, canan edə pabəstə məni,
Kim ki, Məcnun ola, zəncirə çəkərlər ani.

Taqi-əbrulərinə eyləyirəm səcdə müdam,
Kuyini səcdəgəhim eyləmişəm pünhani.

Əydi bu çərx mənim qamətimi qaf kimi,
Yeri var, ahim edə qərq qəmə dünyani.

Vahida, oldun, əcəb, türreyi-dilbərdə əsir,
Çünki haqq böylə yazıb aşiq üçün tuğrani.

* * *

Görən mehrabi-qaşın istəməz taqi-kəlisani,
Şikəst eyləyib hüsnün müshəfi-İncili-İsani.

Bu qədr kim tökürsən binəva aşiqlərin qanın,
Həlal olmuş məgər dinində bu aşiqlərin qani?

Göreydi hüsnünü gər piri-Kənan bu vəcahətdə,
Fəramuş eylər idi Yusifin, ey Yusifi-sani.

Qiyam etdikdə qəddin min qiyamətlər olur peyda,
Nə qamətdır bu, cana, mat edib gəbrü müsəlmani.

Məzaqi-əhli-zövqü fəhm qılmaz hiç qal əhli,
Nə bilsin zahidi-bizövq qədri-eşqi canani.

Tilanın qədrini zərgər bilər, bilməz ki, ahəngər,
Mərizi-eşq olan daim dilər dərdinə dərmani.

Şikayət eyləmə, Vahid, cahanda yardan hərgiz,
Gərək üşşaqlər məşuqinin olsun da qurbani.

* * *

Bilməm, nə çarə eyləyim, ol bivəfa məni
Etsin qəbul xaki-dərində gəda məni.

Hər sübhü şam bəstəri-eşq içrə xəstəyəm,
Eylüb məriz möhnətü dərdü bəla məni.

Vəsli-nigaridən əlimi üzdü zülm ilə,
Saldı kəməndi-firqətə axır qəza məni.

Zənciri-zülfi-yarə əsir oldu mürği-dil,
Divanələr damə edib mübtəla məni.

Vahid, şikayət etmə cəfasından ol məhin,
Etmiş zəmanə gərdişi bəxtiqəra məni.

* * *

Firqətindir, sənin, ey məh, gətirən canə məni,
Salan avarə cununtək bu biyabanə məni.

Ağlaram rahi-fəraqində sənin şamü səhər,
Sənin eşqindir edən bilgilən divanə məni.

Rəhmə gəl, rəhm elə, incitmə məni, aşiqinəm,
Öldürər, axırı bu təneyi-biganə məni.

Bənd olub mürği-dilim zülfi-siyahində sənin,
Aldı aramimi gör, saldı nə hicranə məni!

Taqi-əbrulərinin səcdəsin etdikdə əcəb
Dəstirəs eylədi möcüz ilə imanə məni.

Vahida, etmə şikayət dəxi məhvəşlərdən,
Tuş edən bəxtdir bu dərdi-fəravənə məni.

* * *

Saldı hicran oduna ol büti-məhparə məni,
Eylədi zülfütək hicridə günü qarə məni.

Dərdi-tüğyanimə bica yerə zəhmət çəkmə,
Tari şahiddi, təbib, öldürdü bu yarə məni.

Qıldı könlüm quşunu həlqeyi-zülfündə əsir,
Var xəyali, çəkə Mənsur kimi darə məni.

Səri-kuyində vətən qılmış idim dildarın,
Üzdü vəslindən əlim, eylədi avarə məni.

Məntək aləmdə qəmü dərdə giriftar olsun,
Kim ki, həsrət qoyub ol məhvəşi-dildarə məni.

Sən bu hüsnilə Züleyxayi-cahansan, ey məh,
Nola, eşqin çəkə Yusif kimi bazarə məni.

Vahida, zülfi-nigarim kimi incəldi tənim,
Bənzədir kim görə ol zülfdə bir tarə məni.

* * *

Bir qələm qaşlı nigarın qəmi lal etdi məni,
Xəm qılıb qəddimi, manəndi-hilal etdi məni.

Edirəm bəs ki xəyalın bu qara gözlülərin,
Bu xəyal axırı məbhuti-xəyal etdi məni.

Əşki-gülgunim ilə çöhreyi-zərdim boyanıb,
Qana dönmüş bu gözüm mərdümi al etdi məni.

Kimə yetdimsə, ləbin sirrini sordum ondan,
Xalq arasında əcəb əhli-sual etdi məni.

Bəsteyi-zülfü olandan bəri ol mahvəşin,
Çərxi-sərgəştəvi-bisəbri-cəmal etdi məni.

Azərə, olmadı bir kimsə, sora hali-dılım,
Çün fələk qərğeyi-girdabı-məlal etdi məni.

Evi abad ola aləmdə yenə Mümtazın,[1]
Sordu əhvalımı, fərxəndeyi-hal etdi məni.

Mənə baxşayişi yetdi o kərəm sahibinin,
Öylə kim sahibi-pür cahü cəlal etdi məni.

Dilərəm, bir sənin ehsanını aləmdə görüm,
Arizu gör necə bir fikri-məhal etdi məni.

Vahida! Gərçi həqirəm, vəli çoxdur qədrim,
Nola gər çərx dəxi əhli-sual etdi məni.

* * *

Sənsiz, ey gül, demə biganələr ağlatdı məni,
Bəzi uydurmalar, əfsanələr ağlatdı məni.

Ağladıb özgə pərişan edə bilməzdi məni,
Zülfünə məhrəm olan şanələr ağlatdı məni.

Şəm tək göz yaşım axmazdı qəmindən gecələr,
Dövri-ruyindəki pərvanələr ağlatdı məni.

---

[1] Ədəbiyyatşünas Salman Mümtaz Əsgərov

Könlümün gördüm o zülf içrə əsir olduğunu,
Sanki zəncirdə divanələr ağlatdı məni.

Min xəyal eylər idim gözlərinin şövqi ilə,
Yad edərkən səni məstanələr ağlatdı məni.

Sənsiz, ey gül, nə mey içdimsə, gözümdən gəldi,
Döndü qan rənginə, peymanələr ağlatdı məni.

Vahid, aləmdə təki eşq evi abad olsun,
Hər zaman məscidi-viranələr ağlatdı məni.

* * *

Bilməm, nə etmişəm, yenə yar istəmir məni,
Uymuş rəqibə nazlı nigar, istəmir məni.

Yandırdı daği-həsrəti ilə xəstə könlümü,
Ol sərvboylu, laləüzar istəmir məni.

Yarımdan özgə nazlı gözəllərdə yox gözüm,
Gül istəsin, cəhənnəmə, xar istəmir məni.

Bilməm, nə sirdir, o qara gözlü dilbərim
Hər dəm olanda məstü xumar istəmir məni?!

Əğyarə naz edir, məni dindirməyir o gül,
Guya xəzan yetişdi, bahar istəmir məni.

Vahid, əgər ki, var bizə də naz edən gözəl,
Mən sevdiyim o çeşmi-xumar istəmir məni.

* * *

Sən nəzərdən salmasaydın, ey hilaləbru, məni,
Dami-eşqə bunca salmazdı yetən məhru məni.

Göz yaşım axdıqca, artar suzi-eşqim sinədə,
Yoxdur ümmidim, xilas etsin bu oddan su məni.

İncəlib zülfün xəyalilə vücudum, öylə kim,
Tari-zülfündən hesab eylər görən bir mu məni.

Bilmədim, qıldım nəzər ol zülfi-ənbərfaminə,
Sehrlə saldı kəməndə nərgisi-cadu məni.

Məclisi-meydə nigarım açdı müşkin zülfünü,
Bilmədim mey nəşəsi məst etdi, ya kim, cu məni?

Mən əsiri-zülfünəm, ancaq cəmalın sevmişəm,
Fikr qılma, istəyir vəslimdən ötrü bu məni.

Görməyincə gül üzün, Vahid, o şəhla gözlünün,
Sakit etməz nə çəmən seyri, nə bir ahu məni.

* * *

Qismət et, yarəb, mənə daim meyü meyxanəni,
Xali etmə məclisimdən saqərü peymanəni.

Kövsəri-cənnət sifatin vəsf edirsən aşiqə,
Verməröm mən kövsərə, zahid, meyü meyxanəni.

Əlaman, məşşatə, aşüftə edərsən aləmi,
Könlümü qılma pərişan, vurma zülfə şanəni!

Hər səri-muyində bənd olmuş neçə iftadələr,
Qoyma dəysin bir-birinə bu neçə divanəni.

Nöqteyi-xalın görüb ol səfheyi-ruyində kim,
Zikri-zahidtək edər ol sübheyi-səddanəni.

Atəşi-ruxsarini gördü könül pərvanəsi,
Gəl dolanım başına, yandırma bu pərvanəni.

Zahid istər məscidi, mən arizi-dildarimi,
Bülbül istər gülşəni, bayquş sevər viranəni.

Nəql edər vaiz behiştü duzəxi kim xəlq üçün,
Vahida, alma qulağə yüz belə əfsanəni.

* * *

Oldum cünun görcəyin o zülfü qarəni,
Saydım səbahədək göy üzündə sitarəni.

Bir yarə vurdu sinəmə tiği-qaşilə kim,
Müşkül sağalda, gəlsə Ərəstun, bu yarəni.

Ey dərdi-eşqə çarə ilə hökm edən təbib,
Tədbirin olsa, bu mərəzə eylə çarəni.

Tökdü o yar səfheyi-ruxsarə zülfünü,
Etdi qürub, görmədim ol mahiparəni.

Əhsən səriri-hüsnüdə o qarə xalına,
Bir tək dolandırır bu qədər gənc idarəni.

Bir zərrə kessə mehrini məndən o mah əgər,
Ahım oduyla çərxə yetirrəm şərarəni.

Vahid, əgərçi yar kəsə səndən ülfətin,
Sən cəhd qıl ki, dilbərilən vurma arəni.

* * *

Etdi fələk zülm ilə məndən cüda səni,
Qıldı rəqib bəd sifətə aşina səni.

Çəkdim cəfayi-cövrünü, ey məh, zəmanədə,
Sandım xəyali-xam ilə əhli-vəfa səni.

Hər sübhü şam sayili-kuyində aşiqin,
Hatəm kimi çü bilmişəm əhli-səxa səni.

Üzdün vüsaldən əlimi tərki-lütf edib,
Ey məh, bu növ bilməz idim bivəfa səni.

Oldum məriz eşq ilə, halimi sormadın,
Qılsın düçar mən kimi dərdə xuda səni.

Sordum əlacım, ey büti-ziba, təbibdən,
Yazdı bu dərdi-eşqə müalic dəva səni.

Bu Vahidi-fəqirə, gözəl, eylə iltifat,
Ruhim, həyatda bircə bilibdir şəfa səni.

* * *

Sordumsa hər kəsdən, dedilər, bivəfa səni,
Neylim, həqiqi bilmiş idim aşina səni.

Yusif də olsan hüsndə, sən məndən incimə,
Hər yerdə söylərəm, gözəlim, mən gəda səni!

Məcnun zamanı Leyli görəydi camalını,
Eşqindən eylər idi, inan, tez fəna səni.

Təqsirim olmadan məni saldın bəlalara,
Mən ruhuma sanırdım, əzizim, qida səni.

Bir kəlmə söz kifayət edər anlayan kəsə,
Naəhlə tanrı eyləməsin mübtəla səni.

Fikrə, xəyalə, möhnətə sən salmısan məni,
Canan, əhatə eyləməsin bir bəla səni.

Tanrım özü cəza verəcək zülm edənlərə,
Könlüm əgər ki, bir qəmə görməz rəva səni.

Yoxdur günah səndə, səni öyrədəndədir,
Biganə göstərir hamıya kəcnüma səni.

Hal əhli olsa, Vahid, əgər sevdiyin gözəl,
Heç yerdə bivəfa deməz ol məhliqa səni.

* * *

Əcəb gözəl yetirib gərdişi-zəmanə səni,
Zəmanəmizdə sanır xəlqimiz yeganə səni.

Məhəbbətinlə könüllər dolub, unutmayacaq,
Nə bir rəfiqi-həqiqi, nə əhli-xanə səni.

Vətəndə namü-nişan ilə ölmək izzətdir,
Diyari-qürbətə kim saldı binişanə səni?

Cavanlaşardım, əlim çatsa, mehrsiz fələyə,
Səbəb nədir ki, salıb dərdi-biamanə səni?

Qərəzlə ev yıxanın xanimani odlansın!
Ki, qoydular gözü həsrətlə xanimanə səni.

Sən olmasan da, xəyalın bizimlə həmdəmdir,
Əgər ki, möhnəti-qürbət yetirdi canə səni.

Bəlayi-hicrə gərək səbr qılsın aşiqlər,
Bu işdə bəlkə çəkib bəxtin imtahanə səni.

Bahari-ömrünü, Vahid, fələk xəzan elədi!
Yetirdi bülbüli-şeyda bu cür fəğanə səni.

* * *

Vəfalısan, gözəlim, çəkdim imtahanə səni,
Vəfadə tək yetirib gərdişi-zəmanə səni.

Bu etibar ola bilməz bir özgə dilbərdə,
Mən indi bilmişəm öz könlümə yeganə səni.

Rəqiblər gözünə kirpiyin batır oxtək,
Vəfadə göstərirəm hər zaman nişanə səni.

Qəribə cazibə vardır gözəlliyində sənin,
Bərabər eyləmək olmaz bir özgə canə səni.

Sənə bəşər desələr – zülm ediblər haqqında,
Təbiət aşiq olub, göndərib cahanə səni.

Sədaqətində dayandın, rəqibə sirr demədin,
Elin şəmadəti gərçi gətirdi canə səni.

Deyən demişdi mənə: sevgilin vəfasızdır,
Salar o gül yenə, bir gün gələr ki, qanə səni.

Sənin sədaqətini Vahidə özüm demişəm,
O da sevir, gözəlim, indi qaibanə səni.

* * *

Yaradıb tanrı, əzizim, nə gözəl yar səni!
Gözlə, bu hüsn ilə aldatmasın əğyar səni!

Dişlərin inci, ləbin ləl, üzün gül kimi tər,
Xəlq edib, məncə, təbiət düri-şəhvar səni.

Eşq bimarı sağalmaz, bunu dərd əhli bilər,
Sağalar görsə bu tərkib ilə bimar səni.

Yandırıb Kəbəvü bütxanəni, zünnarı atar,
Görsə Sənan kimi min aşiqi-dindar səni.

Sən ki, hal əhli idin, aşiqi incitməzdin,
İndi can almağa kim eylədi vadar səni?

Aşiqin könlünə rəhm et, bu qədər incitmə,
Görməmişdim, gözəlim, bunca sitəmkar səni.

Məst idin sən bu qara gözlülərin eşqilə,
İndi, Vahid, sevinir, kim görür huşyar səni.

* * *

Qəm çəkmə, ey könül, yenə canan sevir səni,
Dərdindən öldüyün güli-xəndan sevir səni.

Zalım fələk qoyarmı səni vəslə yetməyə,
Çox da o canalan, o gözəl can sevir səni.

Hər bir sözü müvəqqətidir nazəninlərin,
Aldanma, gərçi ol məhi-taban sevir səni!

Batdı rəqib ömr uzunu qarə günlərə,
Ol sərv boylu, zülfi-pərişan sevir səni.

Ceyran dalınca düşsə bir ovçu, əcəb deyil,
Yüzlərcə ovçu, yüz quzu ceyran sevir səni.

Xəlq eyləyəndə səhv deyil, tanrı gər desəm,
Olmuş camalına özü heyran, sevir səni.

Vahid, cəhənnəm, istəməsin qoy rəqiblər,
Sən fəxr qıl ki, Azərbaycan sevir səni.

* * *

Yarım tökəndə gül üzə zülfi-siyahini,
Sandım ki, gizlədib fələk əbr içrə mahini.

Gər görsə bağban o məhin zülfü ruyini,
Ta ömrü var, xəzanə verər gül giyahini.

Gəlsin, cəmali-dilbərimə eyləsin nəzər,
Kim görməyibsə sənəti-feyzi-ilahini.

Səyyadlar dalınca düşüb, həsrətin çəkər,
Görsə nigarımın əgər ahu nigahini.

Bihudə sanma, naleyi-üşşaqdan saqın,
Ey məh, yetirmə göylərə üşşaqin ahini.

Hər gün düşüb ayaqlarına gün bu şövqlə,
Bəlkə olur ki, bir gün öpə xaki-rahini.

Vahid qapında olsa müqəssir, ümidi var,
Bir lütf ilə özün keçəcəksən günahini.

* * *

Çəkmək istər mən kimi hər kimsə canan fikrini,
Öz canından əl götürsün, etməsin can fikrini!

Ağlaram sübhü məsa bir dilbərin eşqində mən,
Bülbül ağlar necə çəkdikdə gülüstan fikrini.

Yusifin hicrində Yəqub eylədi min fikr əgər,
Çəkməyibdir bunca ol mən kimi hicran fikrini.

Olsam ol şux ilə gər bir guşeyi-meyxanədə,
Bir də namərdəm, çəkərsəm baği-rizvan fikrini!

Ey günüzlüm, gər tuta zülmət sərasər aləmi,
Eyləməz ruyin görənlər mahi-taban fikrini.

Vursan, ey məh, sinəmə tiri-xədəngin, razıyam,
Sinədə peykanın olsa, çəkmərəm can fikrini!

Bigünah qanlar tökərsən rəhmsiz cəlladtək,
Bil, tutar axır səni, ey çəkməyən qan fikrini!

Oldu, Vahid, xatirimdə cəm ikən aşüftəlik,
Müttəsil çəkməkdən ol zülfi-pərişan fikrini.

* * *

Gəldi qəmdən gözəlim qurtara divanəsini,
Gördü öz şəminə yandırdığı pərvanəsini.

Mənim əfsaneyi-eşqim bürüyüb məmləkəti,
Leyli-Məcnunun unutmaq gərək əfsanəsini.

Ey yıxan könlüm evin, indi gəl abad eylə,
Daimi eyləmə viranə bu qəm xanəsini.

Bülbül istər gülü, zövq əhli sevər cananı,
Hər bir aşiq sevir öz sevgili cananəsini.

Eşq peymanəsidir aşiqi sərməst qılan,
Alma dəhrin ələ qəm-qüssəli peymanəsini.

Əhli-fəqrik, bizə bu künci-qənaət xoşdur,
Neylirik şahların altun dolu kaşanəsini.

Xalqa göz yaşı ilə ədami-riyadır, qurmuş,
Vaizin sanma əbəs sübheyi-səddanəsini.

Məncə, Vahid, yenə meyxanələr abad olsun,
Tərk qıl zahidə öz məscidi-viranəsini.

* * *

Ləbindən aşiqə olsaydı istifadə yeri,
Qədəhdə qanə dönüb qalmaz idi badə yeri.

Diyari-eşqə, könül, laübali qoyma qədəm,
Bü barigahə gedərkən bir etiqadə yeri.

İradəsizlərə yer yoxdur eşq mülkündə!
Xoşa o aşiqə var onda bir iradə yeri.

Şərab məclisinə qoymayın gələndə rəqib,
Deyil bu guşeyi-cənnət həramzadə yeri.

Sənin gözəlliyinin acizəm ifadəsinə,
Mələkdən özgə sənə tapmadım ifadə yeri.

Təkəbbür əhlini eşq içrə istəməz canan,
Təriqi-eşqə, könül, daima fitadə yeri.

Diyari-eşqdə, Vahid, hamı bərabərdir,
Bilinməz orda gəda ilə şahzadə yeri.

* * *

Sanma cahanda əhli-vəfa məhliqaləri,
Bietibar olurmuş hamı, yox vəfaləri!

Aldanmayın zəmanədə hərgiz gözəllərə,
Daim edərlər aşiqə cövrü cəfaləri.

Yoxdur cahanda bir nəfər əhli-vəfa, könül,
Bəs ki tutubdu aləmi boş iddiaları.

Eşqə əbəsdi qılma həvəs, ey əsiri-eşq,
Çünki çəkibdi eşqdə başım bəlaləri.

Kəsmə, amandır, lütfünü aşiqdən, ey sənəm,
Şahlar həmişə rəsmdir, saxlar gədaləri.

Hər mahiru gözəldə məgər beylə zülm olur?
Tərk et cəfanı, tut rəvişi-binəvaləri.

Vahid, cəfayi-eşqdən ikrah qılmadın,
Etdin qəbul ruzi-əzəldən bəlaləri.

* * *

Ey dil, unutma zülm eləyən məhliqaləri,
Onlardır eşq əsiri edən binəvaləri.

Zənciri-zülfə etmə həvəs, ey əsiri-eşq!
Çox görmüşük bu damə düşən mübtəlaləri.

Hüsn əhlinin bu adətidir, bivəfa olur,
Çox da məzəmmət eyləməyin dilrübaləri.

Hər şuxa vermə könlünü, bağlanma zülfünə,
Çünki çəkib bu yolda başım çox bəlaləri.

Divanə etməyincə götürməz yaxandan əl,
Çox çəkdim imtahanə bu zülfü qəraləri.

Aldanma rəhmsiz, bu vəfasız gözəllərə,
Daim edərlər aşiqə cövrü cəfaləri.

Vahid, cahanda təneyi-biganə yaxşıdır,
Püriddia görüncə bu dost-aşinaləri.

* * *

Bir arzudə yoxam vəsli-yardən qeyri,
Nə zövq bülbül üçün laləzardən qeyri.

Vətəndə möhnətə bir çarə tapmadı Məcnun,
Diyari-qürbətə yalnız fərardən qeyri.

Nə cami-Cəm qalıb indi, nə şövkəti-Cəmşid,
Fəsanələrlə quru iftixardən qeyri.

Behişti-əqdəsə dönsə çəmən, nə bəhcəti var,
Bizə nə zövq olur gülüzardən qeyri.

Təbii ziynətə layiq deyildir hər gülrux,
Bu izzətə yetən olmaz nigardən qeyri.

Nə bir rəşadəti var Bisütunda Fərhadın,
Bir əksi-Şirin ilə cuyi-bardən qeyri.

Həmidin[1] eşqini Zöhtabdan[2] soranda dedi:
O binəvadə nə var etibardən qeyri.

Bəradərim Məcidə[3] sən bu şeri yaz, Vahid,
Səmimi dost yoxumdur Qafardan[4] qeyri.

* * *

Gözəlim, varmı bir aşiq sənə məndən qeyri?
Öləröm, baxsam əgər bir gülə səndən qeyri!

Könlümü qan eləyən varmı bu aləmdə məgər,
Bir sənintək üzü gül, qönçədəhəndən qeyri?

Özgə bir dilbər ilə könlüm açılmaz sənsiz,
Nə gərək bülbüli-şeydayə çəməndən qeyri?

Özgələr ləzzəti-vəslinlə səfalər çəkdi,
Mənə hicrin nə verib dərdi-mühəndən qeyri!

Dərdi-hicranını da könlümə tapşırdı fələk,
Əlimi daməni-vəslindən üzəndən qeyri.

Ləblərin nəşəsini piri-muğandan xəbər al,
Badə zövqün nə bilir rindi-kühəndən qeyri?

Vahid, aləmdə bir insanlığa xidmət qalacaq,
Varmı bir şey aparan qəbrə kəfəndən qeyri?!

1 Alim Həmid Məmmədzadə
2 Alim Məhəmmədtəqi Zöhtab
3 Məcid Abbasi
4 Alim Qafar Kəndli

* * *

Sevgilim, bülbülə olsaydı gülün imdadı,
Bülbülün aləmi ağlatmaz idi fəryadı.

Eşq sevdasına layiqli deyil hər aşiq,
Dərdü qəm çəkməyə gər olmasa istedadı.

Qopsa yüzlərcə bəla, qəlbinə təsir etməz,
Hər kimin eşqilə möhkəm qurulub bünyadı.

Gör necə hüsndə məğrur idi Şirin özünə,
Dağ-daşı çapmağa məcbur elədi Fərhadı.

Hanı rəhmətlik o Məcnun, gedib dünyadan?
Bizik indi o bəlalər çəkənin övladı.

Hüsni-Leylanı da Məcnun özü öyrətdi bizə,
Əhli-eşqin odur aləmdə böyük ustadı.

Məni, Vahid bu qədər sevgilim incitməz idi,
Yerə girsin, görüm, ey kaş, rəqibin adı.

* * *

Gəldim vüsali-yarə yetəm fürsət olmadı,
Bir dəm doyunca söhbət edəm, qismət olmadı.

Cövrün çəkib həmişə bu zülfü qarələrin,
Divanə könlümə yenə bir ibrət olmadı.

Cənnətdi məclisim, elə ki, gəldi dün rəqib,
Məclis cəhənnəm oldu, mənə cənnət olmadı.

Az olsa badənin çox olur ruhə ləzzəti,
Həddindən artıq içdin, o bir ləzzət olmadı.

Sərvim, deyəndə sanma, qiyamətdi qamətin,
Məhşər ki qopmadı, sənə bir töhmət olmadı.

Fərhadı fəzli-sənəti sevdirdi Şirinə,
Şirini eşqə bənd eləyən surət olmadı.

Eşqində ölmək həsrəti öldürdü Vahidi,
Çox yaxşı oldu – istəyinə həsrət olmadı.

* * *

Bu sərvi-qamətim qaşın xəyalıilə dütalandı,
Gözüm ayineyi-safi-cəmalından cilalandı.

Fəğanü ahü naləmdən xəbərdar olmadın, ey məh,
Göy üzrə dudi-ahimdən kəvakiblər qaralandı.

Dəyəndə sinəmə üst-üstə, ey gül, navəki-qəmzən,
Dəlinmiş ney kimi könlüm yeri-yerdən nəvalandı.

Deyirlər Qeys üçün, cana, cünuni-eşq olub, amma
Mənim ondan betər görcək səni, başım havalandı.

Üzündən dün götürdükdə düşəqqə zülfi-mişkinin,
Üzün nurilə, ey mahim, cahan yeksər ziyalandı.

Çəməndə sərv qəddin göstərib yüz min qiyamətlər,
Qədin sərvin çəmən görcək xəcalətdən həyalandı.

Salıbdır Vahidi-zari bəlayi-hüznə hicranın,
Həmişə qeyrilər vəslinlə, ey gülrux, səfalandı.

* * *

Demədim dərdimi canana, yadımdan çıxdı,
Gördüm öz yarımı, biganə yadımdan çıxdı.

Bülbülə gül nə cəfa eylədiyin bildirdim,
Yandı canım, niyə pərvanə yadımdan çıxdı?

Deyəcəkdim o qara zülfə nə dərdim var idi,
Oldu könlüm dəli-divanə, yadımdan çıxdı.

Vəslinə mail olan günləri bir-bir saydım,
Yandığım atəşi-hicranə, yadımdan çıxdı.

Zülf əlindən nə bəla çəkdiyimi bildirdim,
Nə qədər fikr elədim, şanə yadımdan çıxdı.

Mey içərkən məni bir lütflə dindirdi o gül,
Məst olanlar kimi peymanə yadımdan çıxdı.

Bəlkə, Vahid, deyim ol şuxə, inansın sözümə,
And içim sevgiyə, vicdanə yadımdan çıxdı.

* * *

Yarəb, itirmişəm, neçə gündür nigarımı,
Tezliklə sən yetir mənim ol nazlı yarımı.

Yoxdur gülüm, nə üzlə gedim seyri-gülşənə,
Bəxtim bu il xəzan eləyib novbaharımı.

Ol laləüzlüdən mənə hər kim xəbər verə,
Billah, sevindirər bu dili-dağdarımı.

Namərd rəqibin hiyləsinə uydu dilbərim,
Yandırdı nari-həsrət ilə qəlbi-zarımı.

Başım bəlalıdır, ölürəm, kimsə bilməyir,
Bir qarəgözlü əldən alıb ixtiyarımı.

Mən bir vəfalı aşiqəm, ölsəm də eşqdə,
Örtər çiçəklə, güllə gözəllər məzarımı.

Yarım mənə ölüncə vəfasızlıq eyləməz,
Çox çəkmiş imtahana mənim etibarımı.

Bir də qədəh alıb əlimə badə içmərəm,
Ta görməyincə gözlərim ol gülüzarımı.

Vahid, bu şeri yaz Həsənə, ömrdən gedir,
Bir vaxt olur ki, xəlq oxuyar yadigarımı.

* * *

Bir də görəsən, naili-canan olarammı?
Eşqində onun bülbüli-xoşxan olarammı?

Minayi-səri-kuyini min dəfə dolansam,
Bir yol, görəsən, layiqi-qurban olarammı?

Yüz cövr edəsən, bir deмərəm, cövrünü az et,
Min böylə cəfa olsa, peşiman olarammı?

Sinəm bu qədər yarələnib qəmzən oxundan,
Axır, görəsən, qabili-dərman olarammı?

Dindir məni bir naz ilə, ey qönçeyi-ümmid,
Bir gün açılıb gül kimi xəndan olarammı?

Çoxlar yetişib kamə, olub xadimi-kuyin,
Mən də o hərəmxanəyə mehman olarammı?

Vahid, o qəra zülfə ki, həsrət çəkirəm mən,
Ol zülfə əlim yetsə, pərişan olarammı?

* * *

Ey gül, sənə dünyada bərabər yenə varmı?
Səndən də gözəl sevgili dilbər yenə varmı?

Gülzari-cahanda, görəsən, səndən əlavə
Ən incə, lətafətli güli-tər yenə varmı?

Qan tökməyə çox mahir idi gözlərin əvvəl,
Ol fitnəli gözlərdə o şakər yenə varmı?

Bülbülləri mən tək gətirən şurə çəməndə,
Bir bülbüli-şeyda mənə bənzər yenə varmı?

Yüz aşiqi bir rəmzlə Məcnun eləyənlər,
Ol Leyli məlahətli gözəllər yenə varmı?

Öz aşiqinə zülm edə, biganəyə min naz,
Bir sən kimi birəhm, sitəmgər yenə varmı?

Sultanlara, xaqanlara baş əyməyən əsla,
Dərviş kəramətli qələndər yenə varmı?

Vahid! Hanı Yusif, hanı Səyyar ilə Saqib,
Kimdən soraq; ustadımız Azər yenə varmı?

* * *

Göstərmə məndən özgəyə, ey gül, cəmalını,
Tanrım mənə nəsib eyləyə ta vüsalını.

Daim xəyali-vəslin ilə şad olur könül,
Bildir mənə ürəkdə olan öz xəyalını.

Tale həmişə könlünü şad eyləsin sənin,
Göstərməsin mən aşiqə dərdü məlalını.

Neylər ayı, günü, gözəlim, ya sitarəni,
Lalə üzündə kim görə ol qarə xalını.

Yüz min gözəl yetirsə əgər kainat özü,
Dünya üzündə, bil ki, yetirməz misalını.

Nazlı gözəlsən, olmalıdır səndə mərifət,
Davran ədəblə, istəsin ellər kamalını.

Vahid, şikayət eyləmə ol nazlı yaridən,
Bəlkə eşitdi, bildi sənin xəstə halını.

* * *

Məcnunla vurdu bir gecə Leyli arasını,
Min dərdə saldı aşiqi-bəxti-qərasını.

Məcnunun ahı eşq odunu yaydı aləmə,
Bildirdi binəvalərə öz ixtirasını.

Fərhad eşq tişəsini çaldı başına,
Nazik əlilə bağladı Şirin yarasını.

Əğyarə qorxudan demədim, sevgilim budur,
Fürsət ki tapdı, artıracaq iftirasını.

Namərdə minnət eyləməz, əlbəttə, mərd olan,
Ədnadır istəyən fələkin zər-xarasını.

Leylidən ötrü dözməz idi bunca möhnətə,
Məcnun biləydi eşqimizin macərasını.

Vahid, bu Odlar ölkəsinin verməərəm, inan
Bəhri-mühiti-Hinduyə Kürlə Arazını.

* * *

İnanmayaydım əzəldən o canalanə gərək,
Onu sevincə, bu könlüm dönəydi qanə gərək!

Əbəsdir, indi o şuxə desən, vəfasızdır,
Onu əzəldə çəkəydin bir imtəhanə gərək.

Mən aşiqəm demə, ta yanmayınca eşq oduna,
Həqiqi aşiq olan kəsdə bir nişanə gərək.

Baxanda naz ilə min fitnə qaldırır çeşmin,
Bu fitnəni yatıran mərdümi-zəmanə gərək.

Əsirinəm, dedim, ey gül, inandı göz yaşıma,
Vüsalə yetmək üçün əldə bir bəhanə gərək.

Nigarını sevən aşiq fəraqə səbr eylər,
Baharı istəsə bülbül, dözə xəzanə gərək.

Bizim zəmanəni, Vahid, gülüzlülər bürüdü,
Həmişə etməli bülbül kimi təranə gərək!

* * *

Ey könül, hər kəsə öz istədiyi yarı gərək,
Bülbülə öz gülü, öz sevdiyi gülzarı gərək.

Yar üçün aşiq edər naləni, bülbül gül üçün,
Hər şeyin, doğru demişlər ki, xiridarı gərək.

Məni əğyar ayırıb sevgili cananımdan,
Mən düşən günlərə tanrım sala əğyarı gərək.

Mən ki öz dilbərimin lalə yanağın sevirəm,
Mənə dəhrin nə səfası, nə çəmənzarı gərək.

Məncə, dünyada təbiət yetirən bir gözəlin
Zinəti olmasa da, doğru, düz ilqarı gərək.

Təzəsən, gül kim tərsən, səni hər kimsə sevir,
Gözəlim, xalqa baharın yeni novbarı gərək.

Həmdəmin olsa da gülçöhrə, o bir şərt deyil,
Həmi xasiyyəti göyçək, həmi rəftarı gərək.

Vahid, istərsən əgər, məclisimiz xoş keçsin,
Zülfünün[1] "Orta segah"ı, Paşanın[2] tarı gərək.

---

[1] Məşhur xanəndə Zülfü Adıgözəlov
[2] Məşhur tarzən Paşa Əliyev

* * *

Ey dil, fəraqi-yaridə əfğan edəm gərək,
Hicran oduyla ta səni büryan edəm gərək.

Zülfi-nigarı boynuma zəncirtək salıb,
Məcnun kim bu çölləri cövlan edəm gərək.

Ləli-ləbindən ayrı düşən binəva mənəm,
Bülbülsifət fəraqdə dil qan edəm gərək.

Əhd etmişəm zəmanədə vəslin bahasına,
Xaki-rəhinlə cismimi yeksan edəm gərək.

Ey dil, fəraqi-yarə edib səbr, eşqimə
Əğyari-ziştixuləri heyran edəm gərək.

Vahid, o qədər nalə edib, ahü zaridən
Əhli-cahanı hali-pərişan edəm gərək.

* * *

Fikrindəmi bir gün, gözəlim, biz sizə gəldik?
Sizdən qayıdıb, sonra bərabər bizə gəldik.

Güldük və danışdıq gecəni, sübh açılınca,
Bir qönçə gül üstündə sizinlə sözə gəldik.

Kef çəkdiyimiz xatirələr varmı yadında?
Gülşəndə, bir aydın gecədə üz-üzə gəldik.

Xeyli dolaşıb seyr elədik güllər içində,
Bir-birmizə çox işvəli, çox baməzə gəldik!

Biz ki, gözəlim, can deyərək, can eşidərdik,
Bəs indi nə oldu bizə, yoxsa gözə gəldik?

Nə səndə var ol mehrü məhəbbət, nə də məndə,
Söndük, yanan ulduz kimi son mərkəzə gəldik.

Vahid, o keçən günləri bilmərrə unutduq,
Lakin yeni dünyaya biz indi təzə gəldik.

* * *

*Qəzəl böyük ədib və şair*
*Hüseyn Cavidə ithaf edilmişdir*

Biz bir qatar tutiyi-şirinsuxənlərik,
Öz nəğməmizlə ziynəti-sərvi-çəmənlərik.

Gülüzlülər təranəmizin həsrətin çəkir,
Baği-vətəndə bülbüli-xoş nəğməzənlərik.

Bir kimsə bilməyir nə xərabatilərdənik,
Meyxanələr müsafiri rindi-kühənlərik.

Bizdən, həmişə zövq alıb ərbabi-mərifət,
Biz əhli-halə ətr saçan yasəmənlərik.

Məşuqəmiz həqiqi Züleyxayi-ərdir,
Eşq aləmində Yusifi-gülpirəhənlərik.

Lövh üzrə pirimiz bizi yazmış şəhidi-eşq,
Meydani-ədli-daddə gülgün kəfənlərik.

Cavid həmişə xəlqimizin xatirindədir,
Vahid, o yoxsa, ruhi ilə həmvətənlərik.

* * *

Könül, biz aşiqik, eşq ilə iftixar edirik,
Bu iftixarimizi xəlqə intişar edirik.

Həyata zövq verən eşqdir, məhəbbətdir,
Bununla könlümüzü biz də bəxtiyar edirik.

Sədaqət anlamayan kəsdə etibar olmaz,
Sədaqət əhlinə ancaq biz etibar edirik.

Bizik öz əsrimizin indi əsil Məcnunu,
Bütün gözəllərə eşq içrə can nisar edirik.

Bizim məhəbbətimizlə gözəlləşir aləm,
Bu zövq ilə vətəni daima gülzar edirik.

İndi ömr sürürük sülh ilə, ədalət ilə,
Bütün cahanda sülh sözün şüar edirik.

Bu şeri, Vahid, Əbülfətdən[1] ötrü yaz oxusun,
Gözəl vətənmizə bu şeri yadigar edirik.

* * *

Nə qədər eşqimiz, ey gül, belə pünhan olacaq?
Aşikar eyləməyincə ürəyim qan olacaq.

Nə qədər gül üzünün həsrətin aşiq çəksin,
Nə zaman vəslinə bəs yetməyə imkan olacaq?

Bəs haçan rəhm edəcək bülbüli-biçarəyə gül,
Nə qədər bəs o fəqirin işi əfğan olacaq?

Eşqdən başqa nə dərd olsa, yenə çarəsi var,
Ayrılıq dərdinə, bilməm, necə dərman olacaq?

Öz xoşumla o qara zülfə əsir oldum özüm,
Bilmədim, xatirim eşqində pərişan olacaq.

Sən götür məscidi, zahid, bizə meyxanəni ver,
Kim bu işdə görək axırda peşiman olacaq?!

---

[1] Müğənni Əbülfət Əliyev

Hələ, Vahid, meyə meyl eyləmə, qoy gəlsin o gül,
Yarsız yerdə mey içmək bizə nöqsan olacaq.

* * *

Könül, həmişə səadət bizimlə yar olacaq,
Xəzan qəmi bitəcək, ölkəmiz bahar olacaq!

Tərənnüm eyləyir hər bir çəməndə bülbüllər,
Bu Odlar ölkəsi bir başqa laləzar olacaq.

Deyib, gülüb, danışır xəlqimiz məhəbbət ilə,
Fərəhli ölkəmiz hər fitnədən kənar olacaq!

Şərəflə ömr edəcək hər kəs öz diyarında,
Nə dərdü möhnəti-qürbət, nə intizar olacaq!

Gözəlləşir günü-gündən həyatı xalqımızın,
Həmişəlik vətən övladı bəxtiyar olacaq!

O xoş zamanı görən əhli-halə eşq olsun!
Ümum aləmə fərxəndə ruzigar olacaq!

Cahan işıqlanacaq sülh ilə, ədalət ilə,
Bizim üfüqdə zəfər nuru payidar olacaq!

Bizim diyardədir qədrü qiymət insanə,
Bütün cahanə nümunə bizim diyar olacaq!

Bu gün Vətənimizə, Vahid, nə xidmət eylərsək,
Bu şanlı iş gələcək nəslə yadigar olacaq!

* * *

Vəfalı olmasan, ey gül, baharın olmayacaq,
Çəmən behişt ola, xoş ruzigarın olmayacaq!

Gözəlliyində gözəlsən, heyf, bir eybin var,
Kiminlə ömr eləsən, etibarın olmayacaq!

O qarə gözlərinin həsrətin çəkən könlüm,
Ümidi-vəslin ilə intizarın olmayacaq!

Əsiri-zülfün olanlar qurtardı zülmündən,
Cəfalar eyləməyə ixtiyarın olmayacaq!

Gözəllik aləminin padişahı olsan da,
Fəqirə cövr eləmək iqtidarın olmayacaq!

Bəlayi-eşqə hələ düşməyib, səlamətsən,
Bu dərdə düşməyə səbrü qərarın olmayacaq!

Vəfalı yar sənə öz əzəlki yarın idi,
Dübarə istədiyin yar, yarın olmayacaq!

Sənin də, Vahid, həyatında şerdən başqa
Vətən oğullarına yadigarın olmayacaq!

* * *

Yetişdi qeyri aşiqlər vüsali-yarə, biz qaldıq,
Xəlayiq çarə tapdı dərdinə, biçarə biz qaldıq.

Hamı öz sevdiyi məşuqəsilə şadi-kam oldu,
Yanan pərvanələrtək ruzü şəb odlara biz qaldıq.

Rəqibi bimürüvvətlər fərəhnak oldu aləmdə,
Sevib cananı, həsrət türreyi-dildarə biz qaldıq.

Keçirtdik tiri-nazın sinədən hər mahrüxsarın,
Yenə bimehr çıxdı, təneyi-əğyarə biz qaldıq.

Məhəbbət gülşənində bir gül əkdik, zəhmətin çəkdik,
Səfasın özgələr gördü, cəfayi-xarə biz qaldıq.

Bütün divanələr, Vahid, kəməndindən xilas oldu.
Yenə ol zülfə bağlı müttəsil avarə biz qaldıq.

* * *

Biz xərabət əhliyik, meyxanələrdən çıxmışıq,
Badələr nuş etmişik, peymanələrdən çıxmışıq.

Atəşi-qəmdən nə qorxaq kim, səməndərxislətik,
Şəmlər yandırmışıq, pərvanələrdən çıxmışıq.

Pirimiz piri-muğandır, xadimi-meyxanəyik,
Rindlər zövqün görüb, divanələrdən çıxmışıq.

İndi biz ikrah edib meydən, nəzərdən düşmüşük,
Yoxsa, min-min məclisi-məstanələrdən çıxmışıq.

Gah öpüb yarın ayağın, gah dolannıq başına,
Biz pərişan zülflərtək şanələrdən çıxmışıq.

Bir şüanın zərrəsindəndir, fəqət rəng özgədir,
Deyrilərdən,[1] məscidi-viranələrdən çıxmışıq.

Qədrü qiymətsiz bizi zənn etmə, Vahid, arif ol!
Pürbəha gəncinəyik, viranələrdən çıxmışıq.

* * *

Fikr edirdim, olacaqsan mənə cananə, gözəl,
Qeyrilər eylədi məndən səni biganə gözəl.

Mən dedim, qismət olar, ömr elərik dünyada,
Aqibət oldu bu əhdim mənə əfsanə, gözəl.

Sən əgər bülbül idin, mən də sənə bir gül idim,
Dərdi bülbülə verib, xari gülüstanə, gözəl.

---
[1] Atəşpərəstlərin ibadət yeri

Etdiyin səhvini axırda bilərsən sən özün,
Bivəfalıq yaraşan şey deyil insanə, gözəl.

Nə qədər sən məni hicran oduna yandırsan,
Tab qıllam, əgər etsən məni pərvanə, gözəl.

Yenə get fikr elə, mən Vahidəm eşqində sənin,
Varam öz eylədiyim əhdimdə mərdanə, gözəl.

* * *

Dəli könlüm, gözəlim, zülfünə olmuş mail,
Yenə zənciri-cünun əqlimi etmiş zail.

Min bahar olsa, cahan cənnətə dönsə, gözəlim,
Görməyincə üzünü aşiqin olmaz qail.

Tez salar ortaya yüz təfriqə bimehr fələk,
Vəsli-canana əgər bir kərə olsam nail.

Aşiqin canını naz ilə gözəllərmiş alan,
El içində böyük əfsanə imiş Əzrail.

Yetərəm vəslinə ol mahın, əgər biganə
Arada olmasa zülmət kimi hər gün hail.

Nola sərgəştə dolansam təməi-zülfün ilə,
Ehtiyac olmasa, dünyanı dolanmaz sail.

Kimsədən incimə, Vahid, səni incitsə o gül,
Tutduğun felinə, əlbəttə, özünsən fail.

* * *

Haqq sənə vermiş, həbibim, eylə kim hüsnü cəmil,
Kim yetər isbati-həqqə müshəfi-ruyin dəlil.

Necə başdan kakilin şövqün çıxardım, bilməzəm,
Bəndəm ol zəncirə, müddətdir, məni-zarü zəlil.

Heyfdir kim, atma peykanın, yetər bir kəc nigah,
Ey kəman əbru, məni gər görmək istərsən qətil.

Teşneyi-cami-zülali-vəslinəm, bir tiğlə
Nola gər bir lütf edib, qanım töküb, qılsan səbil!

Yetmək olmaz zülməti-zülfünlə ləlin vəslinə,
Olsa gər həqdən müqərrər Xızrvəş ömri-təvil.

Min həsəd gülzar kuyində mənə qılsa rəqib,
Qəm deyil, zira ki, yanmaz nari-Nəmrudə Xəlil.

Bir zaman Məcnun əsiri-zülfün oldu, indi mən,
Bağlanır divanələr zənciri-eşqə müttəsil.

Nola, Vahid, yarə zülfündən çəkən möhnətləri
Dil açaydın, şanətək şərh eyləsəydim dilbədil.

* * *

Ol deyil aşiq, mənimtək eşqdə rüsva deyil,
Ruzü şəb Məcnun olub sərgəşteyi-səhra deyil.

Zahidi-nadan nə bilsin qönçə ağzın sirrini,
Sirri-həqqi bilməz ol kim, vaqifi-məna deyil.

Bəhs edər hər gün üzünlə gün, nə nisbət var sənə,
Arizində nuri-həqq səntək onun peyda deyil.

Atəşi-ahim yetirmə göylərə, ey məh, saqın,
Kim gəlir bir gün dəmi, təsir edər, bica deyil.

Eşq zövqün bilməyən kəs dövləti-dünya sevər,
Ol ki, eşq istər həmişə, talibi-dünya deyil.

Payibənd etmiş məni zənciri-zülfə ol pəri,
Mən kimi Məcnun əsiri, türreyi-Leyla deyil.

Vahidi bilmə vəfasız eşqdə, ey bivəfa,
Olmayıbdır ol rəqibə aşina, ədna deyil.

* * *

Bizim nigar dediyimiz nigarımız bu deyil!
Sevimli dilbərimiz, nazlı yarımız bu deyil!

Biz indi də çəkirik intizarını o gülün,
Həqiqi çəkdiyimiz intizarımız bu deyil!

Bizim baharımız ancaq gülüzlülərlə keçib,
Bu nazənin ki, görürsüz, baharımız bu deyil!

O gül ki, biz sevirik, bil, onunla fəxr edirik,
Sizin təsəvvür ilə iftixarımız bu deyil.

Kəməndi-ahə yaxın düşmədi ol ahunigəh,
Yəqinim oldu, sevimli şikarımız bu deyil.

Bizim gözəl bitirib nazü qəmzə məktəbini,
O məktəbi bitirən işvəkarımız bu deyil!

Mən öz ümidimi pərvərdigara bağlamışam,
İnanma Vahidə, pərvərdigarımız bu deyil!

* * *

Aşiqsən, ey könül, qəmi-canana, səbr qıl,
Bir bax cəfayi-gərdişi-dövranə, səbr qıl.

Dünyayə uyma, fanidir övzayi aləmin,
Lal ol, danışma, hərzəvü hədyanə, səbr qıl.

Yar olma, sanma hər kəsi gördükdə əhli-dil,
Nahaq yerə salır səni tez qanə, səbr qıl.

Hər şəm başına dolanıb yanma, ey könül,
Gör şəmdən çəkibdü nə pərvanə, səbr qıl.

Olma tüfeyli, mərdsən, hər bir gədayə kim,
Ali gədası olgilə, mərdanə səbr qıl.

Uyma kəməndi-zülfünə bu leyliveşlərin,
Olma fəzayi-eşqdə divanə, səbr qıl.

Billah fənadu felin-işin, səbrin olmasa,
Səbr etmək ilə iş yetər asanə, səbr qıl.

Naəhl, nanəcibə olunca tüfeyli kim,
Xoşdur ki, mənzilin ola qəmxanə, səbr qıl.

Sirrin həmişə saxla nihan, xalqa söyləmə,
Faş eyləyərlər seyltək hər yanə, səbr qıl.

Hər kimsəni vəfalı bilib, olma aşina,
Bir gün olur ki, qəsd edər ol canə, səbr qıl.

Çeşmi-nigarə, zülfü xətü xalə vermə dil,
Damə düçar edər səni ol danə, səbr qıl.

Vahid, şikayət eyləmə cövri-nigardən,
Kafər də olsa, tez gələr imanə, səbr qıl.

* * *

Uyma hər zülfü qara, sevgili cananə, könül,
Bu vəfasızlar edərlər səni divanə, könül.

Mümkün olduqca çalış, yanmayasan eşq oduna,
Şəmdən gör nə çəkir hər gecə pərvanə, könül.

Sən hələ eşq kəməndində əsir olmamısan,
Uyma Məcnun kimi hər zülfi-pərişanə, könül.

Güldə olsaydı vəfa, xar ilə yar olmaz idi,
Bülbülün ahi yayılmazdı gülüstanə, könül.

Aşina olmaq əbəsdi bu pəriçöhrələrə,
Yenə bir gün olacaqlar sənə biganə, könül.

Sevdiyin olsa Züleyxayi-zaman, sən Yusif,
Məkr edib saldıracaqdır səni zindanə, könül.

Vahidin ömrü bütün nazlı gözəllərlə keçib,
Bu həqiqət sözü zənn eyləmə əfsanə, könül.

* * *

Səbr qıl qürbət əra möhnətü hicranə, könül,
Bir də müşkül yetə əl taməni-cananə, könül.

Yoxdu bir kimsə sora hali-dilim qürbətdə,
Bu qərib ölkədə axı gəlirsən canə, könül.

Xalqa dərmanı vətən içrə verib qaldın əcəb,
İndi möhtac qərib ölkədə dərmanə, könül.

Elədin ayrı məni arizi-gülnarimdən,
Yeri vardır, dönəsən indi qızıl qanə, könül.

Leyliveş bir sənəmin zülfünə dil verdikdə,
Olmusan gör necə Məcnun kimi divanə, könül.

Çəkgilən şanə, qəmin zülfü cəfasını görüm,
Niyə bənd oldun o geysuyi-pərişanə, könül.

Vahidin pəndinə guş eyləmədin, hərçi dedi,
Tutdun hər gün özünə söhbəti-əfsanə, könül.

* * *

Niyə bağlanmısan ol zülfi-pərişanə, könül?
Qaç o zəncirdən, eylər səni divanə, könül.

Nə vəfa eylədi Fərhadə vəfasız Şirin?
Verdi könlün yenə ol Xosrovi-xubanə, könül.

Mənim aşiqliyimi bilmək əgər istərsən,
Gör necə şəmə yanır hər gecə pərvanə, könül!

Leylinin rəhmi əgər gəlsə idi Məcnuna,
Eşqi salmazdı onu dəşti-biyabanə, könül.

Gözlərin Yusifin eşqilə itirdi Yaqub,
Tapdı gördükdə şəfa ol məhi-tabanə, könül.

Aşinalıq eləyəndən bəri cananı ilə,
İstəməz Vahidi görməkliyə biganə, könül.

* * *

Dil bilən, söz anlayan bir nazlı yar istər könül,
Lalədən, güldən gözəl, bir novbahar istər könül.

Etibarın görməyincə sevmərəm bir dilbəri,
Nazənin məhparələrdən etibar istər könül.

Hər qara zülfün əsiri olmaram bundan sora,
İndi aləm özgədir, xoş ruzigar istər könül.

Oynayıb gülmək, danışmaq, eyşü nuş əyyamıdır,
Bülbüli-şeyda kimi min baləzar istər könül.

Hər tərəf güldür, çiçəklikdir, bu azad ölkəmiz,
Daim öz xoşbəxt xalqın bəxtiyar istər könül.

Biz vətən mülkün həqiqətdə sevən aşiqlərik,
Xaini, ədnanı yurdumdan kənar istər könül.

Bəxtəvər, Vahid, o kəslərdir bu xoş aləmdədir!
Hər zaman bu şən həyatı payidar istər könül.

* * *

Fəda olum sənə, ey Yusifi-zəmanə balam
Ki, gəlməyib dəxi mislin sənin cahanə, balam.

Ölüncə üzmərəm əl səndən, ey vəfa kani,
Bu qədr aşiqini çəkmə imtahanə, balam.

Nə müddət idi sənin həsrətəm camalına mən,
Olubdur seyli-sirişkim üzə rəvanə, balam.

Bu fani dəhrdə, billah, məni-fələkzədəni,
Bəla xədənginə sən etmisən nişanə, balam.

Görəndə xalini könlüm quşu fəqanə gəlir,
Necə ki, nalə edir quş görəndə danə, balam.

Əgərçi canımı almaqdı xahişin, söylə,
Bu sirri saxlama pünhan, gətir bəyanə, balam.

Əsiri-zülfün olandan şikəstədir Vahid,
Gəlir fəğanə, edər quş kimi təranə, balam.

* * *

Xoşdur mənə, zülfündə gəzən şanə mən olsam!
Ölməzdim, o zəncirdə divanə mən olsam!

Öz şövqüm ilə arizi-cananda yanardım,
Eşq aləminin şəminə pərvanə mən olsam!

Nəzr eyləmişəm, hörmət edəm piri-muğanə,
Gər qismət ola, xadimi-meyxanə mən olsam!

Vaiz hələ gülzari-vətən şövqünü bilmir,
Bir son qoyaram rövzeyi-rizvanə, mən olsam!

Öz yurdumuzun güllərinin aşiqiyik biz,
Baxmazdım, inan, başqa gülüstanə, mən olsam.

Könlüm məni qərq eylədi bəhri-qəmi-eşqə,
Bir növ çıxardım yenə bir yanə, mən olsam.

Aşiqlər üçün bir yeni dünya yaradardım,
Zülm eyləməz, eşq əhlinə cananə mən olsam.

Mən dost ikən, ey gül, məni saldın nəzərindən,
Tez vəslə yetərdim, sənə biganə mən olsam!

Vahid, demə, biz görməmişik baği-behişti,
Cənnət deyərəm Azərbaycanə, mən olsam.

* * *

Meyi-nabi oxuyur zahidi-bizövq həram,
Kafərəm, almasam ol saqi əlindən gər cam.

Zahidin canibi-meyxanəyə düşsə güzarı,
Kafərəm, məscidi bir dəfə də etsə o məqam.

Pənd ləğv ilə firib etmə məni, ey naseh,
Düşmərəm rişteyi-damə, sənə vermən də lican.

Məni bir məst qıl huşyar ikən, ey saqi, aman!
Sən şəhim, taci-sərim, dərgəhinə mən də qulam.

Zahida, etmə məlamət mey üçün eşq əhlin,
Abi-kövsərdir meyim, saqiyi-gülçöhrə imam.

Meyə oxşatdı töküb qanımı ol qönçədəhən,
Qanımı gördü, odur, qana dönüb mey də tamam.

Bu dili-zarini, Vahid, elə dildarə fəda,
Qanını tökməyə müjganları çəkmişlə nizam.

* * *

Əcəb Məcnunam, ol zülfə əsir olduqca dilşadəm!
Bütün dünya qəmindən, guyiya, bilmərrə azadəm.

Pərilərdə yenə bir rəhm olur, gör kim, nə zalimsən,
Nola, gər bir tərəhhüm qılsan, axır adəmizadəm?

Nə Məcnun səbr edər hicrində, nə Fərhad edər taqət,
Yenə məndim davam etdim, nə Məcnunəm, nə Fərhadəm!

Könüldə şövqi-vəslin olmasaydı, çoxdan ölmüşdüm,
Əgərçi dərdi-hicran çəkməyə aləmdə mötadəm.

Vüsalın şərbətindən görmədim bir ləzzət ömrümdə,
Fəraqın zəhrini içməkdə ancaq xeyli ustadəm.

Ol ahu gözlünün mümkünmü zülfündən xilas olmaq?
Nə mümkündür mənə, mən ki əsiri-dami-səyyadəm.

Mənim iradımı təshih qılmaq qeyri-mümkündür,
Bu növi, Vahida, başdan ayağa mən ki iradəm!

* * *

Yenə vuruldu könül zülfi-yarə, öz qəmi kəm,
Kəməndə düşdü bu məcnun dübarə, öz qəmi kəm.

Səfalı xoş günü olmaz əsiri-zülf olanın,
Kim istəyirsə ola bəxti qarə, öz qəmi kəm.

Vəfasız olduğunu gördü bülbül öz gülünün,
Yenə dikib gözünü novbaharə, öz qəmi kəm.

O şuxə mən nə qədər yalvarıb da and içdim,
İnanmadı yenə pərvərdigarə, öz qəmi kəm.

Gözəllər həqlidir incitsə, yıxsa könlüm evin,
Bu qanə dönmüşə yox başqa çarə, öz qəmi kəm.

Mənimtək olmadı Məcnun əsiri-eşqi-Vətən,
Yayıldı şöhrəti hər bir diyarə, öz qəmi kəm.

Demişsə, Vahid, o gülçöhrə, “gözlə, tez gələrəm”
Səni indi adət elə intizarə, öz qəmi kəm.

* * *

Sevmişəm mən səni, ey şux, peşiman deyiləm,
Səndən əl çəksəm ölüncə əyər, insan deyiləm.

O vəfasız ki, səninlə belə rəftar elədi,
Mən bu işdən, gözəlim, zərrəcə xəndan deyiləm.

Min əyər düşmənim olsa, o cəfapişə kimi,
Sən də qorxma, mələyim, mən daha qorxan deyiləm.

Sevirəm mən səni, biəhd hesab etmə məni,
Səndən özgə gözəlin eşqinə qurban deyiləm.

Sən mənimlə olacaqsan, nə qədər ömrüm var,
Səndən özgə gözəl eşqində nigaran deyiləm.

Məni səndən ayıra, bəlkə, ölən vaxtda əcəl,
Vahidin əqli kəsir hər şeyi, nadan deyiləm.

* * *

Gözəlim, sən görən ol aşiqi-nalan deyiləm,
O xumar gözlərə bundan sora heyran deyiləm.

İndi get həsrətini başqa bir aşiq çəksin,
Bir də sevsəm səni, söz vermişəm, insan deyiləm.

Gəz, dolan, seyr elə öz sevdiyin aşiqlər ilə.
Ürəyindən nə keçir, eylə, peşiman deyiləm.

Səndə bir azca gözəllik: iki qaş, göz vardır,
Bivəfasan, demişəm aləmə, qorxan deyiləm.

Gözləməkdən yolunu yaxşı qutardım özümü,
İndi heç bir gözəl eşqində nigaran deyiləm.

Könlümü güclə xilas eyləmişəm zülfündən,
Daha xatircəməm, eşqində pərişan deyiləm.

Vahidəm, indi sədaqətli gözəllər sevirəm,
Hər vəfasız gözəlin hüsnünə qurban deyiləm.

* * *

Dəyişmişəm, gözəlim, indi sən deyən deyiləm!
Get, hər kiminlə gəzirsən gəz, inciyən deyiləm.

Mənimlə qaş-göz atırsan, gəzirsən özgəylə,
Bu rəngi gəlmə mənə, şivə-zad yeyən deyiləm.

Çəkibdir ətrini biganə qönçəlikdə sənin,
Sən indi gültək açılsan da, iyləyən deyiləm.

Məni şirin dil ilə bəs deyilmi aldatdın?
Zəmanə görmüşəm, axır, iməkləyən deyiləm.

Əgər öləndə həyatım sənin əlində ola,
Düşüb qədəmlərinə minnət eyləyən deyiləm.

Özüm də Vahidəm, aləm bilir dəyanətimi.
Sənin kimi gedib əğyarə baş əyən deyiləm.

* * *

Tale mənə yar olmasa, mən neyləyə billəm?
Zövqümcə nigar olmasa, mən neyləyə billəm?

Bir ahu baxışlı gözələ çoxdan əsirəm,
Ahimlə şikar olmasa, mən neyləyə billəm?

Mərdliklə, sədaqətlə gözəl dost yolunda,
Bir can ki, nisar olmasa, mən neyləyə billəm?

Yüz il yaşayıb, bircə gün ömrümdə fələkdən
Kamimcə mədar olmasa, mən neyləyə billəm?

Mən bir gül üçün yalvarıram xarə həmişə,
Güldən o kənar olmasa, mən neyləyə billəm?

Məhparələrin cövrünü çəkməkliyə, Vahid,
Könlümdə qərar olmasa, mən neyləyə billəm?

* * *

Vəfasız eyləyən ol nazlı yarı mən özüməm.
Salan nəzərdən o çeşmi-xumarı mən özüməm.

Zaman olur, gülə bülbül də bivəfalıq edir,
Rəqibə mail edən ol nigarı mən özüməm.

O nazənn gözələ çox cəfalar eyləmişəm,
Sevimli dilbərimin zülmkarı mən özüməm.

Mən olmasam, o gül əğyarə etina eləməz,
Ona verən belə bir ixtiyarı mən özüməm.

Vüsali-dilbərə can nəqdin etsələr qiymət,
O nazənin gözəlin cannisarı mən özüməm.

Bizim zəmanədə Yusif çəkilsə bazarə,
Onun birinci xiridarı mən özüməm.

Gedibsə torpağa Məcnun, yerində indi onun
Qalan o türbəti-məzarı mən özüməm.

Gülüzlü nazlı gözəllərlə xoş keçib ömrüm,
Elin sevimlisi, ən bəxtiyarı mən özüməm.

Ümum aləmə sülhün sədası zövq verir,
Qalan zəmanədə ol atəşin şərarı mən özüməm.

Deyirdim, əhli-qələm, Vahid, əfv edərsə məni,
Böyük Füzulimizin yadigarı mən özüməm.

* * *

Mən həmişə yarımın zülfün pərişan istərəm,
Ağ üzündə qara xalın, çünki pünhan istərəm.

İstərəm, zülfü üzünə düşsün, olsun sayəban,
Görməsin əğyari-bədxu, ruyi-canan, istərəm.

Dur kənarimdə, nigara, qıl tamaşa aşiqə,
Bir mərizü biəlacam, dərdə dərman istərəm.

Zahidi-kəməqlə bax, vəsf eyləyir qılmanü hur,
Neylərəm qılmanü huri, vəsli-xuban istərəm.

Vahida, yoxdu sənin tək xar olan əyyamdə,
İndi ki, yoxdu əlacın, söylə hicran istərəm.

* * *

Nə eybi var, gözəlim, hər nə eyləsən dözərəm,
Yolunda həsrət ilə eşq çöllərin gəzərəm.

Bu qanlı çeşmim ilə hicr dağı sinəmdə,
Çəmən çiçəklərini lalələr kimi bəzərəm.

Rəqiblər deyil, öz bəxtimiz ayırdı bizi,
Düşüncəsiz deyiləm, incə mətləbi sezərəm.

Cahanı boğsa da tufan, məni o qorxutmaz,
Nə növ cuş eləsə eşq dalğası, üzərəm.

İnanma, Vahid, o şuxə, vəfası yoxdur onun,
Mələk də olsa, mən ondan ümid əlim üzərəm.

* * *

Bu qürbət ölkədə mən görmədim səfa, gedirəm,
Bu qədri bəsdi mənə, çəkmişəm cəfa, gedirəm.

Fələk ayırdı məni mahru nigarimdən,
Qəddimi əydi, günüm eylədi qara, gedirəm.

Olubdu məhrəmi-kuyin rəqib, mən məhrum,
Bu zülmü gərçi mənə görmüsən rəva, gedirəm.

O çin zülfünə, ey ahuvəş, əsir idi dil,
Yəqinim oldu ki, mən etmişəm xəta, gedirəm.

Həmişə adətin eşq əhlinə cəfadı sənin,
Ki, səndə zərrəcə mən görmədim vəfa, gedirəm.

Xəyalə salcaq o qaşın xəyalını mən, bil
Hilali-nov kimi oldu qədim düta, gedirəm.

Fəraqi-cövrünü, Vahid, əgərçi bilsəydim,
Ümmidi-vəslinə aldanmazdım ibtida, gedirəm.

* * *

Bir az da səbr elə, ey yari-mehriban, gəlirəm,
Sənin yolunda fədadır bu cismü can, gəlirəm.

Vəfalı bülbülünəm, həsrəti-cəmalın ilə,
Çəmən çiçəkləritək bağrım oldu qan, gəlirəm.

Əgərçi möhnəti-hicrinlə od tutub yanıram,
Nə qəm ki, şövqi-vüsal ilə şadiman gəlirəm.

Yüz il gər ayrı düşək, xatirimdəsən, gözəlim,
Sədaqətimlə məni eylə imtahan, gəlirəm.

Mənə təsəlli verən bir sənin xəyalındır,
Bir özgə dilbərə halım deyil bəyan, gəlirəm.

Əgər behişt ola qürbət, yenə cəhənnəmdir,
Vətən məhəbbəti vermir mənə aman, gəlirəm.

Mənim bu halımı, Vahid, nigarə tez yetirin,
Unutmasın məni ol yari-həmzəban, gəlirəm.

* * *

Get, gülüm, get mənə sən can olasan, istəmirəm,
İşvəli, sevgili canan olasan, istəmirəm!

Bir də göz yaşı töküb, kuyinə gəlməm, gözəlim,
Görüb əhvalımı xəndan olasan, istəmirəm!

Bivəfalıqda bütün aləmə məşhur oldun,
Sən əgər huriyü qılman olasan, istəmirəm!

Vurmusan sinəmə min yarə, kifayətdi mənə,
Bu sınıq könlümə dərman olasan, istəmirəm!

Bivəfasan, deyiləm razı, öləndən sonra
Qəbrim üstündə nigahban olasan, istəmirəm!

Pis günümdə məni saldın nəzərindən, getdin,
Yaxşı gündə mənə mehman olasan, istəmirəm!

Vahidin qiymətini bilmədin, incitdin onu,
Elə ki, öldü, peşiman olasan, istəmirəm!

* * *

Güldən artıq səni, ey cismimə can, istəyirəm!
Gündə yüz yol edəsən bağrımı qan, istəyirəm.

Aşikar ağlasam hicrində, gülər biganə,
Xəlqdən mən səni könlümdə nihan istəyirəm.

İncimə, gər səni əvvəlcə dedim, istəmirəm,
Qılmadım sirrimi əğyarə əyan, istəyirəm.

Ayrılıq dərdi qocaldıb məni, qəmdən ölürəm,
Yenə də mən səni, ey tazə cavan, istəyirəm!

Nə ola, bir də görəydim səni yanımda, gözəl!
Belə bir fürsəti mən xeyli zaman istəyirəm.

Gül kimi bir dəfə öpməklə qızarmış yanağın,
Demə, gəl mən də öpüm ki, qana-qan istəyirəm.

Vahidin, qəlbini incitmə, sınar, şairdir,
Candan artıq səni, ey qönçədəhan, istəyirəm.

* * *

Mən öz nigarımın hüsnü cəmalın istəyirəm,
Fəraqinə yanıramsa, vüsalın istəyirəm.

Məhəbbət əhli o şuxin sevirsə gül üzünü,
Mən isə dilbərimin zülfü xalın istəyirəm.

Gözəllik aşiqi çoxlar olubdu aləmdə,
Mən öz nigarımın əqlü kəmalın istəyirəm.

Özüm kimi hanı aşiq ki, əhli-hal olsun?
Həmişə mən gözəlin əhli-halın istəyirəm.

Mən indi əsrimizin olmasam da Məcnunu,
Gözəllərin yenə Leylimisalın istəyirəm.

Mənim xəyalım odur, can verim o nazlı gülə,
Bu barədə mən onun da xəyalın istəyirəm.

Görəndə daim o gülçöhrəni fərəhlənirəm,
Özümküdür yenə, cahü cəlalın istəyirəm.

Məni fəraq ilə, Vahid, o təlxkam edənin
Büsati-vəsldə şirin məqalın istəyirəm.

* * *

Gözlərin qarəsinə bir neçə qurban demişəm,
Qaşların tağına qurban yerinə can demişəm.

Razi-pünhanımı xalq içrə mənim faş elədin,
Bivəfa, mən ki sənə sirrimi pünhan demişəm!

Xublar cümlə gədadır səri-kuyində sənin,
Sənə bu xublar içrə şəhi-xuban demişəm.

Qaşına tiğ dedim, qanımı tökmək nə üçün,
Tut ki, zalım, nola bu barədə böhtan demişəm.

İnciyib çıxsa sinəmdən, yeri var, peykanın
Ki, neçün bağrıma gəldikcə basıb can demişəm?

Vahidəm, qoymayın, öldürdü o məhparə məni,
Səhv edib gül üzünə mən məhi-taban demişəm.

* * *

Bu söz ki var, bunu, ey mahiparə, mən demişəm,
Əsir edib məni ol zülfü qarə, mən demişəm.

Sənə nə qədri deyilmişdi, qeyrə yar olma,
Hələ bu sözdən əlavə dübarə, mən demişəm.

Solar o gül üzün, əlbəttə, bir zaman, gözəlim,
Çox etibar eləmə ruzigarə, mən demişəm.

Cəmalın atəşinə ay və gün deyən çox olub,
Üzündə xalına yanmış sitarə, mən demişəm.

İnanma, ey dil, o çeşmi-siyahə, qanın içər,
Yaxınlıq eyləmə məstü xumarə, mən demişəm.

Vəfasız olmağını bilməyirdi bir kimsə,
Xəlaiq içrə bunu aşikarə mən demişəm.

Ol ahu gözlüyə, Vahid, kəmənd atır əğyar
Ki, qoymayın onu gözdən kənarə, mən demişəm.

* * *

Səninlə mən, gözəlim, aşinalıq eyləmişəm,
Səni vəfalı bilib, canfədalıq eyləmişəm.

Rəqibə həmdəm olub, salmısan məni gözdən,
Haçankı gün sənə mən bivəfalıq eyləmişəm?

Səninlə yar olalı bir zaman üzüm gülməz
Ki, bilmirəm sənə nə biədalıq eyləmişəm?

Cəfanı tərk elə, məhparələr cəfa eləməz,
Nə müddət idi qapında gədalıq eyləmişəm.

Günüm qaraldı səri-zülfünün xəyalından,
Təəccübəm, sənə nə üzqəralıq eyləmişəm?

Kəsib ümidimi, Vahid, mən öz nigarımdan,
Səfalı eyşimi axır fənalıq eyləmişəm.

* * *

Sevgilim, bir bilmədin, sənsiz nə möhnət çəkmişəm.
Bivücud əğyarlərdən çox əziyyət çəkmişəm.

Zövqi-vəslin xatirə gəldikdə qəmdən ağlaram,
Özgə bir canana sənsiz, sanma, həsrət çəkmişəm.

Məh camalın görməyə biganə fürsət vermədi,
Sübh olunca hər gecə kuyində növbət çəkmişəm.

Bivəfalıq rəsmini tərk et, dedim, tərk etmədin,
Səndən ötrü yalvarıb əğyarə minnət çəkmişəm.

Vəsli-yar olmaz müyəssər hər bəlakeş aşiqə,
Mən sədaqətlə bu yolda çox müsibət çəkmişəm.

Nazəninlər vəslinə mən nail olsam, haqlıyam,
Çünki çox məhparələr eşqində zəhmət çəkmişəm.

Özgəni dindirdi, öz yarım məni dindirmədi,
İndi gör, Vahid, xəcalətdən nə zillət çəkmişəm!

* * *

Könlümü zülfün xəyaliylə pərişan etmişəm,
Öz əlimlə eşq mülkün gör nə viran etmişəm!

Bir vəfasız güldən ötrü xarə çox yalvarmışam,
Hər zaman bülbül kimi min ahü əfğan etmişəm.

Eşqdə yanmaqdan özgə bir əlamət görmədim,
Könlümü pərvanətək çox şəmə qurban etmişəm.

Eşq bir divanəlikmiş, dərdə düşmüş könlümə,
Eşqdən əl çəkmədi, yüz dəfə dərman etmişəm.

Eşq cövründən qutarmaq bir sağalmaz dərd imiş,
Mən bu dərdin çarəsin ölməklə asan etmişəm.

Məndən əvvəl yoxdu bir aşiq diyari-eşqdə,
Eşq dərsin mən gedib Məcnunə elan etmişəm.

Vahidəm, mən leyliveşlər zülfünün Məcnuniyəm,
Çox zamanlar vadiyi-eşq içrə cövlan etmişəm.

* * *

Sevdayi-zülfi-yarə o gündən ki, düşmüşəm,
Guya ki, dami-qəflətə möhkəm ilişmişəm.

Bir gecə olmadı, görüm ol mahi-tələti,
Sübh açılınca hər gecə kuyini gəzişmişəm.

Əğyarə, bilmədim, dedim öz sirri-eşqimi,
Səhv etmişəm bu barədə, xeyli sürüşmüşəm.

Ağzımda indi də var onun təmü ləzzəti,
Ol ləli-şəkkər ilə ki, bir yol öpüşmüşəm.

Yansın dilim, o yarə əgər bivəfa desəm,
Əmma rəqibdən neçə dəfə eşitmişəm.

Bir səngdil nigari-vəfasızdan ötrü mən,
Əğyar ilə o qədr keçən gün söyüşmüşəm.

Yarın vəfasız olmağı, əğyar tənəsi,
Vahid, çürütdü ömrümü, candan bezikmişəm.

* * *

Xaki-payinə o mahın dün səhərdən düşmüşəm,
Zərrə mehr etməz mənə, guya nəzərdən düşmüşəm.

Olmuşam Məcnunu ol gündən mən ol Leyliveşin,
Eylə rüsvayəm ki, xalq içrə dəyərdən düşmüşəm.

Ol hilaləbruyə dil açsam da, baxmaz naləmə,
Guyiya, bir paslı şəmşirəm, kəsərdən düşmüşəm,

Məndən ol sərvim, o gündən kim kəsibdir ülfətin,
Öylə bil ki, bir nihaləm, mən səmərdən düşmüşəm.

Rəhm qıl, cövr etmə, ahımdan yanarsan aqibət,
Sanma bir sönmüş çirağəm, mən əsərdən düşmüşəm.

Olma həmdəm qeyrlə, qeyrət həlak eylər məni,
Çox da pirəm, ey gözəl, sanma, hünərdən düşmüşəm.

Surəti-halım görüb, el kəsdi məndən rəğbətin,
Eylə kim ol mahin eşqində ləkərdən düşmüşəm.

Vahid, Azər xoş demiş: oddur vücudu aşiqin:
"Azəri-eşqəm, güman etmə, şərərdən düşmüşəm".

* * *

Verən yoxdur nigarimdən nişan, yarəb, nə bədbəxtəm!
Dönübdür kövkəbi-bəxtim güman, yarəb, nə bədbəxtəm!

Həmişə kəc inad eylər mənimlə çərxi-kəcrəftar,
Edib cövri-fələk qəddim kaman, yarəb, nə bədbəxtəm!

Fəqanü ahü naləmdən gəlib həmsayələr təngə,
Gözüm yaşı zibəs olmuş rəvan, yarəb, nə bədbəxtəm!

Ənisü munisim nalə, könüldə möhnəti-hicran,
Olub şamü səhər karim fəğan, yarəb, nə bədbəxtəm!

Təamım xuni-dil olmuş, ilahi, göz yaşım şərbət,
Olubdur gülşəni-ömrüm xəzan, yarəb, nə bədbəxtəm!

Cahanda eyşü işrət etmədim kamımca yarimlə,
Ürəkdə qaldı bu həsrət nihan, yarəb, nə bədbəxtəm!

Mərizi-bəstəri-eşqəm, yoxumdur, ah, dərmanım,
Bədəndə qalmayıb tabu təvan, yarəb, nə bədbəxtəm!

Yetirdi ömrümü başa əbəs bihudə mövhumat,
Görüm, viran ola, külli-cahan, yarəb, nə bədbəxtəm!

Təbibi-eşq sənsən, eşqdən Vahid olub xəstə,
Olur hər an sənə dərdim əyan, yarəb, nə bədbəxtəm!

* * *

Ey qarə gözlü, zülfün əlindən bəladəyəm,
Bir dərdə düşmüşəm ki, bu günlə səbadəyəm!

Ağlatdı xalqı göz yaşım əhvali-zarimə,
Bir yol soruşmadın ki, nə möhnətsəradəyəm.

Ey bivəfa, bu halıma bir qılmadın nəzər,
Eşqində müttəsil gecə-gündüz cəfadəyəm.

Hər yandan üstümə tökülər tənə daşları,
Mərd aşiqəm ki, gör necə yalqız əradəyəm!

Bir yan rəqib tənəsi, bir yan sənin qəmin,
Bilməm, nə sirdir bu, əcəb macəradəyəm?!

Nəzr etmişəm, yolunda gərək can fəda edəm,
Olsun qəsəm o canına, bu iddiadəyəm.

Vahid, səfayi-aləmi verdim bütün sənə,
Ömrüm qutardı, mən dəxi rahi-fənadəyəm.

* * *

Sevgilim, zülfünə ənbər dedilər, mən də dedim,
Üzünə mahi-münəvvər dedilər, mən də dedim.

Necə kafər deyim ol gözlərinin mərdümünə,
Fitnə ustadına kafər dedilər, mən də dedim.

Az deyildir məni də eşqdə Məcnun eləyən,
Səni Leylayə bərabər dedilər, mən də dedim.

İzn ver aşiqin, ey gül, sənə zalim deməyə,
Rəhmsizdir bu gözəllər, dedilər, mən də dedim.

Bağı-cənnət də camalın kimi olmaz, bilirəm,
Ləbinə çeşmeyi-kövsər dedilər, mən də dedim.

Afərinlər, ol təbiət ki, gözəllər yaradıb,
Nə qədər xilqətə afər dedilər, mən də dedim.

Ey Züleyxayi-zaman, bircə sənin xatirinə
Yusifi-Misrə peyəmbər dedilər, mən də dedim.

El içində nə qədər gör mənə təsir elədi,
Sevdiyim şuxə sitəmkər dedilər, mən də dedim.

Qəzəl ustadı füzuliləri var ölkəmizin,
Vahidi onlara çakər dedilər, mən də dedim.

* * *

Xatirim zülfün xəyalilə pərişan eylədim,
Öz əlimlə könlümün mülkünü viran eylədim.

Gül üzündə daneyi-xalın görüb, ey qönçələb,
Əndəlibi gülşənin oldum da dilqan eylədim.

Şəmi-ruxsarın görüb pərvanəvar, ey məhliqa,
Oda yaxdım canımı, ol şəmə suzan eylədim.

Qəsdi-canım üçün nizam ilə durub müjganların,
Sineyi-suzanım ol peykanə qalxan eylədim.

Qəsdi buymuş, xəncəri-əbrulərin qanım tökə,
Mən ona ondan qabaq canımı qurban eylədim.

Dün rəqib ilə görüb cananı ol qədr ağladım,
Bəhri-əşki-çeşmilə əğyari heyran eylədim.

Vahida, Məcnunu derlər, aşiqi-sadiq, vəli
Mən ki, Məcnundan füzun eşqimdə tüğyan eylədim.

* * *

Bu çəkdiyim qəmi canana mən özüm demədim,
Desəm, gülər bizə biganə, mən özüm demədim.

Gül əldə, yar yanımda, meyim piyaləmdə,
Bu zövqü ol güli-xəndanə mən özüm demədim.

O zülfə çoxdan əsirəm, bu sirri el də bilir
Ki, olmuşam niyə divanə, mən özüm demədim.

Desəm ki, ahim ilə şəmlər yanır gecələr,
Mənəm o şəmidə pərvanə, mən özüm demədim.

Fələk rəqibə də bir gün bu dərdi çəkdirəcək,
Odur salan məni hicranə, mən özüm demədim.

Nigar olan yeri xain rəqibə bildirmə,
O gəlməsin bu gülüstanə, mən özüm demədim.

Bizim məhəbbətədir etiqadımız, Vahid!
Ürək bu yolda dönür qanə, mən özüm demədim.

* * *

Min gözəl gördümsə, bir əhli-vəfasın görmədim!
Çox cəfa çəkdim bu yolda, bir səfasın görmədim!

Üzdüm əl biganəxislət aşinalardan, könül,
Mən bu dünyanın həqiqi aşinasın görmədim!

İntəhayə yetdi ömrüm intizari-vəsl ilə,
Möhnətü dərdü fəraqın intəhasın görmədim!

Ney kimi fəryadıma göz yumdular həmdəmlərim,
Bir özüm tək əhli-eşqin binəvasın görmədim.

Xeyirxahı olduğum bədxahım oldu aqibət,
Hər kimi məhrəm xəyal etdim, ədasın görmədim.

Eşqdir baqi edən Leyliylə Məcnun namini,
Mən keçən aşiqlərin hərgiz fənasın görmədim.

Vahidi, mən əhli-insafəm, necə gözdən salım?
Başqalar tək mən onun bir iddiasın görmədim.

* * *

Gecə öz istədiyim yar ilə, işrətdə idim,
Sanki bir Adəm idim, guşeyi-cənnətdə idim.

Mən idim, bir də öz istəkli gözəl yarım idi,
Yoxdu əğyar, gər olsaydı, müsibətdə idim.

Badə camın mənə canandı verən məclisdə,
Gör bu hal ilə ol əsnadə nə halətdə idim!

Bütün ətrafımı almışdı gözəllər səf-səf,
Məst ikən yar ilə bir başqa məhəbbətdə idim.

Həsrətin çəkdiyim öz yarım idi saqi olan,
İndi təsvir elə bax, gör nə qiyamətdə idim!

Nə təmənna eyləyirdimsə, müyəssərdi mənə,
Taleyimdən elə zənn etmə, şikayətdə idim.

Vahidəm, eşqü məhəbbətlə cahandan getdim,
Heyf kim, bilmədilər, mən nə təriqətdə idim.

* * *

Bir zaman mən də əsiri-rəhi-meyxanə idim,
Həvəsi-badə ilə aşiqi-peymanə idim.

Bir dəqiqə yerə düşməzdi əlimdən badə,
Gözlərin şövqü ilə öylə ki, məstanə idim.

Bütün ömrüm keçib aləmdə şərab içmək ilə,
Badədən xali olan yerlərə biganə idim.

İndi təklifi-şərab eyləmək artıqdı mənə,
Mən ki, meyxanədə bir xanəsi viranə idim.

Şəmə pərvanə yanırdı gecələr sübhə kimi,
Mən də öz sevgilimin şəminə pərvanə idim.

Çalışırdım, saçının fikri başımdan çıxsın,
Görməsəydim səni bir gün, dəli-divanə idim.

Məni, Vahid, bu pəriçöhrələr etmişdi əsir,
Mən də Məcnun kimi dillərdə bir əfsanə idim.

* * *

Sən olmasan, gözəlim, gülüstanə baxmaz idim,
Çəmən çiçəklərinə aşiqanə baxmaz idim.

Əsiri-zülfün əgər olmasaydım aləmdə,
Cəmalına bu qədər acizanə baxmaz idim.

Mənimlə olsa idin bir dəqiqə ömrümdə,
Cahan bütün gözəl olsa, cahanə baxmaz idim.

Məni fəraqın odu yaxmasaydı şəm kimi,
Görəndə gül üzünü yanə-yanə baxmaz idim.

Fəraqına dözə bilsəydi qan olan könlüm,
Yolunda çəkdiyim ahü fəğanə baxmaz idim.

O gül cəmalına mən aşiq olmasaydım əgər,
Fəğani-bülbülə çox məhrəmanə baxmaz idim.

Nəzakət olmasa, Vahid, təbiətimdə mənim,
O qara gözlərə mən şairanə baxmaz idim.

* * *

Səni mən, ey büti-məhru, özümə aşina derdim,
Xəyali-xam edib, cana, səni əhli-vəfa derdim.

Dolanırdım səri-kuyində, billah, zarü dilxəstə,
Sənin ol xaki-payindən özümə mən şəfa derdim.

Nə rəhmin var, nə insafın, məni bu qədər incitdin,
O şirin ləblərin şəhdin bu dərdimə dəva derdim.

Səni mən rəhmi-dil sandım, ədu oldun məni-zarə,
Ədu olmaqlığın, cana, həmişə bərməla derdim.

Kəməndə ol qara zülfün salıbdır Vahidi-zari,
Cahanda tirəbəxt olmağımı kari-qəza derdim.

* * *

Verməzdim əgər könlümü ol yarə, biləydim,
Yar olmayacaqmış məni-naçarə, biləydim.

Eşqində vətən tərkini etməzdim o mahın,
Qürbətdə günüm eyləyəcək qarə, biləydim.

Vəslində yenə dərdimə bir çarə tapardım,
Hicrində mənə olmayacaq çarə, biləydim.

Hərgiz bu qara günlərə düşməzdim, əzəldən
Bimehr imiş ol dilbəri-məhparə, biləydim.

Vahid, yəqin ölməzdim, o bimehr nigarın
Hicrindən əgər canımı qurtarə biləydim.

* * *

Sənin gözəlliyinin mübtəlasıyam, gözəlim!
O qarə gözlərinin can fədasıyam, gözəlim!

Mənim bu naləmin hər bir könüldə var əsəri.
Şikəstə ney kimi ruhun qəzasıyam, gözəlim!

Kəməndi-zülfüvə məntək əsir olan çoxdur,
Hamıdan acizi, bəxti qərasıyam, gözəlim!

Bəlalı aşiqinəm, baxma qeyrilər sözünə,
Məhəbbət aləminin binəvasıyam, gözəlim!

Elə nə zülm varındır, əgər dilim yansın,
Desəm, cəfalarının narizasıyam, gözəlim!

Yolunda müntəzirəm, can verim görəndə üzün,
Cəfa çəkənlərin əhli-vəfasıyam, gözəlim!

Əgərçi, Vahidəm, əğyarə baş əyən deyiləm,
Fəqət sənin səri-kuyin gədasıyam, gözəlim!

* * *

Xublar söhbəti üşşaqə cəfamış, nə bilim!
Ülfət etmək bu gözəllərlə xətamış, nə bilim!

Günümü tirə qılıb mahiliqalər sitəmi,
Kövkəbi-bəxtim əzəl gündən qəramış, nə bilim!

Qövli-zahidlə qılıb tərki-meyü meyxanə,
Meydə dil nəşəsi, məsciddə nəvamış, nə bilim!

Sandım ol şuxi vəfa əhli, cəfa qıldı mənə,
Xublar adəti üşşaqə cəfamış, nə bilim!

Könlümün mülkünə qıldım o pəri çöhrəni şah,
Vahid, ol şux gəda  oğlu gədamış, nə bilim?!

* * *

Bir gül eşqində könül qan olacaqmış, nə bilim!
Bülbülasa imiş əfqan olacaqmış, nə bilim!

Vəslini sevməz idim, hicr qəmin bilsə idim,
Qismətim axırı hicran olacaqmış, nə bilim!

Bu qədər eşq oduna yanmaz idim aləmdə,
Ciyərim hicrlə suzan olacaqmış, nə bilim!

Xaneyi-könlümü yıxdın bu sitəm daşı ilə,
Mülki-dil bir belə viran olacaqmış, nə bilim!

Yar nəzr etmiş idi, busə verib, canım ala,
O cəfapişə peşiman olacaqmış, nə bilim!

Könlümü xalinə bənd etdi zənəxdan içrə,
Yusifim bəstəyi-zindan olacaqmış, nə bilim!

Vahid, ol mahi-ruxun zülfünə dil verməzdim,
Xatirim böylə pərişan olacaqmış, nə bilim!

* * *

Vurma o qarə tellərinə şanə, sevgilim,
Etmə məni bəlakeşi-divanə, sevgilim.

Yandırdı həsrətin məni, göstər cəmalını,
Könlüm olub o atəşə pərvanə, sevgilim.

Bir dəfə eylədimsə təmənnayi-vəslini,
Yüz dəfə yandım atəşi-hicranə, sevgilim.

Gəzmə rəqib ilə, məni qeyrət həlak edər,
Salma bəlalı aşiqini qanə, sevgilim.

Göstərmə qarə xalını, könlüm fəğan elər,
Quş dən görəndə tez gəlir əfqanə, sevgilim.

Min Leyli görsə hüsnünü Məcnun olub, sənin
Eşqində üz tutardı biyabanə, sevgilim.

İnsafı olsa, çərx bu biçarə Vahidi,
Həsrət qoyarmı sən kimi cananə, sevgilim!

* * *

Könlümü etmiş cəmalın şövqü heyran, sevgilim,
Yox bəşərdə sən kimi istəkli canan, sevgilim.

Hər görəndə gül üzün, doymaz tamaşadan könül,
Olmuşam bülbülsifət eşqində nalan, sevgilim.

Mən məhəbbət mülkünün Məcnunu, sən Leylasısan,
Dərs ala bizdən gərək eşq əhli hər an, sevgilim.

Eşq dərdindən çətin bir dərd yoxmuş dəhrdə,
Çarəsin tapmaz bu dərdin gəlsə Loğman, sevgilim.

Çarə olsaydı, Züleyxadan olardı Yusifə,
Eylədi Vahid kimi pabəndi-zindan, sevgilim.

* * *

Həmişəlik o gözəl yarım olsa mənim,
Yolunda sərf edərəm, hər nə varım olsa mənim.

Bir özgə dilbərə baxsam əgər, gözüm çıxsın,
Mənimlə daim o çeşmi-xumarım olsa mənim.

Yanımda öz gülüm olsa, rəqiblər kimdir?
Xəzan qəmi mənə neylər, baharım olsa mənim?

Bu qarə gözlülərin həsrətin çəkən deyiləm,
Əgər o ahu baxışlı şikarım olsa mənim.

Fəğanə mən gələrəmmi şikəstə bülbül tək,
Çəməndə öz gülümə etibarım olsa mənim?

Çəmən çiçəklərini istəsəm, bəlayə gəlim,
Bu nazənin kimi bir gülüzarım olsa mənim.

Bu tazə qönçələrin mən əsiri olmaz idim,
Əlimdə, Vahid, əgər ixtiyarım olsa mənim.

* * *

Xeyli vaxtdır, ayrılıb məndən o cananım mənim,
Firqətilə gündə min dəfə çıxar canım mənim.

Ağlaram mən bülbüli-şeyda kimi şamü səhər,
Soldurub badi-xəzan baği-gülüstanım mənim.

Çün olub Məcnunsifət, məskən mənə kuyi-nigar,
Çulğayıb dünyanı yeksər ahü əfqanım mənim.

Razıyam, xəncər qaşıyla yarım öldürsün məni,
Qoy tökülsün yar əliylə, dəhrdə qanım mənim.

Zülfi-pürxəmtək olubdur qamətim xəm müttəsil,
Var səcudi-xakə, rahi-yarə pişanım mənim.

Vahida, gəlmə fəqanə, yoxdur eşqin çarəsi,
Nalə eylər eşqdən, qəlbi-pərişanım mənim.

* * *

Ey gözəllik Kəbəsi, sən qibləgahimsən mənim,
Mən gədayi-eşqinəm, sən padişahimsən mənim.

Özgə bir cananə cövründən şikayət etmərəm,
Hər cəfa etsən yenə, öz dadi-xahimsən mənim.

Can verib, ya canım alsan, ixtiyarım səndədir,
Acizəm qarşında, guya ki, allahımsan mənim.

Zülfi-rüxsarın əsiri mahə salmaz mehrini,
Sən buludlardan çıxan bir məhru mahimsən mənim.

Seyr qılmış könlümü naz ilə məhzun gözlərin,
Müşki-ənbər tirəli ahu nigahimsən mənim.

Mən bu fəqrimlə sənin eşqində fəxr etsəm nolar?
Dövlətim, fəxrim, pənahim, izzü cahimsən mənim.

Vahidəm, cana, fərəhdən yüksələrdim göylərə,
Lütf edib bir dəm desən kim, xaki-rahimsən mənim.

* * *

Gəl gör, ey bülbül, bu gülşəndə nə halım var mənim,
Bir güli-rənayə bənd olmaq xəyalım var mənim!

Mən necə eşq aləmindən əl çəkim, səbr eyləyim,
Naz ilə min can alan bir məhcəmalım var mənim?!

Aşiqə naz eyləyir, neyçin rəqibə yar olur?
Yarıma yetsə əlim, ondan sualım var mənim.

Ruzigarım qoy qaralsın o qara zülfün kimi,
Fəxr edib mən də deyəm, cahü cəlalım var mənim.

Çox da Yusif öz Züleyxasın görüb fəxr etməsin,
Qoy gəlib görsün, necə qaşı hilalım var mənim!

Vahida, fəxrlə hər gün söylə sən öz yarına:
Sevgili, istəkli bir əhli-kamalım var mənim!

* * *

Hicrin yetirdi aşiqini canə, dilbərim,
Canlar fədadı sən kimi cananə, dilbərim.

Çoxdandır, həsrətəm sənin ol məh cəmalinə,
Gəlləm qəmindən hər gecə əfqanə, dilbərim.

Hərdəm düşəndə yadimə ol qönçə ləblərin,
Billah, dönür bu qəmli könül qanə, dilbərim.

Eşqin salıbdı boynuma zənciri-zülfünü,
Ollam bu rahi-eşqdə divanə, dilbərim.

Yandım şərari-atəşi-eşqində ruzü şəb,
Oldum o nari-eşqinə pərvanə, dilbərim.

Müddətdi, təşnəyəm sənin o ləli-nabinə,
Bir busə lütf qıl məni-ətşanə, dilbərim.

Vahid nə qədər səbr eləsin dərdi-eşqinə?
Billah, gəlibdi hicrin ilə canə, dilbərim.

* * *

Bilməm, nə oldu, qoydu məni, getdi dilbərim,
Ağlar göz ilə aşiqi tərk etdi dilbərim.

Yüz il də ömr qılsam, onu mən unutmaram,
Gülzari-vəslinə məni öyrətdi dilbərim.

Onsuz bu qürbət ölkə cəhənnəm keçir mənə.
Sanki bu xəstə könlümə cənnətdi dilbərim.

Sevdalı könlümü necə bəs sakit eyləyim,
Bimari-eşqə əsl şəfahətdi dilbərim.

Bir istifadə etmədin, ey qan olan könül,
Rahi-vusalə yetməyə fürsətdi dilbərim.

Aləm vəfası olmayana nifrət eyləyir,
Sən gəl vəfasız olma, pis adətdi, dilbərim!

Var bir ümid, bir də görəm gül cəmalını,
Axır vəfalı aşiqə qismətdi dilbərim.

Vahid, qanım qaraldı düşərkən xəyalıma,
Bir ayrı nazənindi, qiyamətdi dilbərim!

* * *

Mən istərəm, bu naməni canana göndərim,
Canım fədası olduğu bir canə göndərim.

Dərdi-fəraq ilə o yanır indi şəmtək,
Mən könlümün quşun ona pərvanə göndərim.

Mən də o gül xəyalı ilə dərdə düşmüşəm,
Yarəb, bu dərdi mən necə Loğmanə göndərim?

Çoxdan gülündən ayrı düşən dərdli bülbülü
Bir kimsə tapmadım ki, gülüstanə göndərim.

Vahid, unutma həzrəti-Yusif hekayətin,
Fikrimdə var, bu şerimi zindanə göndərim.

* * *

Sənsiz səmadə olsa mələklərlə ülfətim,
Yetməm murada, onlara gər olsa rəğbətim.

Mehri-rüxünlə bağı-həyatım səfalənir,
Ah eylərəmmi, vəslin əgər olsa qismətim.

İncitsə firqətin məni, səbrim tükənsə də,
Şövqi-rüxünlə vəslinə artar məhəbbətim.

Sənsiz ənisim huri ola, mail olmaram,
Rahi-vəfadən hərgiz əyilməz təbiətim.

Afətmi, nəşəmi, nə bilim sirri-eşqimi?
Fəth eyləmiş bu könlüm evin, yox fərağətim.

Olmaz bəşərdə sən kimi bir nazənin nigar,
Hurimisən, mələkmisən, ey nazlı afətim?

Vahid, həmişə xəlqimizin xeyrxahiyəm,
Getdikcə günbəgün çoxalır qədrü qiymətim.

* * *

Mən o şuxə güli-rəna deməyim, bəs nə deyim?
Aşiqə bülbüli-şeyda deməyim, bəs nə deyim?

Min gözəl görsə gözüm, bir kərə doymaz könlüm,
Bu kiçik qətrəyə dərya deməyim, bəs nə deyim?

Mən əgər eşqdə Məcnun deyiləm, bəs nəçiyəm?
Sevdiyim dilbərə Leyla deməyim, bəs nə deyim?

Çırpınır quş kimi hər zülfünü gördükcə könül,
Mən bu divanəyə rüsva deməyim, bəs nə deyim?

Gözlərin həsrətini çəkməyən aşiq yoxdur,
Sənə mən afəti-dünya deməyim, bəs nə deyim?

Bu şirinlik, bu lətafət ki, sənin var, gözəlim!
Sənə güldən də mən əla deməyim, bəs nə deyim?

Eşqdən bir bu qədər söyləmək olmaz, Vahid,
Mən bu məcnunluğa sevda deməyim, bəs nə deyim?

* * *

Bir sən kimi vəfasız olan yarə neyləyim,
Canan ki verdi könlünü əğyarə, neyləyim?!

Bülbül təki yolunda sənin mübtəla mənəm,
Bir gül ki həmdəm ola xarə, neyləyim?!

Eşqində daima bu bəlalər çəkən könül
İndisə tapmayır özünə çarə, neyləyim?!

Eşq atəşinə yanmışam, imdadə gəlmədin,
Pərvanə vurmasın özünü narə, neyləyim?!

Məcnun edən məni yarın cəmalıdır,
Eşq aləmində oldu günüm qarə, neyləyim?!

Vahid, məhəbbətin bu qədər ki, bəlası var,
Yoxdur deyən dərdimi dildarə, neyləyim?!

* * *

Yayıldı sevgimiz, ey şux, hər diyarə bizim,
Bütün məhəbbətimiz çıxdı aşikarə bizim.

Gülüzlü şux gözəllərlə ölkəmiz bəzənib,
Nə ehtiyacımız indi yeni baharə bizim?

Fərəhli yurdumuzun nazənin sənəmlərinin
Ayaqlarından öpür ay, günəş, sitarə bizim.

Bizi sevindirən ancaq vətən məhəbbətidir,
Yox eşqimiz bu gözəl ölkədən kənarə bizim.

Vətən çiçəklərinin biz sevimli bülbülüyük,
Nə meylimiz gülə vardır, nə laləzarə bizim.

Olaydı kaş elə bir əhli-hal dünyadə,
Bütün bu sevgimizi söyləyəydi yarə bizim.

Bu arzudayıq hər gün böyük təbiətdən
Yüz il də ömrümüzü artıra dübarə bizim.

Zəmanə get-gedə, Vahid, dönüb behişt olacaq,
Neçün ki, qüdrətimiz var hər iqtidarə bizim.

* * *

Sandım vəfalı, hər gülə ümmid bağladım,
Axır vəfası olmadı, dərdimdən ağladım.

Bir cümlə tapmadım ki, ola eşqdən gözəl,
Tarixi – hər səhifəni açdım, varaqladım.

Dünyanın eyşü nuşuna aludə olmadım,
Gülgün şərabı atdım əlimdən, ayaqladım.

Divanələrtək olmadı həmraz olan mənə,
Qəm guşəsində nalə çəkib, diz qucaqladım.

Bir lalə üzlü, fitnə baxışlı, şəkər ləbin
Fərhadı oldum, eşqi ilə sinə dağladım.

Bildim gilayə eyləcək dilbərim mənə,
Fürsətdən istifadə edib mən qabaqladım.

Vahid! O kimsələr ki, gülüstani-şerdən
Gül dərdi getdi, xarü xəsin mən alaqladım.

* * *

Ey gül, nə oldu ki, sənə həmdəm mən olmadım?
Biganə oldu vəslinə məhrəm, mən olmadım?

Min cənnət ilə bir  qara xalı dəyişmərəm,
Baği-behiştdə yaxşı ki, Adəm mən olmadım!

Varım-yoxum nə olsa, verərdim gözəllərə,
Xilqətdə başqa sirr var, Hatəm mən olmadım.

Meyxanələrdə keçdi həyatım səfa ilə,
Şadəm, riyayi-zövqdə bir dəm mən olmadım.

Cami-Cəmin şərabə verərdim xəzinəsin,
Cəmşidə xidmət etmək üçün cəm mən olmadım.

Şövqi-məhəbbətə düşənin min bəlası var,
Səd şükr, özgə zövqə müsəlləm mən olmadım!

Vahid, rəqib xürrəm olub vəsli-yar ilə,
Hicran əsirisən, demə, xürrəm mən olmadım.

* * *

Gördüm əğyar ilə, ey gül, səni, heyran qaldım,
Gözlərin fikrini etdikcə, pərişan qaldım.

Oldular özgələr eşqində bütün xatircəm,
Bircə mən həsrəti-zülfünlə nigaran qaldım.

Kamə yetdi çəməni-vəslin ilə biganə,
Yenə mən bülbüli-şeyda kimi nalan qaldım.

Şəmi-rüxsarın odu eylədi pərvanə məni,
Gecələr sübhədək atəşlərə suzan qaldım.

Şadəm ondan-hələ bir dinə müqəyyəd deyiləm,
Mən bu aləmdə nə kafər, nə müsəlman qaldım.

Sevdiyim dilbərə hər barədə sadiq çıxdım,
Doğruluqla vətənə, xalqa nigəhban qaldım.

Eşqə sərf eyləmişəm, hər nə mətaim var idi,
İndi tən eyləmə, Vahid, niyə üryan qaldım.

* * *

Yetişdi qeyri aşiqlər vüsali-yarə, mən qaldım,
Xəlayiq çarə tapdı dərdinə, biçarə mən qaldım.

Hərə öz sevdiyi məşuqəsilə şadkam oldu,
Yanan pərvanələrtək ruzü şəb odlarə mən qaldım.

Rəqibi-bimürüvvətlər fərəhnak oldu aləmdə,
Həmişə zari-həsrət türreyi-dildarə mən qaldım.

Keçirtdim tiri-nazın sinədən hər mahi-rüxsarın,
Yenə bimehr çıxdı, təneyi-əğyarə mən qaldım.

Zəmani-ömrdə bir gül yetirdim, zəhmətin çəkdim,
Səfasın özgələr gördü, cəfayi-xarə mən qaldım.

Bütün divanələr, Vahid, kəməndindən xilas oldu,
Yenə ol zülfə bağlı ruzü şəb avarə mən qaldım.

* * *

"Yarımı bağçada qəm-qüssəyə batmış sandım,
Xəbər aldım ki, nə var, dinmədi, yatmış sandım".[1]

Sinəsində nəzərim dəydi iki qönçə gülə,
Tər şəmamə yetişib, baş-başa çatmış sandım.

Mən gördükdə qızarmışdı üzü lalə kimi,
Dişləyib gül üzünü özgə qızartmış sandım.

Elə bir naz ilə oynatdı kəc əbrulərini,
İki hindubeçə şəmşirə əl atmış sandım.

Əmdim ol ləli-ləbindən, demə, öz rəngi imiş,
Saxta bir rənglə əvvəlcə boyatmış sandım.

[1] Beyt Qəşəm Məmmədzadənindir

Vahidəm, yar mənimdir, mən onun, xalqa nə var,
Özüm əğyarə onu ülfəti qatmış sandım.

* * *

Dedim, əğyar ilə gəzmə, sənə çox yalvardım,
İndi dincəl, gözəlim, mən də ölüb qurtardım.

Bir sədaqətli gözəl tapmadım aləmdə, qərəz,
Bu az ömrümdə çox ətrafı gəzib axtardım.

Can hanı məndə, məni eşqdir indi yaşadan,
Onu canan mənə vermişdi, yenə qaytardım.

Könlüm aldatdı məni hüsnünə məhparələrin,
Sanmayın, mən bu vəfasızlara bel bağlardım.

Fələkin qəddi bükülmüşsə, mən ondan qocayam,
Onda ki, yoxdu nə dünya, nə fələk, mən vardım!

Səni mən istədiyim günlər ölürdüm sənsiz,
Eşqimin sirrini könlümdə nihan saxlardım.

Vahidəm, eşqdə mən indi də sabitqədəməm,
Varam öz yarım ilə mçn necə əvvəl vardım.

* * *

Olsaydı müyəssər, gözəlim, yarın olardım,
Hər ləhzə qəmin çəkməyə qəmxarın olardım.

Hər şəb dolanıb sübhə kimi şəmcəmalın,
Pərvanə kimi, talibi-didarın olardım.

Mümkün ki deyil, bir də gəzim gülşəni-kuyin,
Mümkün gər olaydı, yenə zəvvarın olardım.

Ey tutivəşim, ayineyi-hüsnünü görcək,
Aludeyi-ol ləli-şəkərbarın olardım.

Məcnun kimi daim, səri-kuyində gəzərdim,
Ömrüm nə qədər varsa pərəstarın olardım.

Yusif kimi versəydilər didarına qiymət,
Can nəqdi ilə mən də xiridarın olardım.

Vahid, səri-kuyində gəzərdim gecə-gündüz,
Ey məh, bu əda ilə diləfkarın olardım.

* * *

Mən, sevgilim, eşqində gərək bülbül olaydım!
Mərmər sinən üstündə qızıl bir gül olaydım!

Zülfüntək uzandıqca öpəydim ayağından,
Sən seyrə çıxan yerdə dönüb sünbül olaydım!

Əmdikcə o gül ləblərini nəşələnəydim,
Sərməst gözüntək gecə-gündüz lül olaydım!

Əğyar ilə hər gün səni bir yerdə görüncə,
Hicran oduna kaş yanaydım, kül olaydım!

Vahid, mənə çoxdan bu can ağırlıq edirdi,
Ey kaş, onu da yarə verib yüngül olaydım!

* * *

Əzizim, sevgilim, nazlı nigarım,
Züleyxadan gözəl istəkli yarım.

İnanmaz könlüm hər canana sənsiz,
Zamanə əhlinə yox etibarım.

Əgər sən qönçə gülsən, mən də bülbül,
Məhəbbətdir mənim bağü baharım.

Əsirəm bir sənin eşqinlə ancaq,
Nəhayətsiz deyildir qəlbi-zarım.

İtirmə, şerimi saxla həmişə
Ki, qalsın səndə, Vahid, yadigarım.

* * *

Dedim ki, bir neçə söz yari-məhcamalə yazım,
Dəyişdim hicr qəmin ləzzəti-vüsalə yazım,

Şərabi-eşq ilə hər dəqiqə sərməstəm,
Bu zövqdən yaza bilsəm, neçə piyalə yazım?

Şərabı çox içirəm, bəlkə möhnətim azala,
Olanda məst bu halı bir əhli-halə yazım.

Fələk məni elə tənha qoyub ki, qorxum odur,
Bu ömrümün günəşi tez gedə zəvalə, yazım.

Könüldə ahım odu, göz yaşım axır daim,
Birini suzişi-həsrət, birin şəlalə yazım.

Xəyal içində özüm qalmışam tərəddüddə,
Xəyalə qərqəm əcəb, hansı bir xəyalə yazım?

Xəyaldən yenə, Vahid, təsəlli tapmaq olur,
Neçin fərəh yerinə daim ahü nalə yazım?

* * *

Tənuri-atəşi-eşqində yandım, dilkabab oldum,
İlantək qıvrılıb zülfündən ayrı piçtab oldum.

Pərişan zülfünə bağlandı könlüm cəmikən, ey məh,
Olub aşüftə könlüm gör necə xanəxərab oldum!

Görüb ləli-ləbin rəngin meyi-əhmarə meyl etdim,
Şərabü şərbəti-ləlin içib, məsti-şərab oldum.
Olubdur məhrəmi kuyin rəqibi-divvü surətlər,
Nədəndir, cənnəti-eşqində mən əhli-əzab oldum.

Dedim, vəslə yetən əyyami kami-dil olur hasil,
Vüsalın firqət oldu, bəh nə yaxşı kamiyab oldum?!

Tökübsən xəncəri-müjgan ilə qanımı, ey zalım,
Tərəhhüm eylə, sərtasər bu rəng ilə xəzab oldum.

Təriqi-şeri öyrəndim cahanda piri-Vaqifdən,[1]
Əcəb həngamədir, Vahid ki, mən hazırcavab oldum.

* * *

Ləbin şövqilə, ey gül, maili-cami-şərab oldum,
Olub məsti-meyi-eşqin, əcəb xanəxərab oldum!

Deyildim vaqifi-ayati-qüdrət, şahim, ondan kim,
Bihəmdillah, görüb xəttü ruxin əhli-kitab oldum.

Çəkib tiğin dəmadəm, tökmə qanım qəhr ilə, rəhm et,
Yetər bunca mən öz qanimlə, ey zalım, xizab oldum.

Nə öldüm qutardım birdəfəlik ənduhi-hicrindən,
Nə də bir öylə cami-vəslin ilə kamiyab oldum.

Deyildim dərdi-eşqinlə mükəddər kim, bu rövşəndir,
Odur qəm ki, qara zülfün qəmindən piçtab oldum.

Gözüm yaşilə təskin vermədin bir ləhzə kuyində,
Tutuşdum, atəşi-eşqində yandım, dilkəbab oldum.

---

[1] Şair Mirzə Əbülhəsən Vaqif

Yetişdim cənnəti-vəslinə ol hurivəşin, Vahid,
Cəhənnəmdən qurtardım, eylə bil, əhli-səvab oldum.

* * *

Dün dilbərimi məclisi-meyxanədə gördüm,
Əksi-rüxi-cananımı peymanədə gördüm.

Yandırdı məni şəmcəmalilə nigarım,
Bu yanmağı nə şəm, nə pərvanədə gördüm.

Qıldım nəzər ol şuxun iki çeşminə nagəh,
Min fitnə mən ol nərgisi-məstanədə gördüm.

Məşşatə vurub türreyi-dildarıma şanə,
Aşüftəliyim zülflə həm, şanədə gördüm.

Əğyarə qılır lütf, mənə cövrü cəfasın
Daim o məhin meylini biganədə gördüm.

Gəl söyləmə, zahid, mənə övsafi-behişti,
Cənnət çiçəyin mən rüxi-cananədə gördüm.

Şuxluqla o şuxə nə dedim, incidi məndən,
Vahidi müqəssir, de ki, aya, nədə gördüm?

* * *

Həmişə yari-bimehri rəqibə mehriban gördüm,
Vəfa tərkin qılıb, zülmü gözəllərdə əyan gördüm.

Dolandım vadiyi-eşq içrə bir Leyli sorağında,
Özüm tək eşqdə Məcnuni-zari laməkan gördüm.

Həmişə kəc inad ilə dolanır çərxi-kəcrəftar,
Cəfavü cövrdən üşşaqlər qəddin kaman gördüm.

Düşüb sevdayi-zülfi-yarə oldumsa xiridarı,
Bu sevdadən məni – bəxti qara daim ziyan gördüm.

Gəlib tüti kimi göftarə, yarım mehriban olmuş,
Bihəmdillah, mənimlə ol gülü şirinzəban gördüm.

Ləbindən ayrı düşdükdə, nigara, qəlbi-üşşaqi,
Xəyali-qönçeyi-ləbi-səlindən xunfəşan gördüm.

Cahanda görmədim, Vahid, gözəllərdən vəfa hərgiz,
Gözəllər nazü rəftarın həmişə canalan gördüm.

* * *

Sən naz ilə bir söz dedin, ey can, başa düşdüm,
Əğyarə olan meylini pünhan başa düşdüm.

Qəlbində nələr var, onu biganə düşünməz,
Görcək səni, ey sevgili canan başa düşdüm.

Məcnun edən eşq əhlini kimdir, nə bilirdim,
Zülfün ki səhər oldu pərişan, başa düşdüm.

Gördükdə zənəxdanını bildim ki, o Yusif
Olmuş nə üçün layiqi-zindan, başa düşdüm.

Dərdi qəmi-hicranə çətinlik yeri yoxmuş,
Bu müşkülü gülmək qılır asan, başa düşdüm.

Gülüzlü gözəl bir sənəmin oldum əsiri,
Bülbül ki, edir naləvü əfğan, başa düşdüm.

Sordum, sağalan dərd deyil eşq bəlası,
Ölməkdir onun çarəsi, asan başa düşdüm.

Vahid, əgər ümmidi-vüsal eyləməsəydim,
Yıxmışdı məni möhnətü hicran, başa düşdüm.

* * *

Yox deyən dərdimi cananıma, gözdən düşdüm,
Saldı hicran odunu canıma, gözdən düşdüm.

Mən bu gül üzlülərin bülbüli-şeydası idim,
Biri rəhm etmədi əfğanıma, gözdən düşdüm.

Çox qara gözlülərin zülfünə həsrət çəkdim,
Yanmadı hali-pərişanıma, gözdən düşdüm.

Ağladım hicrinə, biganəni güldürdü mənə,
Baxmadı dideyi-giryanıma, gözdən düşdüm.

Neyləmişdim, günahım, bilmədim, axır nə idi.
Həsrət oldum güli-xəndanıma, gözdən düşdüm.

Hər təbibə qəmi-pünhanımı izhar etdim,
Çarə yoxmuş qəmi-pünhanıma, gözdən düşdüm.

Yar dindirmədi, Vahid, məni, yalqız qaldım,
Nə gələn var, nə gedən yanıma, gözdən düşdüm.

* * *

Cavanlıq eşqinə düşmüş mənim bu pir olan könlüm,
Dəmadəm nazəninlərdən vurur dəm natəvan könlüm.

Dolanmış natəvanlıq dövrünü Xurşidi-ənvərtək,
Çıxıbdır pirilik dövründən, olmuşdur cavan könlüm.

Bahar əyyamıdır, hala, vətən bir laləzar olmuş,
Görərkən öz gülün bülbül kimi eylər fəğan könlüm.

Ədibə, şairə, rəssamə çox qiymət verir ellər,
Məhəbbət zövqünü duyduqca olmuş şadiman könlüm.

Yanır pərvanələr şəmin əgər sevdayi-eşqilə,
Dolan sən yar şövqilə olub pərvanə, yan, könlüm.

İnanmır neyləyim, Vahid, mənə istəkli cananım,
Ona göstərsə, əlbəttə, özün bir gün yanan könlüm.

* * *

O qarə zülfün əlindən bəlalıdır könlüm,
Batıb qəmə, elə bil ki, əzalıdır könlüm.

Bu eşq aləminin bilmirəm nədir sirri,
Əsiri-eşq olalı laübalıdır könlüm.

Görəndə sevgilisin qönçə gül kimi qızarır,
Ədəbli bir qıza bənzər, həyalıdır könlüm.

Ölüncə çəkməz əlin nazənin nigarından,
Rəqibə hərgiz inanmaz, vəfalıdır könlüm.

Fələk o zülmü mənə etməyib, rəqib etdi,
Yazılsa dərdü qəmim, macəralıdır könlüm.

Şikəstə ney kimi yarından ayrılan gündən,
Nəvayə həmdəm olub, san yaralıdır könlüm.

Mənim də dərdimi, Vahid, deməzsən ol şuxə,
Deyəndə qanə dönər, iddialıdır könlüm.

* * *

Getmə bu naz ilə, gözəlim, bir dayan görüm!
Eşqində mən yanan kimi, bir sən də yan görüm!

Dərd öldürər məni, səni gər bir də, sevgilim,
Xain rəqiblərlə gülüb-oynayan görüm!

Çeşmi-zəmanədən sənə afət toxunmasın,
Daim o qarə zülfü göz üstündə yan görüm!

Nə lalə bitməsin, nə də sünbül, sən olmasan,
Nə şaxi-güldə bülbül üçün aşiyan görüm!

Məstanə gözlərin kimi sən məstsən hələ,
Çox yatma naz ilə, gözəlim, bir oyan görüm!

Vahid! Cahanda hər gözəlin düşsəm eşqinə,
Bir xeyir görməsəm də, gərək min ziyan görüm!

* * *

Kami-dil almadı dil ol mələki simadan,
Əlqərəz kim, bizi bifeyz elədi röyadan.

Hərçi cəhd etdim, o ahuvəşi bir damə salım,
Düşmədi damə, fərar etdi məni-rüsvadan.

Daməni-vəslini tutdum, nə qədər icz elədim,
Olmadı kam müyəssər o güli-rənadan.

Oxuyub məshəfi-hüsnün o şəhin, qaldım mat,
Bixəbər vaqif olammaz, vəli hər mənadan.

O qədər cövr elədi Vahidə yar, tanrı bilir,
Çəkməyib bunca cəfa Qeysi-həzin Leyladan.

* * *

Bir büti-qönçə ləbin hicri edib bağrımı qan,
Eylərəm bülbüli-şuridə kimi ahü fəğan.

Ağlamaq adət olubdur mənə hər şamü səhər,
Dili-zarimdən odur kim, kəsilib tabü təvan.

Kimə izhar elədim dərdi-dilim, ah, nə deyim,
Tapmadım eşqə əlac, ağlaram izhari-nihan.

Yandırıb aləmi ahım şərari sərtasər,
Ağlamır naleyi-zarimə mənim külli-cahan.

Taği-əbrulərinə səcdə edəndə yarın,
Tükənib tabü təvan sərvi-qəddim oldu kaman.

Eşq səhrasına, ey dil, qoya hər kimsə qədəm,
Eləməz Vahidi-sərraf kimi onda ziyan.

* * *

Ey yıxan könlüm evin, qıl həzər əfğanımdan!
Evin abad ola, əl çək dili-viranımdan.

Məni Məcnun ilə Fərhadə bərabər tutma,
Mən olardan da hünərlə keçənəm canımdan.

Bircə gəl gör nə cəfalar çəkirəm zülfündən,
Xəbərin yoxdu sənin hali-pərişanımdan.

Tən edir el mənə: "yarın nə vəfasız çıxdı"?
Ey vəfasız, demirəm mən bunu öz yanımdan.

Sanki başdan-başa bir şöleyi-eşqəm? gecələr
Şəmlər odlanır ahi-dili-suzanımdan.

Neylərəm mən gülü, ya laləni, insafım var,
Onların hansı gözəldir rüxi-cananımdan?

Vətənimdə necə mən istəməyim bir gülükim,
Canı cammla bir olsun, qanı da qanımdan.

Vahidəm, əsrimizin indiki Fərhadı mənəm!
Kim məni ayrı salar Xosrovi-xubanımdan?

* * *

Cuş edib seyli-qəm, əzbəs ki, aşıb başımdan,
Ol ki, vaqifdi, bilər halımı göz yaşımdan.

Bu təmənna ilə həsrət çəkirəm peyvəstə
Ki, yetə sinəmə bir tir o kaman qaşından.

Saqi sərməst qılıbdır bir əyaq ilə məni,
Nola hər saət aşarsa ayağım başımdan?

Cismi-suzanımın istər ki, çəkə təvsirin,
Dəmbədəm od tökülür xameyi-nəqqaşımdan.

Çeşmi-məstin nola qanım töküb hər ləhzə mənim,
Həzər etməzmi əcəb dideyi-xunpaşımdan?

Tinətim xaki-məhəbbət ilə təxmir olunub,
Bitər ülfət gülü, ölsəm də məzar daşımdan.

Vahida, mehrü vəfa umma bu məhrulərdən,
Xubrulərdə vəfa görməmişəm yaşımdan.

* * *

Vəfasızdır, könül, hər kim əsirgər canı canandan,
Gərək canan yolunda keçsin aşiq şövqlə candan.

Mənim canan xəyalı xatirimdən çıxmaz ölsəm də,
Unutmaz öz gülün bülbül, cüda düşsə gülüstandan.

Bərabərdir məhəbbət aləmində Leyli Məcnunla,
Nə Məcnun Leylidən dönməz, nə Leyli ayrılar ondan.

Mənim də sevgilim gözlər məni, hicranə səbr eylər,
Ümidi-vəsl edən aşiq darıxmaz dərdi-hicrandan.

Gərəkdir bülbülün gül də cəfasın çəksin eşq içrə,
Nə oğlan qızdan artıqdır, nə qız əksikdir oğlandan.

Yüz il qürbətdə can versəm, yenə Məcnun olan könlüm
Vəfadan əl götürməz, dönməz ol zülfi-pərişandan.

Məzarım daşına ellər məni "namərd" deyib yazsın,
Vətən uğrunda intiqam almasam mərdtək düşmandan.

Əgər min canım olsa, bir vəfalı yarə qurbandır,
İgidlər mərd olur, namərd qorxar bir ovuc qandan.

Gedib cananıma, Vahid, xəbər ver: öldü xainlər!
Özüm də sağ-salamat çıxmışam bu qanlı meydandan.

* * *

Çıx, ey qaniçən yırtıcı, çıx torpağımızdan!
Xain gözünü çək dərəmizdən, dağımızdan!

Qartal kimi qonnuq döşünə, qorx o günündən:
Qurtarmaz o murdar cəsədin caynağımızdan.

Biz hiyləyə aldanmarıq, ey tülküdən alçaq,
Burnun bu yaxında əzilər toxmağımızdan.

Bir bomba kimi partlayacaqdır ürəyində,
Hər xırda qığılcım ki, qopur çaxmağımızdan.

Qəsb eylədiyin yerləri tez qaytararıq biz,
Boş yel kimi çox keçmə bizim sol-sağımızdan.

Xalq ordusu bir dağ kimi durmuş sənə qarşı,
Seltək axacaqdır qanınız qurşağınızdan.

Çox çəkməyəcək, məhv olacaq zülmü faşizmin,
Dünya çıxacaq xoş günə al bayrağımızdan!

* * *

Sevdiyin yarın əlindən tutasan, cam alasan,
Öpəsən ləblərin, o naz edə, sən kam alasan.

Mübtəlası olasan bir gülərüzlü gözəlin,
Hər səhər küsdürəsən, könlünü axşam alasan.

Şairanə nə səadətli gözəl mənzərədir;
Baxıb öz istədiyin dilbərə, ilham alasan.

Şövqi-ləli yetər eşq əhlinə gülçöhrələrin,
Nə gərək saqi əlindən meyi-gülfam alasan.

Ya verib can vətən uğrunda, hünər göstərəsən,
Ya olub eşq əsiri, belə bir nam alasan.

Ovçu görmüş quşu səyyad çətinliklə tutar,
Sadədil bir elə quş tap ki, onu ram alasan.

Bir gözəl varmı ki, naz eyləməyindən başqa
Yerişindən, duruşundan baxıb ilham alasan.

Bəsdir, ey xəstə könül, hicr bəlasın çəkdin,
Sən gərək vəslə yetib, bir qədər aram olasan.

Vahid, ənam edəcək yarım öz aşiqlərinə,
Bəlkə bir lütfə gəlib, sən də bir ənam alasan.

* * *

Sən, sevgilim, bu hüsn ilə ellər nigarısan!
Odlar diyarının gözəli-şəhiryarısan!

İlham alır camalını gördükdə el sənin,
Xəlqin sevimlisi, vətənin iftixarısan!

Diz çöksə haqlıdır sənə dünya gözəlləri,
Babəklərin, Koroğluların yadigarısan!

Bülbül səninlə şurə gəlir, gül səfalanır,
Sən bir həyat gülşəninin novbaharısan!

Bilməm, nə sirdir, hamının eşqi var sənə,
Xilqətdə sən zəmanəmizin bəxtiyarısan!

Tarixə bax, gözəllər olub hər zəmanədə,
Sən də bizim zəmanəmizin gülüzarısan!

Vahid, bu qarə gözlü yaman məst edib səni,
Aləm ayıldı, sən hələ eşqin xumarısan!

* * *

Söylə, ey gül, hansı bağın sən güli-rənasısan?
Hansı gülzari-behiştin sərvisən, tubasısan?

Açma zülfün, ətrlə bihuş edərsən aləmi,
Çünki sən dəşti-Xətanın ənbəri-sarasısan.

Nazənin canan, gözəllər qarşı durmaz ruyinə,
Cümləsindən sən gözəlsən, hamının əlasısan.

Bağbanın kimlər olmuş? Gözlərin heyranıyam,
Sən məgər gülzari-hüsnün nərgizi-şəhlasısan?

Görməyincə gül üzün, cismimdə qalmaz taqətim,
Ruhusan, guya, bu miskin aşiqin əzasısan.

Mən kimi minlərcə məcnunlar əsirindir sənin,
Söylə, yarım, doğru söylə, sən kimin Leylasısan?

İnciməz, Vahid, o gül ahü fəğanından sənin,
Sən gözəllər bağının bir bülbüli-şeydasısan.

* * *

Sevgilim! Seyri-gülüstan yaxşıdr, sən yaxşısan?
Aşiqinçün başqa canan yaxşıdır, sən yaxşısan?

Min mənimtək aşiqi heyrətdə qoymuş gözlərin,
Sevgilim, bir şöylə ceyran yaxşıdır, sən yaxşısan?

Bir dönüb baxmaqla tez aldın, apardın könlümü,
Ovlayıb çalmaqda tərlan yaxşıdır, sən yaxşısan?

Göy üzünü ay rövşən etmiş, hüsn ilə sən yer üzün,
Nazəninim, mahi-taban yaxşıdır, sən yaxşısan?

Sən kimi canan üçün candan keçən bir aşiqə,
Ey gözəllik tanrısı, can yaxşıdır, sən yaxşısan?

Səndə varkən naz ilə gülmək, danışmaq, incəlik,
Lütfdə gül bərgi-xəndan yaxşıdır, sən yaxşısan?

Məclisin xəlvət, nigarın saqi, Vahid, əldə mey;
Gör bu xoş aləmdə sultan yaxşıdır, sən yaxşısan?

* * *

Bilsən, gözəlim, sən nə qədər sevgili cansan!
Zülm eyləmə, qoy söyləməsinlər, can alansan.

Soldurma o gül çöhrəni, aldanma rəqibə,
Öz qədrini, bil ki, nə qədər indi cavansan.

Əğyarə inanma, gözəlim, qorxuram ondan,
Çox sadəsən, hər söz ki, deyirlər, inanansan.

Güldən də, çiçəkdən də, günəşdən də gözəlsən,
Sən baği-məlahət yetirən sərvi-rəvansan!

Gördüm, yenə min naz ilə biganəyə baxdın,
Çox şübhəyə saldın məni, bildim nigəransan.

Gör bir nə gözəllikdə yetirmiş səni tale,
Həsrət çəkir aləm sənə, məşhuri-cahansan.

Vahid, bu qədər səndə ki, var eşq-məhəbbət,
Dünya qocalıb getsə, çətin sən qocalansan.

* * *

Ey qönçədəhən, naz eləmə, evmi yıxarsan!
Əndami-lətifin günə vermə, soluxarsan.

Cövr etmək ilə aşiqi-bikəslərə, zalim,
Fikr eyləmə ki, axiri bir yanə çıxarsan!

Qoyma, gülüm, əğyarı ola vəslinə məhrəm,
Nazikdir o incə bədənin, tez sınıxarsan.

Bir yol bizim ətrafə də hərlən, güzər eylə,
Yalqız, gözəlim, evdə oturma, darıxarsan.

Qan oldumu, ol gül üzünü istədim öpmək?
Nazikdi dedin, qəlbimi incitmə, sıxarsan.

Vahid, düşün, öz qədrini, çox olma meyalud,
Axır rəhi-meyxanədə bir gün buyuxarsan.

* * *

Ey tökən naz ilə qanım, həzər et qanimdən,
Tökmə qanımı, sakın ah ilə əfqanimdən.

Tiri-əbrulərinə aşiqi-biçarə fəda,
Mən rəhi-eşqdə, cana, keçənəm canimdən.

Çünki amadə durub qətlimə ol tiri-müjən,
Yoxdu qorxum, dəyə gər çaki-giribanimdən.

Gün camalındı salan rövşəni bu dünyayə,
Ya ki, ahimdi çıxan sineyi-suzanimdən.

Bilməz ovsafini vaiz, nə qədər vəsf eləsə,
Əhli-hal olsa, bilər qəlbi-pərişanimdən.

Dilbəra, Vahidi-nalanı vüsalə yetirib,
Xovf qıl siğeyi-suzan dili-büryanimdən.

* * *

Günahım olsa da, çox razıyam ilahimdən,
Keçər, ümid edirəm, aqibət günahimdən.

Cahanda səhvü xəta etməyən görək kimdir?
Mənim də qorxum olar nameyi-siyahimdən.

Yaman günümdə pənahim vəfalı dilbərdir,
Necə ümid əlimi mən üzüm pənahimdən?!

Vüsalə rəğbətim artır çəkəndə hicr qəmin,
Xilasi-yol dilərəm öz ümidgahimdən.

Gülüzlülər mən ölərkən məzarə qoysa məni,
Məhəbbət ətri duyarlar gülü giyahimdən.

Qəmin ki hicri-günü-dadxahim oldu mənim,
Ölüncə razılığım var o dadi-xahimdən.

Könüldə sevgilimi gizli saxladım, Vahid,
Bu sirri bildi bütün xəlq əşkü ahimdən.

* * *

El düşdü bütün heyrətə divanəliyimdən,
Sirrin demədim bir kəsə mərdanəliyimdən.

Xakistəri-eşqəm, mənə təhqir ilə baxma,
Min gənc çıxar zahirə viranəliyimdən.

Məcnun kimi mən barigəhi-eşqi bəyəndim,
Keçdim bu təmənna ilə şahənəliyimdən.

Məxmur gözün fikri ilə badə çox içdim,
Bir kimsə zərər görmədi məstanəliyimdən.

Hər lalərüxün şəm kimi eşqinə yandım,
Bir ləhzə xəbər tutmadı pərvanəliyimdən.

Divaneyi-eşq olmağa hər kim həvəs etsə,
Əvvəlcə gərək dərs ala rindanəliyimdən.

Vahid, mən o xakəm, yenə meyxanədə bir gün
Bir zövq yetər aləmə peymanəliyimdən.

* * *

Sən zülfünü aç, tök üzünə, şanəsi məndən,
Zənciri nişan ver mənə, divanəsi məndən.

Sən aşiqi yandırmağa, mən yanmağa mail,
Sən şəmini göstər mənə, pərvanəsi məndən.

Zülfün qədəri aşiq olan var sənə, ey gül,
Sən söylə o məcnunları, əfsanəsi məndən!

Sərməst gözün fitnə, ləbin nəşəli badə,
İçdir mənə ol badəni, peymanəsi məndən.

Sən naz ilə gül ki, sədəfin qiyməti artsın,
Göz yaşı kimi incisi, dürdanəsi məndən.

Hərdən götür üzdən, gözəlim, əfiyi-zülfün,
Çək zahirə gəncinəni, viranəsi məndən.

Vahid, meyi tərk etmək üçün piri-muğanın,
Rəncidə olub bir neçə məstanəsi məndən.

* * *

Fələk büküb belimi, intiqam alır məndən,
Ədunu gör ki, bu halətlə kam alır məndən.

Mənimlə daim o kəslər ki, həmpiyalə idi,
Nə cam lütf edir indi, nə cam alır məndən.

Qürurə mail olub bəzi həmdəmi-naqis,
Nə varsa səbrü qərarım, təmam alır məndən.

Soruş ki, neyləmişəm mən bu mehrsiz fələkə,
Nə varsa, səbrü qərarım, təmam alır məndən.

Nizamı gərdişi-çərxin nizamidən düşsün,
Nizami-işrətimi binizam alır məndən.

Mənim bu halımı gördükcə şad olur düşmən,
Sanır qisasə tapıbdır məqam, alır məndən.

Mətai-şerlə, Vahid, həmişə xoşhaləm,
Vətən cocuqları şirin kəlam alır məndən.

* * *

Fələk istər sala daim məni, ey məh, cüda səndən,
Olurmu, çəksin əl aşiq, söylə, ey məhliqa, səndən?

Cahanı rövşən eylərdi camali-mahi-ruxsarın,
Görüb ruyini çıxmazdı, edərdi gün həya səndən.

Düşəndə yadimə, ey məhvəşi-siminbədən, ol dəm,
Çəkərdim nəşələr əfzun məni-bəxti qara səndən.

Əsib bunca pərişan eyləmə sən zülfi-cananı,
Şikayət eylərəm həqqə mən, ey badi-səba, səndən.

Cəfayi-xardən bülbül çəkib yüz min bəla gərçi,
Mənimtək görməmiş yarə qəsəm, ey gül, bəla səndən.

Dəm vurma eşqdən, Vahid, keçən üşşaq imiş aşiq,
Olub artıq, olar bu dərdi-eşqə mübtəla səndən.

* * *

Ruxun göstərsə ol məhvəş əgər ziri-niqabindən,
Yəqin ki, döndərər üz göydə fələk öz afitabindən.

Demin Məcnuna aşiq kim, deyildir ol mənə həmta,
Qoyub səhraya üz, qaçmışdır ol eşqin əzabindən.

Nə məndə tab vardır, nazü qəmzə çəkməyə bir dəm,
Nə də əl çəkməz ol yarım belə nazü itabindən.

Riya ilə mənə təklifi-məscid qılma, ey zahid,
Günahkaram, məni əfv et, keçərmi kəs səvabindən?

Görüb ruxsarü zülfi-yarımı dün şəb məhi-taban,
Üzün gizlətdi əbru zülmət içrə öz hicabindən.

Büsati-eşqdən, Vahid, bizi mən eyləyir zahid,
Nə bilsin, bixəbərdir, dadmayıb eşqin şərabindən.

* * *

Ey zülm evi, tez məhv olacaqsan təməlindən,
Övladi-bəşər qurtaracaq qanlı əlindən.

Arxanca sovet süngüləri baş-başa çatmış,
Guya xəbərin yoxdur hələ öz əcəlindən?

Tarix gələcək nəslə səni göstərəcəkdir,
Nifrət yağacaq namına zərbülməsəlindən.

Qan-yaş tökür Avropa, bütün matəmə batmış,
Çeynəndi cahan əhli bu murdar əməlindən.

Minlərcə bəşər nəsli qalıb yurduna həsrət,
Min faciə baş verdi bu cəngü cədəlindən.

Namərdliyini xalqa sübut eylədin axır,
Zatən elə sən xain imişsən əzəlindən.

Vahid! Vətən uğrunda məhəbbətlə qəzəl yaz,
Duyduqca könül ləzzət ala hər qəzəlindən.

* * *

Etməm, gözəlim, kimsəyə bir şikvə qəmindən,
Yansam da, yaxılsam da tükənməz sitəmindən.

Dünyada sanardım əbədi ömrümü xoşbəxt,
Öpsəydim əgər bir də mübarək qədəmindən.

Dönsün mənə bir zülmətə çərxin yeni ayi,
Tutsam əgər artıq onu əbruyi-xəmindən.

Bu fəxr yetər kim, mənə üftadeyi-eşqəm,
Sal başıma bir sayə humayi-kərəmindən.

Zahid! Rüxi-cananıma bir yol nəzər eylə,
Vəsf etmə mənə bir daha bağı-İrəmindən.

Mötadi-qəmi-eşqinəm, ölləm, bilir aləm,
Bir ləhzə əgər ayrıla könlüm ələmindən.

Gül çəkdi xəcalət, üzünü gördü, qızardı,
Ləbbəstəliyi qönçələr öyrəndi fəmindən.

Vahid! Bu qədər incə qəzəllər ki, yazırsan,
Bir gün gələcək, od yağacaqdır qələmindən.

* * *

Ey gül, səni kim ayrı salıbdır çəmənindən?
Aç gizli müəmmanı o qönçə dəhənindən.

Cənnət sözünə xəlqdə rəğbət azalıbdır,
Cənnətdə nələr var ola artıq Vətənindən?!

Gülzari-Vətən seyrinə ahəstə qədəm qoy,
Torpaq da ətirlənməlidir gül bədənindən.

Şux baxmağı, nazikliyi öyrəndi çəməndə
Nərgiz baxışından, güli-tər pirəhənindən.

Gizlətmə o gül çöhrəni zülf içrə, xətadır,
Qoy feyzə yetək biz də güli-yasəmənindən!

Vahid sənin eşqinlə gəlir şurə həmişə,
Tuti kimi ayrılma o şirin süxənindən!

* * *

Dila, minnət çəkincə hər vəfasız aşinalərdən,
Yaxınlaş dərgəhi-həqqə, uzaqlaş bivəfalərdən.

Hər ahu gözlünün zənciri-zülfün müşk zənn etmə,
Əsiri olmamış, cəhd et, qutar canın xətalərdən.

Ayaq tutduqca var qaç, hər dənixislətlə yar olma,
Sədaqət, mərhəmət umma bu məsləksiz gədalərdən.

Zəmanə olsa rəyincə, səninlə yar olur aləm,
Yaman gündə bütün üz döndərərlər binəvalərdən.

Xətadır indi hər naəhlə dil vermək, rəfiq olmaq,
Gədalıqdır, dəyanət gözləmək hər biədalərdən.

Bütün övzai-aləm xalq üçün bir dərsi-ibrətdir,
Gərəkdir imtahan almaq tükənməz macəralərdən.

Əgər cənnət ola aləm səfavü zövqdən, Vahid!
Bizi tale ayırmaz bir zaman möhnətsəralərdən.

* * *

Gözəlim, gül yanağın qırmızıdır məxmərdən,
Dodağın ləldən artıqdı, sinən mərmərdən!

Güldə varsa nə gözəllik, gözəlim, səndə də var,
De görək, bir nəyin əskikdi güli-əhmərdən?

Dəhənin qönçə, belin incə, üzün gül kimi tər,
Saçların sünbülü avarə salıb çöllərdən.

Əhli-eşqə bu qədər naz eləmək yaxşı deyil,
Bəsdir, insaf elə, əl çək bu yaman şakərdən!

Necə əğyarə baxırsan, gözəlim, qan olmaz,
Göz ucuyla bizə də bir nəzər etsən hərdən.

Eşq zəncirinə yüz dəfə giriftar olsun,
Mənə hər kim desə, əl çək bu qara gözlərdən.

Bu pəriçöhrələr eşqində gözəldir, Vahid,
Qəzəli sən deyəsən, mən oxuyum əzbərdən.

* * *

*Qəzəl xalq şairi*
*Səməd Vurğuna həsr olunmuşdur*

Yüz dəfə cəfa gəlsə bizə sevgilimizdən,
Bir dəfə şikayət sözü çıxmaz dilimizdən.

Qəsd etsə həsədlə bizi məhv etməyə zalim,
Keçməz bizim ərbabi-qələm qatilimizdən.

Tufani-bəla gəlsə də, qorxan deyilik biz,
Dağlar belə sədd olsa, qaçar sahilimizdən.

Baxma bizə min naz ilə, səyyadlərik biz,
Yüz gözləri ahu qaça bilməz əlimizdən.

Xaki-dəri-meyxanədə dəfn et bizi, saqi,
Min kuzə çıxar torpağımızdan, gilimizdən.

Vahid, biz o nəxlik ki, bu gülzari-cahanda,
Övladi-vətən zövq alacaq hasilimizdən.

* * *

Töküb qanım, rəvan qeyb oldu ol sərvi-rəvan gözdən,
Bu rövşəndir ki, qan tökcək olur mərdüm nihan gözdən.

Kəməndi-zülfünə bağlı çıxar qan cismi-zarimdən,
Kənar olduqca hər ləhzə o yari-mehriban gözdən.

Gözümdə tifltək oynar xəyali-çeşmi-məxmuri,
Basıb bağrına mərdüm qoymaz ani bir zaman gözdən.

Təki min ox, rizayəm, sinəmə peyvəstə sancılsın,
Məni ta salmısan ol dilbəri-əbri-kəman gözdən.

Əgər bir dəfə bağ içrə bu qamətlə xuram etsən,
Salar ta həşrədək öz sərvi-nazın bağiban gözdən.

Eşitdim, qeyrlə ol laləüzlüm seyri-bağ etmiş,
Xudaya, saxla sən ol mahi-bimehri yaman gözdən.

Necə sərməst ikən, Vahid, çıxım meyxanədən huşyar?
Məni bir ləhzə qoymaz bəzmdə piri-muğan gözdən.

* * *

Olmuşam, ey gül, cəmalın şəminə pərvanə mən,
Eşq tərkin qılmaram od içrə yanə-yanə mən.

Çox xəyali-zülf ilə Məcnun olanlar görmüşəm,
Görmədim aləmdə öz könlüm kimi divanə mən.

Qəmzə peykanın diriq etmə dili-üşşaqdən,
Sinəmi qıllam hədəf ol naviki-müjganə mən.

Bilmədim, biganələr, ey gül, nə sehr etmiş sənə,
Düşmüşəm gözdən yanında, olmuşam biganə mən.

Şişətək sınmış, eşitdim, xatirin məndən, gülüm!
Söylədim, gəzmə rəqibimlə sənə ərkyanə mən.

Yar ilə olsam əgər bir guşeyi-viranədə,
Kafərəm, versəm o bəzmi rövzeyi-rizvanə mən.

Könlümü sən zülf ilə, mən ahim ilə, sevgilim,
Dartırıq divanətək bir yanə sən, bir yanə mən.

Nazənin, gülüzlü cananlardır eşqin ləzzəti,
Neyləyim, bəs gəlməyim bülbül kimi əfğanə mən?

Dilgüşa məhparələr zülfündən açsam könlümü,
Vermərəm, Vahid, o güldən başqa bir cananə mən.

* * *

İnanmışam, gözəlim, xalq içində bir sənə mən,
Zəmanə bülbülüyəm, aşiqəm o gülşənə mən.

Mən arifəm, bilirəm, sən nə bağçanın gülüsən,
Əgərçi çoxdan əsirəm o zülfü süsənə mən.

Tamam bu aləmi gər çəksən imtahan daşına,
Xəyalına gələrəm qəlbi saf çıxan yenə mən.

Alar qərarını əldən, inanma hər gözələ,
Nə bir vəfası olur, qoy deyim bunu sənə mən.

İtirmə gəl bu kiçik şeri, Vahidin sözüdür,
Özün də bir dənəsən, saxla yadda, bir dənə mən.

* * *

Dil verməsəydim ol sənəmi-məhliqayə mən,
Asudə yerdə düşməz idim min bəlayə mən.

Hər şəb sitarə tək tökərəm əşk didədən,
Ta sübh olunca bildirəm halım ol ayə mən.

Şayəd öpəm o mahrüxün xaki-rahini,
Düşdüm ayaqlar altına manəndi-sayə mən.

Uydum kəməndi-zülfünə bir ahu gözlünün,
Saldım bəlalı başımı yüz min xətayə mən.

Sənsiz günüm qaralsın, əgər qaşların görüb
Baxsam fələkdə gərdiş edən tazə ayə mən.

Biçarə könlümü geri alsaydım, heç ölmərəm,
Zülfün görəndə vermişəm ol dilrübayə mən.

Məhparələrdən, axırı çəkdigmi cəkmişəm,
Vahid, inanmaram dəxi hər bivəfayə mən.

* * *

Sevməsəydim əgər ol zülfi-xəməndərxəmi mən,
Bir dəm ömrümdə çəkərdimmi bu dərdü qəmi mən?

Başqa bir dilbərə olsaydı məhəbbət məndə,
Bu qədər ah ilə yandırmaz idim aləmi mən!

Sənin hüsnündü mənim eşqimi əfzun eləyən,
Böylə rüsvalığa bais həmi sənsən, həmi mən.

Mən sən olsaydım əgər qeyrə könül verməzdim,
Qoymaz idim, yetişə vəslinə naməhrəmi mən.

İndi dünya, gözəlim, get-gedə bir cənnət olur,
Sənsən Həvvası bu gün əsrimizin, Adəmi mən.

Əhli-fəqrəm, mənə öz cami-şərabım bəsdir,
Neylərəm kaseyi-fəğfur ilə, cami-Cəmi mən.

Vahid, öpsəm o gülün çahi-zənəxdanından,
İstəməm Kəbeyi-ülyada olan Zəmzəmi mən.

* * *

Çox gözəllər gördüm, axtardım bütün dünyanı mən,
Tapmadım aləmdə öz könlüm sevən cananı mən.

Binəva pərvanələr tək yetmədim məqsudimə,
Eşq sevdasiylə yandırdım bu şirin canı mən.

Nazənin, ahu baxışlı çox pərilər görmüşəm,
Sevmədim öz sevgilimdən başqa bir ceyranı mən.

Bülbüli-nalaniyəm mən bir gülüzlü dilbərin,
Neylirəm hər lalə üzlü qonçeyi-xəndanı mən.

Hər gülün bir ətri var, hər qönçənin bir nəşəsi,
Olmuşam çox nazəninlər bağının bağbanı mən.

Var ümidim, vəsli-canana yetişsin tez əlim,
Ah ilə söndürrəm axır atəşi-hicranı mən.

Vahidəm, bimari-eşqəm, qeyridən yox minnətim,
Dərdimə canan əliylə istərəm dərmanı mən.

* * *

Dilbəra! Atəşi-eşqin ilə suzanəm mən,
Yanıram, rəhm elə, qoyma bu oda yanəm mən.

Bağlayıbsan məni zənciri-səri-zülfün ilə,
O səbəbdən belə divaneyi-dövranəm mən.

Rəhmə gəl, tökmə nahaq qanımı, öz aşiqinəm,
Gecə-gündüz səri-kuyində nigəhbanəm mən.

Bir də gər kuyinə cənnət desəm, insan deyiləm,
Ey cəfapişə, bu bir səhvə peşimanəm mən.

Bir nigah ilə gözün aləmə min fitnə salıb,
Bu necə fitnəvü cadudu ki, heyranəm mən?

Ey güli-qönçə, cəfavü sitəmindən daim
Bülbülasa çəməni-eşqdə giryanəm mən.

Vahid, ümmidi-vüsalilə xoşam cananın,
Ta o gündən ki, əsiri-qəmi-hicranəm mən.

* * *

Ömrümü tükətdi bu zəmanə, ölürəm mən,
Gəldim bu fəna dəhrdə canə, ölürəm mən.

Bir ləhzə mənim kamımca çərx dolanmaz,
Lənət gələ bu dövri-cahanə, ölürəm mən.

Şəmşir qaşın fikri büdür, qanımı töksün,
Salma məni nahaq yerə qanə, ölürəm mən.

İnsafmıdı, bu növ verəm zillət ilə can?
Hicrində gəlib ahü fəğanə, ölürəm mən.

Mehrabi-qaşın fikri bu xəm qəddimi, ey məh,
Döndərdi qaşın kimi kamanə, ölürəm mən.

Könlüm quşu olmazdı o zülfündə giriftar,
Bənd eylədi ruyindəki danə, ölürəm mən.

Vahid, desəm öz dərdimi dildarə, inanmaz,
Hər növ tutam əldə bəhanə, ölürəm mən.

* * *

Aşiq olalı zülfünə, ey gül, dəliyəm mən,
Öldür məni, asudə elə, ölməliyəm mən.

Zülfün kimi ardınca sürünnəm, hara getsən,
Hər yerdə döşənnəm yerə, guya xəliyəm mən.

Məqsudun əgər canımı almaq isə, zalim,
Naz eyləmə, bir kəc nigəhin mətəliyəm mən!

Dünya o qədər işvəli dilbər yetiribdir,
Çox hüsnünə fəxr etmə, demə, şivəliyəm mən.

Görsəm ki, salır ləli-ləbi-yarıma meylin,
Biganələrin qanını sorram, zəliyəm mən.

Hər kim o qara zülfə könül versə, xətadır,
Amma yenə mən bəndəm, əcəb gülməliyəm mən!

Bilməm niyə məhrular olur talibi-əğyar?
Bu hikmətin axır səbəbin bilməliyəm mən.

Vahid, mənə cövr eylər o gül, qeyrə məhəbbət,
Bilmiş ki, cəfa çəkmək üçün sərfəliyəm mən.

* * *

Gülşəndə idim seyrdə, bir yar idi, bir mən.
Bir bülbül idi, bir də çəmənzar idi, bir mən.

Hər aşiq öz istəklisi eşqində yanırdı,
Pərvanə idi, şəmi-şəbi-tar idi, bir mən.

Bülbül gülə, gül bülbülə min naz eləyirdi,
Bir kəs yox idi, ol güli-bixar idi, bir mən.

Göylər də həsəddən bizə baxdıqca yanırdı,
Dövrəmdə gəzən sabitü səyyar idi, bir mən.

Görsəydi, rəqibin gözü qəmdən çıxacaqdı,
Mən məst idim, ol gözləri xummar idi, bir mən.

Bir çeşmə kənariydi, qədəh lalətək əldə,
Canan özü saqi meyi-gülnar idi, bir mən.

Öz sirrimi əğyarə nə yaxşı deməmişdim,
Düşdü elə bir yer də ki, əğyar idi, bir mən.

Vahid, yanıram xatirə gəldikcə bu aləm,
Gülşəndə idim seyrdə, bir yar idi, bir mən.

* * *

Könlüm olubdu mail ol yarə, neyləyim mən?
Oldum onun qəmindən biçarə, neyləyim mən?

Məndən bu növ canan kəsməzdi iltifatın,
Düşdüm yenə bəlayi-əğyarə, neyləyim mən?

Bir mübtəlayi-eşqəm, Məcnun nədir yanımda,
Qaldım bu qəm çölündə avarə, neyləyim mən?

Bülbültək ağlaram mən, ey bağban amandır,
Gülşəndə yar olubdur gül xarə, neyləyim mən?

Bir dərdə düşmüşəm ki, zalim, sənin qəmindən,
Gəlsə, təbib də tapmaz bir çarə, neyləyim mən?

Öz aşiqin unutdun, getdin rəqibi tutdun,
Bir sən kimi vəfasız dildarə, neyləyim mən?

Qoymaz görəm doyunca, Vahid, o gül cəmalın,
Zülfün tökər həmişə rüxsarə, neyləyim mən?

* * *

Çöhrəndə ölüm kölgəsi var, ey qarı düşmən,
Xalq ordusu çoxdan qazımışdır sənə mədfən.

Matəm bürüyüb dövrəni, ətrafına bir bax,
Berlində salıbsan analar qəlbinə şivən.

Qırdırma nemes xalqını haqsız yerə, zalım,
Bir gün gələcək, qorx o cəza məhkəməsindən.

Öz tankına, təyyarənə boş-boş havalanma,
Girdabə sürüklər gəmini çox kərə yelkən.

Dağlar kimi sədd olsa da düşmən bizə qarşı,
Bir anda qoparrıq onu, aləm deyər əhsən.

El hümməti, el qüdrəti vardır qolumuzda,
Bir gün alarıq biz bu qisası yenə səndən.

Çox zülm eləyən zalımı yıxmış Qızıl Ordu,
Döymə döşünə, çox demə; dünyada mənəm, mən!

Kəlləndə sovet bombaları partlayacaqdır,
Təxtində də fırlandırarıq odlu dəyirmən.

Tarixi unutma, qocaman Moskvadır bu!
Onlarca Napolyon döyülüb qaçdı bu yerdən.

* * *

Gül incədirsə, sən, gözəlim, güldən incəsən,
İncə nəzakətin qədər incə düşüncəsən.

Hər oynadanda xəm qaşını, qan olur könül,
Sanki bu fikrilə əl atırsan qılınca sən.

Zalim, həmişə könlümü incitdi firqətin,
Ömrümdə qoymadın məni bir ləhzə dincə sən.

Ayinələr xəcalət olur görcək əksini,
Naz ilə şanə zülfünə hərdən çəkincə sən.

Gözdən kənara getmə, bu dərd öldürər məni,
Bilməm, nə növ səbr edə billəm gəlincə sən?

Qəm guşəsində əyri qaşın qiblədir mənə,
Ey eşq tanrısı, məni əydirmə küncə sən.

Vahid, uzatma məsələni, ömrdən gedir,
Ol qarə zülfə dərdini bir yol deyincə sən.

* * *

Əhd qıldın, gözəlim, könlümü xəndan edəsən,
Lalətək bağrını biganələrin qan edəsən.

İndi də səndə gərək rəhm ola biçarələrə,
Mübtəla qıldığın aşiqlərə dərman edəsən.

Unut əvvəlki vəfasızlığı, bundan sonra
Sən gərək ədl ilə, insaf ilə divan edəsən.

Aşiqə zülm eləyən sevgili məhparələrin,
Axırın gör, niyə sən zülmdə tüğyan edəsən?

Qafil olma, gözəlim, könlüm evin yıxmaqdan!
Aşina qəlbini haqsız niyə viran edəsən?

Vədeyi-vəslinə həsrət çəkən aşiq çoxdur,
Əhd qıldın, gərək öz əhdinə peyman edəsən.

Nəyə lazım, gözəlim, sirrini biganə bilə,
Düşmənindən gərək öz sirrini pünhan edəsən.

Razı olma, baxa ayineyi-ruxsarinə gül,
Niyə hər bir yetəni hüsnünə heyran edəsən?

İddia eyləmə, Vahid, quru bir canın var,
Onu da sən gərək öz yarına qurban edəsən.

* * *

Razıyam, sevgilim, hər gün mənə min naz edəsən,
Özgələrtək məni də lütflə dəmsaz edəsən.

Meylim artır sənə cövrün mənə olduqca füzun,
Qorxuram, cövrünü lütf ilə mənə az edəsən.

Ötmə kəklik kimi min naz ilə əlvan geyinib,
Bizim ətrafa da, olımazmı ki, pərvaz edəsən?

Bir özün fikr elə, insaf deyildir, gözəlim,
Gizli öz sirrimizə özgəni həmraz edəsən.

Gülməsinlər bizə biganələr, ağlatma məni,
Yıxdığın aşiqi olmazmı sərəfraz edəsən.

Vahid, istərsən əgər eşqdə, məşhur olasan,
Sən gərək ah ilə Məcnun deyə avaz edəsən!

* * *

Bənzərəm bülbülə gülzari-Vətəndə, gülə sən,
Mən əgər ağlasam eşqində, gərək sən güləsən!

Nə qədər cövr eləsən, inciyən olmaz səndən,
Eşqi vardır sənə xəlqin, gözəlim, qarəgiləsən.

Qısqanırlar sənə, ardınca güdürlər gecələr,
Gözlə ki, düşməyəsən boş yerə dildən-dilə sən!

Yaşının azlığına baxma, kəmalın çoxdur,
Az zamanda gələcəksən, gözəlim, hasilə sən.

Naz ilə yol-yerişin, sadəliyin xoşma gəlir,
Bir cəhət var ki, yaraşmır sənə – kəmhövsələsən.

Ləlü gövhər sən olan yerdə düşər qiymətdən,
O gümüş gərdəninə düzmə qızıldan hilə sən.

Vahidin dəhrdə divaneyi-eşq olmağına,
Etmə zülfün üzə zəncir kimi silsilə sən.

* * *

Gözəllər içrə sən, ey mahiparə, bir dənəsən,
Gözəllərin gözüsən, zülfü qarə, bir dənəsən.

Gülüzlü nazlı sənəmlər düşər qədəmlərinə,
Bu çeşmi-məst ilə qılsan işarə bir dənə sən.

Sən olmasan, məni hicran qəmi həlak eylər,
Şikəstə könlümə aləmdə çarə bir dənəsən.

Zəmanə əhlinə məşhursan gözəllikdə,
Bu sirr gizli deyil, aşikarə, bir dənəsən.

Rəqibi qoyma yaxın vəslinə, xəyanət edər,
Ki, qorxuram, səni çəksin kənarə, bir dənəsən.

O zövqü dövləti-dünyayə verməərəm, hərdən
Məni fəqirə də qılsan nəzarə, bir dənəsən.

Gözəl həyatını, Vahid, fənayə sərf etmə,
Səni zəmanə yetirməz dübarə, bir dənəsən.

* * *

Naz etmə, sevgilim, bilirik, mahiparəsən,
Eşq əhlini kəməndə salan zülfü qarəsən.

Açdıqca gül cəmalını aləm işıqlanır,
Aysan, günəşmisən, gözəlim, ya sitarəsən?

Bir kimsə görmədim, sitəmindən xilas ola,
Kimsən, düşünmürəm, nəçisən sən, nə karəsən?

Yüzlərcə nazəninlər olur mübtəla sənə,
Getsən bu nazü qəmzə ilə hər diyarə sən.

Güllər ayağın öpməyinin həsrətin çəkir,
Çıxsan bu sərvi-qamətinlə laləzarə sən.

Çeşmü ləbin xəyalı məni qıldı meypərəst,
Saldın həmişə könlümü rənci-xumarə sən.

Nöqsan yetişməsin, gözəlim, mahi-ruyinə,
Çıxma rəqiblə gecə mənsiz kənarə sən!

Bir dəfə qeyrilə səni gördüm – bəladəyəm,
Dərd öldürər məni, yenə gəzsən dübarə sən.

Xaki-məzar Vahidə bir laləzar olar,
Qoysan əgər onu öz əlinlə məzarə sən.

* * *

Yoxsa, ey gül, yenə gülzardə hal eyləmisən?
Qönçənin bağrını qan, bülbülü lal eyləmisən?

Qamətin sayə salan yerlərə gün sürtər üzün,
Onu sərgəşteyi-zülfü xətü xal eyləmisən.

Qaş qaraldıqda üzünlə dura bilməz qarşı,
Məgər, ey məh, günəşə ərzi-cəmal eyləmisən?

Özgələr məhrəm olub vəslinə, öz aşiqini
Yandırıb hicr ilə məhrumi-vüsal eyləmisən.

Aşiqin könlünü yıxmaq, gözəlim, yaxşı deyil,
Tutar axır səni ahim, nə xəyal eyləmisən?!

Sən ki yoxdun, nə bilirdim, ələmi-eşq nədir,
El içində məni Məcnunə misal eyləmisən.

Naz ilə qeyri görəndə danışırsan, nə səbəb
Məni gördükdə, gülüm, tərki-məqal eyləmisən?

Vahid, əhsən sənə, tən oxlarını gəldikcə,
Yığmısan dövrənə, bir cahü cəlal eyləmisən.

* * *

Dedim: – Ey qönçədəhan, könlümü qan eyləmisən,
Dedi: – Bica yerə eşqimdə fəğan eyləmisən!

Dedim: – İnsaf elə, incitmə məni, aşiqinəm,
Dedi: – Get, sirrimi dünyaya əyan eyləmisən!

Dedim: – Ağlatma məni sərv boyun şövqində,
Dedi: – Göz yaşını bihudə rəvan eyləmisən.

Dedim: – Axır, gözəlim, baği-baharım sənsən,
Dedi: – Sən ömrünü həsrətlə xəzan eyləmisən.

Dedim: – Az çəkməmişəm gözlərinin həsrətini,
Dedi: – Öz könlünü yersiz nigəran eyləmisən.

Dedim: – Eşqində əsirəm, mənə bəs xeyri nədir?
Dedi: – Əvvəldən bu sevdadə ziyan eyləmisən.

D e d i m : – Eşq atəşi neylər mənə, qorxan deyiləm!
D e d i : – Biçarə, yanarsan, nə güman eyləmisən?!

D e d i m : – Ey gül, mən əzəldən də gözəl aşiqiyəm,
D e d i : – Sən ruhini eşq ilə cavan eyləmisən.

D e d i m : – Hər gün səri-kuyində dolanmaqdır işim,
D e d i : – Vahid, nə gözəl yerdə məkan eyləmisən!

* * *

O gün də söz verib, ey mahiparə, gəlməmisən,
Bu gözləməklə günüm oldu qarə, gəlməmisən.

O gündən indiyədək könlüm intizardədir,
Təsəlli verməyə bu intizarə gəlməmisən.

Bu hüsnlə sənə hərgiz yaraşmayır, gözəlim,
Birinci dəfə deyildir, dübarə gəlməmisən.

Sənə nə tənə edim, çünki təcrübən azdır,
Mənimtək eşqə düşüb ahü zarə gəlməmisən.

* * *

Eşqin eləsə könlümü qan, bilməyəcəksən,
Yüz dəfə desəm mətləbi qan, bilməyəcəksən!

Bax sinəmə, min yarə vurub tiri-nigahın,
Əfsus ki, ey qaşı kaman, bilməyəcəksən.

Axır ki, qocaltdı məni dərdi-qəmi-eşqin,
Pir olmasan, ey tazə cavan, bilməyəcəksən.

Bimehrsən aləmdə, rüxi-alına həsrət
Versəm əgər hicrində də can, bilməyəcəksən.

Məcnun kimi zənciri-səri-zülfünə bağlı,
Olsam dəxi rüsvayi-cahan, bilməyəcəksən.

Tutsam, gözəlim, damənini, incimə məndən,
Neylim ki, desəm, getmə, dayan, bilməyəcəksən.

Kuyində gözüm yaşını yüz yol sitəmindən
Etsəm üzə, ey sərvi-rəvan, bilməyəcəksən.

Sirri-ləbini dildə nihan saxladım eldən,
Faş olmaya bu razi-nihan, bilməyəcəksən.

Şövqi-dəhənin Vahidi məhv eyləsə hərgah,
Ondan yenə bir namü nişan bilməyəcəksən.

* * *

Gözün qadasın alım, sən nə yaxşı dilbərsən!
Deyil xilaf, desəm: Leyliyə bərabərsən.

Bu qaş, bu göz, bu məlahət ki, səndə var, ey gül,
Qərəz ki, afəti-cansan, nə bilsən, eylərsən!

Nə müşk zülfünə bənzər, nə çeşminə ahu,
Xəta deyil bu, desəm, müşkdən müəttərsən.

O küfr-zülfün əlindən məhaldır, qutaram
Ki, zərrə rəhm yoxundur, sən öylə kafərsən.

Verir həyat mənə dəmbədəm ləbin zikri,
Sənə fəda mən olum, sən məgər peyəmbərsən?

Bəşər desəm sənə, olmaz bəşər bu surətdə!
Pəri desəm də xətadır, vəleyk digərsən.

Sənin ki atəşi-hicranə böylə tabın var,
Görən deyər sənə, Vahid, yəqin səməndərsən.

* * *

Bir gün, gözəlim, qəbrimin üstdən ötüşərsən,
Dərdindən ölən aşiqini bir düşünərsən.

Etməz, mələk olsa, bu qədər naz ilə qəmzə,
İnsaf elə bari, gözəlim, sən ki, bəşərsən.

Naz ilə gələrkən qədəmin qoy gözüm üstə,
Qoyma quru yer üstünə, birdən sürüşərsən.

Biganə ilə gəzmə, dedim, qəlbinə dəydi;
Cana, nə bilim, sən bu qədər dəymədüşərsən?

Əğyar yetir vəslinə, amma mənə dersən:
Sən düşmə bu xülyalara, umsunma, şişərsən.

Bir salmadın öz aşiqini yadına, zalim!
Əğyar ilə amma gedib hər gün öpüşərsən.

Əl çək, demə, ey dil, mənə zülfündən o mahın,
Bir gün bu kəməndə sən özün də ilişərsən.

Rəhm eyləmədin Vahidə, zalim, dirilikdə,
Öldükdə məzarilə gedərsən, görüşərsən.

* * *

Bu hüsn ilə, gözəlim, sən gözəllərin gözüsən!
Nə vaxtadək salacaqsan fərağına bizi sən?

Deyirdilər ki, mələk var, ona inanmazdım,
Səni görən tək inandım, dedim ki, sən özünsən.

Qaşın, gözün, yerişin, qamətin qiyamətdir,
Gözəlliyində tamamsan, qərəz ki, hər üzü sən.

Rəqib ilə məni bir gözdə görmə, insaf et,
Gərək özün biləsən indi əyrini, düzü sən.

Nəzərdən aşiqini salma, baxma özgələrə,
İnanma, alma hesaba, amandır hər sözü sən.

Səninlə xalqımızın, haqqı var ki, fəxr eləyir,
Bu şanlı ölkəmizin sən şərəfli bir qızısan.

Evin yıxan da odur Vahidin, bilirsən özün,
Atırsan hərdən ona naz ilə bu qaş-gözü sən.

* * *

Mərdümi-çeşmim edib mişksifət zülfü vətən,
Dami-səyyadidə san bənd olub ahuyi-Xütən.

Qanə döndü, görüb ol ləli-ləbin şişədə mey,
Açmadı qönçə ağız, gördü səni təngdəhən.

Gər bu qamətlə xuram eyləyəsən gülzarə,
Səbzə torpağa düşər, görcək olar xar çəmən.

Səni tarı, səri-kuyində əgər can versəm,
Təni-üryanıma geysulərini eylə kəfən.

Vaiz, övqatımı təlx eyləmə vəz ilə əbəs,
Yoxdu ol büt kimi şirinləbü azadəsüxən.

Mən dolandıqca cahan mülkünü gərdun dolanır,
Rişteyi-eşqim olub tusəni-gərdunə rəsən.

Əhd qılmışdı, mənə busə verə, vermədi dün,
Vahida, görmədim ol məh kimi bir əhdşikən.

* * *

Gəl, ey fəraqı məni zarü biqərar eləyən,
Bəlali başımı yüz qəmlərə düçar eləyən.

Qoyan cəmalinə həsrət həmişə aşiqini,
Rəqibə yar olub, ey aşiqin kənar eləyən.

Vəfalı aşiqinəm, görmürəm vəfa səndən,
Hanı sənin kimi bir zülmü bişümar eləyən.

Bəlayi-eşqə düşüb tirəruz olmazdım,
Siyahi-türrələrindir günümü tar eləyən.

Gəzərdim ol səri-kuyində ixtiyarım ilə,
Yox idi kimsə qapından məni kənar eləyən.

Amandır, bir də, könül, yarə etibar etmə,
Xəyalı səhv edib onlara etibar eləyən.

Şərabi-eşqini Vahid içib də məst olmuş,
Təəccübəm ki, onu yoxdu huşyar eləyən.

* * *

Ey könül, ol şuxə canan mən deməzdim, sən dedin,
Can belə canana qurban mən deməzdim, sən dedin.

Kim bilirdi ləli-cananın səfabəxş olduğun?
Böylə sirri xəlqə pünhan mən deməzdim, sən dedin.

Naz ilə min can alan məhrulərin gül ləblərin
Aşiqin dərdinə dərman mən deməzdim, sən dedin.

Məh üzün xurşidə bənzətdim, hilalə qaşların,
Var sənin fikrində nöqsan, mən deməzdim, sən dedin.

Hər gülüzlü dilbərin düşmə xəyali-zülfünə,
Qəlbini eylər pərişan, mən deməzdim, sən dedin.

Əsri görmür, indi də cənnət təmənnasındadır,
Zahidi-bizövqə nadan mən deməzdim, sən dedin.

Zülfi-canandan əl üzmüş, sanki bir divanədir
Vahidin haqqında böhtan mən deməzdim, sən dedin.

* * *

Məni həmişə, gülüm, xari-ruzigar elədin,
Rəqibə məxfi olan sirrim aşikar elədin.

Bəlayi-eşqə düçar olmaz idim aləmdə,
Məni bu dərdü bəlayə ki sən düçar elədin.

Rəqibi məhrəm edibsən hərimi-kuyində,
Nə vəchlə məni o bəzmdən kənar elədin?

O dami-zülfünə səyyadtək könül quşunu
Salıb kəməndinə, ey ahuvəş, şikar elədin.

Rəqib xanəsini ruzü şəb qılıb rövşən,
Mənim günümü nədən boylə tirətar elədin?

O çin zülfünə mişkin dedim, xəta qıldım,
Məni görəndə Xütən seyditək fərar elədin.

Bu əhd ilə qəzəli sən ki yazmısan, Vahid,
Hüzuri-məclisi-əhbabə bərgüzar elədin.

* * *

Məni, ey tazə gül, hicrində giryan eylədin, getdin,
Misali-bülbüli-şuridə nalan eylədin, getdin.

Qoyub, ey Yusifi-sani məni Yəqubtək ağlar,
Mənə bu xaneyi-dünyanı zindan eylədin, getdin.

Məni Məcnun kimi zənciri-zülfə bağladın möhkəm.
Xəyalım cəmikən axır pərişan eylədin, getdin.

Tərəhhüm qılmadın üşşaqə bir dəm, ey şəhi-xuban,
Məni sail kimi çaki-giriban eylədin, getdin.

Qılıb eşq əhlini qəm bəstərində ruzü şəb xəstə,
Rəqibi-səngdil dərdinə dərman eylədin, getdin.

Məni ağlatdın hicrində bəlayi-eşq ilə, zalim!
Nədən biganələr könlünü xəndan eylədin, getdin.

Gəlib nə Vahidi qəmdən xilas etdin, nə öldürdün,
Nə də müşkül olan dərdini asan eylədin, getdin.

* * *

Gözəlim, gül üzünə el-hamı heyrandı sənin,
Fitnəkar, şux baxışın işvəli ceyrandı sənin.

Məni bimar eləyən gözlərinin həsrətidir,
Ləblərin xəstə olan könlümə dərmandı sənin.

Sən gülərkən sevinir, şad olur, ellər də gülür,
Məgər ol ləli-ləbin qönçeyi-xəndandı sənin?

Gözlərin qarət edib könlümü, canım qalmış,
O da ki qaşlarının tağına qurbandı sənin.

Ərköyünsən, nə bilirsən, elə öz aşiqinə,
Hər nə hökm eyləsən, hökmün də firavandı sənin.

Bu məlahətlə əgər bilməsən öz qiymətini,
Nazəninim, mələkim, şəninə nöqsandı sənin.

Qırmızı alma kimi lalə yanağın qızarıb,
Gül camalın, elə bil, baği-gülüstandı sənin.

Nə könül doydu, nə göz gül üzünə baxmaqdan,
Öylə ki, əksi-rüxün diqqətəşayandı sənin.

Demə, Vahid, yanıram, eşq oduna tabım var,
Çünki doğma vətənin Azərbaycandı sənin.

* * *

Zülfi-ənbərşikəni ol büti-şəkkərsüxənin
Saldı səhralərə müşkini qəzali-Xütənin.

Ləblərin söhbəti ta düşdü ağızdan-ağıza,
Qədri əksildi o gündən bəri ləli-Yəmənin.

Gül giribanini çak etdi üzün şövqündən,
Qönçənin bağrını qan etdi xəyali-dəhənin.

Piri-Kənan bu vəcahətlə səni görsəydi,
Həsrətin çəkməz idi Yusifi-gülpirəhənin.

Saqiyi-məclisi-mey olmasa gülrulərdən,
Olmaz eşq əhlinə təsiri şərabi-kühənin.

Cilvəkar olmasa bağ içrə əgər qaməti-yar,
Bizə duzəx görünər sayəsi sərvi-çəmənin.

Çəkməsəydim mən əgər hicrini ol lalərüxün,
Çoxdan asarı itib getmiş idi Kuhikənin.

Vahid! Əlbəttə, yanar atəşi-qürbətdə müdam,
Bilməsə qədrini hər kim ki, mübarək Vətənin.

* * *

Gördülər ta o gülün nərgisi-məstanələrin,
Saldı saqilər həsəddən yerə peymanələrin.

Bilməsəydi ləbinin zövqünü meyxanəçilər,
Bil ki, çoxdan qapamışdı hamı meyxanələrin.

Yığdı rüxsarı tamaşasına aşiqlərini,
Şəmə bax, gör necə cəm eylədi pərvanələrin!

Beyrəqi-zülfün o şux açdı, dağıtdı üzünə,
Fikri var, toplaya öz başına divanələrin.

Mən cəfasın çəkirəm, sən bu vəfasızlığa bax!
Məndən artıq sevir ol gül yenə biganələrin.

Gördülər şanənin ayrılmadığın zülfündən,
Xublər rəşk ilə sındırdılar öz şanələrin.

Vermərəm dilbərimin bir səri-kuyin, Vahid,
Versələr küll cahanın mənə kaşanələrin.

* * *

Ləbinə bənzəməsəydi meyi meyxanələrin,
Lalərəng olmaz idi çöhrəsi peymanələrin.

Olmasaydı əgər ol şəmi-cəmalın şövqü,
Biri düşməzdi yaxın atəşə pərvanələrin.

Topla, zülfün kimi yığ dövrənə aşiqlərini,
Qoyma qalsın belə öz başına divanələrin.

Əhli-eşqin bu qədər könlünü incitməz idi,
Ruhu olsaydı bu zülf içrə gəzən şanələrin.

Səmti-meyxanəyə nifrətlə uzaqdan baxma,
Gəl yaxından nəzər et zövqünə məstanələrin.

Aşiqin dərdinə bir az yenə meydəndir əlac,
Yoxsa, kim səbr qılar cövrünə biganələrin?!

Vahid, heç olmasa, dərd yarıdır, aləmdə yenə
Bizə rəhm eyləsə mindən biri canananələrin.

* * *

Yar üçün nazını çəkmək gərək əğyarlərin,
Gül üçün bülbülə min cövri yetər xarlərin.

Məni aludeyi-mey gözləri ahulər edib,
Qurtaran varmı əlindən bu xətakarlərin?

Yar idi, saqi idi, cami-mey əldə mən idim,
San fələk toplamış öz sabitü səyyarələrin.

Məstlik qəsdi ilə zöhdü vəridən qaçıram
Ki, gözüm görməyə karin bu riyakarlərin.

Bizi ustadımız Azər, demə, tənqid etmiş,
Dəyməmiş piri-muğan qəlbinə meyxorilərin.

Biz günahkarların, mərhəmətə haqqı da var,
Keçəcək cürmünü, əlbəttə, günahkarlərin.

Bizi bir cam ilə mey nəşəsi yıxmışsa, nə qəm,
Evi abad ola Azər kimi qəmxarlərin.

Əgər ustadımız Azər kimi bir həmdəm ola,
Həmdəmi olmaz idim bir para əyyarlərin.

Hanı Yusif, hanı Sabit, hanı Saqib kimi dost[1]
Ki, ayağın öpüm ol yari-vəfadarlərin.

Dərdi-mey qalsa da, qəm çəkmə ayaq altında,
Çıxacaq başına ən rütbəli sərdarlərin.

Vahidəm, məst görərkən mənə çox eyb etmə,
Tənəsindən içirəm bəzi dilazarlərin.

* * *

Səfayi-söhbəti-cananı kim görüb, o desin!
Bəlayi-möhnətü hicranı kim görüb, o desin!

[1] Bakı şairləri Mirzə Əbdülxaliq Yusif, Mirzə Hadi Sabit, Haşım bəy Saqib

İnanmıram, mənə hər kim deyir ki, cənnət var,
Göziylə rövzeyi-rizvanı kim görüb, o desin!

Mənim gülüm, çiçəyim, cənnətim gözəllərdir,
Behişti, huriyü qılmanı kim görüb, o desin!

Kəməndi-eşqdə Məcnunu görməyən nə bilir?
Əsiri-zülfi-pərişanı kim görüb, o desin!

Mən ağladıqca nigarım gülərdi göz yaşıma,
Gülərkən ol güli-xəndanı kim görüb, o desin!

Çəməndə hər səhər eşq əhlinin təranəsidir,
Fəğani-bülbüli-nalanı kim görüb, o desin!

Mənim də, Vahid, öz istəklimin gözəlliyini –
Bahar zamanı gülüstanı kim görüb, o desin!

* * *

Zülfi-ənbərşikəni, ol büti-şəkkərsüxənin
Yarın vəfası olmasa, biganə neyləsin?

Pərvanə, eşqi var, dolanır şəm başına,
Şəm isə yandırır onu, pərvanə neyləsin?

Zülfündə nalə eyləsə, incitmə könlümü,
Zəncirə tab qılmasa, divanə neyləsin?

Məşuqun özgələrlə gəzir, umma xəlqidən,
Bir ev ki, getdi qarətə, həmxanə neyləsin?

Gül qönçəlikdən adət edib bivəfalığı,
Dönmüşsə bülbülün ürəyi qanə, neyləsin?

Yıxdı rəqib könlüm evin vəsli-yar üçün,
Düşmən mənəm bu zalimə, kaşanə neyləsin?

Meyxanənin şərafətini anla, badə iç,
Sərxoşluq eylədin, buna meyxanə neyləsin?

Sındır təbiətində olan cəhl şişəsin,
Sındırma məst olan kimi, peymanə neyləsin?

Vahid! Əlbəttə, yanar atəşi-qürbətdə müdam,
Həmdəm fəsad olanda həkimanə neyləsin?

* * *

Ey könül, ahəstə get gülzarə, heç kim bilməsin,
Gizli çıxmış seyrə ol məhparə, heç kim bilməsin.

Yar üçün göz yaşı töksəm, qorxuram bilsin rəqib,
Mümkün olmaz, axsa bir fəvvarə, heç kim bilməsin.

Yarı əğyar ilə görmüşlər, eşitdim, kim görüb,
Həmdəm olsun gül çəməndə xarə, heç kim bilməsin.

Ol qara zülfü sevərkən gör necə divanəyəm,
Getdim açdım sirrimi əğyarə, heç kim bilməsin.

Mən necə gizlin tutum eldən bəlasın könlümün?
Yansa pərvanə nə mümkün narə, heç kim bilməsin.

Acizanə istədim, gül ləblərindən kam alam,
Gəldi yüz min naz ilə göftarə, heç kim bilməsin.

Mən gərək, Vahid, deyəydim yarə gizlin dərdimi,
Bəlkə, yar etsin mənə bir çarə, heç kim bilməsin.

* * *

Qoy mənə kuyində yer biganə ancaq verməsin,
Can sağ olsun, sevgilim, sən yaxşı ol, sağ verməsin.

Aşiqin qanın içər yol tapsa kəmfürsət rəqib,
Zalimə versin qoturluq, tanrı dırnaq verməsin.

Bağİ-vəslindən məni məhrum edən zalimlərə,
Taleyimdən istərəm, bir xırda yarpaq verməsin.

Lalərüxlər həsrəti min dağ çəkmiş sinəmə,
Rəhm edib həqq, bir də dağ üstən mənə dağ verməsin.

Torpaq olsun çeşminə torpaq satan namərdlərin,
Mərd odur ki, düşmənə can versə, torpaq verməsin.

Badə qədrin bilməyən nadanlara bundan sora,
Söz veribdir, piri-meyxanə bir oymaq verməsin.

Ruzi fikrin çəkmə, Vahid, etiqadın pak qıl,
Xəlq edən kəs, naümid olma, dolanmaq verməsin.

* * *

Ey könül, gəl razı olma, yarı əğyar istəsin,
Bülbülü xar eyləmə, qoyma gülü xar istəsin.

Günbəgün artır gözəllər, göz görür, könül sevir,
Sevgiyə bir ölçü yox, aşiq nə miqdar istəsin...

Nazənin vaxtında bilsin gül gərək öz qədrini,
Qoymasın tər-qönçəni hər əhli-bazar istəsin.

Gözlərindən qeyri yoxdur ehtiyacı aşiqin,
Öz təbibindən gərək dərmanı bimar istəsin.

Qədridən növrəs cavanlar saldılar gülrüxləri,
Ləkəsiz yaqutu layiqdir xiridar istəsin.

“Sevgilim var”, ey deyən, bir səy qıl ki, həm səni,
Sən əsiri olduğun ol nazlı dildar istəsin.

Vahidəm, istəkli məşuqəm gözəllik şeridir,
Qoy gəlib zövq əhli məndən incə əşar istəsin.

* * *

Qəm çəkmə, könül, qoy canalan can özü gəlsin,
Min naz edən ol sevgili canan özü gəlsin.

Səyyad ovu axtarsa da, bir ləzzəti yoxdu,
Ləzzəti odur, ovçuya səhman özü gəlsin.

Bülbül eləyən nalə gülə çox əsər etməz,
Fəryadə gərək ol güli-xəndan özü gəlsin.

Biçarə qalır eşqin bəlasın çəkən aşiq,
Yox çarəsi, istərsə də, Loğman özü gəlsin.

Minlərlə bizim indi züleyxalarımız var,
İstərsə əyər, Yusifi-Kənan özü gəlsin.

Cənnət də bizim ölkəyə həsrət çəkir indi,
Minnətimizə min huriyü qılman özü gəlsin.

Vahid, bu qəzəl təkcə Mayisçün yazılıbdır,
Qoy istədiyi sevgili reyhan özü gəlsin.

* * *

Mən vermişəm öz könlümü yarə, özü bilsin,
İstər eləsin hicrilə yarə, özü bilsin.

Bilmiş, nə bəlalər gətirib başimə zülfü,
Tökmüş yenə mahi-üzarə, özü bilsin.

Yüz yol dedim, əğyar ilə gəzmə, yenə gəzdi,
Ölsəm, demərəm ona dübarə, özü bilsin.

Ol gül məni xar eylədi biganə yanında,
Bir bilmədi, çox etdim işarə, özü bilsin.

Bimariyəm ol nərgisi-məstin, ölürəm mən,
Qoy eyləməsin dərdimə çarə, özü bilsin.

Hər dərdüqəmin mən çəkirəm, kam alan özgə,
Rəhm eyləməsin qoy dili-zarə, özü bilsin.

Vahid! Məni pərvanətək ol şəmi-cəmalın
Yaxsın dəxi bundan sora narə, özü bilsin.

* * *

Ləbinin badə nə şeydir ki, səfasın versin?
Üzünün gündə nə cürət ki, ziyasın versin!

Olmasa şərbəti-ləlin dili-məcruhumuzun,
Meydə yoxdur o ləyaqət ki, qəzasın versin.

Özgə məşuqəsini istəmərəm, huri ola,
Rəbbim hər aşiqin öz mahliqasın versin.

Min bəla yar yolunda mənə çəkdirdi rəqib,
Qeyri bir söz nə deyim; tanrı bəlasın versin!

Fələkin cahinə göz diksəm əgər, namərdəm,
Eşq feyzi mənə qoy fəqr libasın versin.

Şur salmış çəmənə bülbül, əgər aşiqsə,
Bir kərə naləmin ömründə nəvasın versin!

Vahidi guşeyi-meyxanədə dəfn eylədilər,
Məst olanlar eşidib, xeyrü duasın versin.

* * *

Verməyən canını cananinə çıxsın getsin,
Kim qıyır eşqdə öz caninə, çıxsın getsin!

Vəsli-yarı sevən aşiq gərək hicranə dözə,
Dözməyən yarının hicraninə çıxsın getsin!

İndi ki gül yenə gülşəndə gəzir xar ilə,
Baxmayır bülbülün əfğaninə, çıxsın getsin!

Biz məhəbbət yolunun eşqdə rüsvaləriyik,
Kəsrdr hər o kəsin şəninə, çıxsın getsin.

Eşq mülkündə bu gündən yeni qanun qoyduq:
Hər kəs öz sevdiyinin yaninə çıxsın getsin.

Bizə öz yurdumuz əfsanə behiştdən xoşdur,
Zahid öz rövzeyi-rizvaninə çıxsın getsin.

Bilirik, Vahid, o güldən sənə yar olmayacaq,
Burax, and iç onun öz caninə, çıxsın getsin.

* * *

*Respublikanın xalq artisti*
*Həqiqət Rzayevaya həsr olunur*

Ey gül, nə incəsən, nə gözəldir təbiətin,
Sən gülməyincə, bil, üzü gülməz Həqiqətin.

Bir kimsə varmı, xatirini tutmasın əziz,
Sən bir sevimli dilbərisən bu cəmiyyətin.

Ellər kamalının, gözəlim, həsrətin çəkir,
Yox bir könül ki, olmaya onda məhəbbətin.

Vicdanın incə, məsləkü amalın incədir,
Yüksəlmiş incəliklə bütün şənü şövkətin.

Xəlqin, hökumətin, vətənin istəyir səni,
Sən də bir üzvüsən, gözəlim, incəsənətin.

Təhsinə var ləyaqətin, ey səhnə xadimi,
Ömründə az deyil vətənə, xalqa xidmətin.

Şahla mübariz oldun Ərəbzəngilikdə sən,
Çox Leyli, tellilər yaradıb feyzü qüdrətin.

Yetdinsə əlli sinninə, xalq arizu edir,
Yüzdən  ziyadə ömrü olaydı Həqiqətin.

İtməz bu zəhmətin gələcək şanlı nəsl üçün,
Tarixi-yadigar olacaq haqqü, zəhmətin.

Hər sahədə nə xidmətin olmuşsa, səhnədə
Ən mahiranə olmuş ona nailiyyətin.

Nəğmənlə, xoş səsinlə səfalandı səhnəmiz,
Bülbüllərin nüfuzunu yüksəltdi hümmətin.

Vahid, bu hörmətə, bu böyük fəxri qiymətə
Sən də təşəkkür et ki, ola, bəlkə, qismətin.

* * *

Ey şux nazənin, nə gözəldir məlahətin!
Heç kəs əsiri olmaya bir sən tək afətin!

Hər aşiqin ki, cənnəti görmək xəyalı var,
Göstər  cəmalını, gözəlim, var ləyaqətin.

Yarəb, bu məclis əhlini şad eylə hər zaman,
Qəmdən xilas qıl, üzü gülsün cəmaətin.

Olsun həmişə eyş ilə işrətdə  xəlqimiz,
Qaldır, ilahi, şənini sən bu vilayətin!

Hər kəs öz rəfiqi ilə sakit əyləşib,
Gülməkdədir şərafəti var bu ziyafətin.

Olsun o gün ki, toy eləyək nocavanlara,
Şadlıqda keçsin, ey könül, əyyami-firqətin.

Əhli-riya behişti sevir, kuyi-yari biz,
Bundan gözəl nə aləmi var baği-cənnətin?!

Bir  yanda əhli-musiqi, bir yanda əhli-zövq;
Ey xəlq, daimi yaşasın böylə adətin!

Vahid, vətən yolunda cəsarətlə şer yaz,
Xəlqin yanında yüksələcəkdir şərafətin!

* * *

Saqiya, bir bu deyil nəşəsi peymanəmizin,
Hələ bundan soradır ləzzəti meyxanəmizin.

Biz gərək badeyi-gülgunü həkimanə içək,
Pozmayaq rövnəqini məclisi-məstanəmizin.

Ayağın öpməliyik xadimi-meyxanələrin,
Bəlkə, cam içrə görək əksini cananəmizin.

Zülf şövqiylə olaq məst, bütün aqillər
Qalsın idrakinə heyran dili-divanəmizin.

Biz haman rindi-xərabatiyi-bibaklərik,
Söhbəti indi də dillərdədir əfsanəmizin.

Dərd əlindən bu qədər çəkdiyimiz nalələrə
Nə gəlir yarımızın rəhmi, nə biganəmizin.

Eşq zəncirinə Vahid də giriftar oldu,
Azdı guya, biri də artdı bu divanəmizin.

* * *

Əvvəldə gərək sevgili yarım sən olaydın,
Sərvim, çəmənim, bağü-baharım sən olaydın.

Bülbül kimi ətrafına hər gün dolanaydım,
Öz gülşənim, öz laləüzarım sən olaydın.

Bir başqa nigar eşqinə düşməzdim əzəldən,
Hərgah, gözəlim, nazlı nigarım sən olaydın.

Gülzarı gəzib, nərgisə baxmazdım ölüncə,
Ömrüm boyu gər çeşmi-xumarım sən olaydın.

Qəlbimdə səni gül kimi bəslərdim həmişə,
Dövrəmdə gəzən bülbüli-zarım sən olaydın.

Xoşdur mənə, öz Vahidinəm, eşqinə yansam,
Peyvəstə gərək dildə şüarım sən olaydın.

* * *

Netmişəm məndən, əya sərvi-rəvan, ayrıldın,
Eylədin gülşəni-ömrümü xəzan, ayrıldın.

Səcdə eylərdim o taği-qaşına sübhü məsa,
Elədin qəddimi hicrində kaman, ayrıldın.

Ağlaram bülbültək ruzü şəb, ey qönçədəhan,
Qoydun hicrində dili-zarimə qan, ayrıldın.

Məni fərhadsifət, kuhi-qəmə etdin əsir,
Məndən ol gün ki, sən, ey şəhdi-zəban, ayrıldın.

Atəşi-hicrinə öz aşiqini yandırdın,
Yetməmiş vəslinə, ey munisi-can, ayrıldın.

Xublar içrə səni əhli-vəfa bilmiş idim,
Bivəfa olmağımı etdin əyan, ayrıldın.

Vahidi-qəmzədəyəm, ağlamaq adətdi mənə,
Şahidim var bu sözə – əşki-rəvan, ayrıldın.

* * *

Meydənmi qızarmış, gözəlim, arizi-alın,
Ya əks salıb sağərə xurşidi-cəmalın?

Çin ilə Xəta çöllərini saldı nəzərdən,
Müşkin saçın, ahu baxışın, hinduvi xalın.

Sən hüsndə xurşidi-fələkdən də gözəlsən,
Ya əyri qaşından nəyi artıqdı hilalın?

Bilmərrə könüldən  qəmi-hicranı unutdum,
Ləzzət verir eşq əhlinə gülzari-vüsalın.

Çox nazlı gözəllər yetiribdir qoca dünya,
Mindən biri olmaz yenə manəndi-misalın.

Yoxdur sənə bənzər, gözəlim, bir güli-rəna,
Gülüzlülərin toplasalar cümlə mahalın.

Vahid, yenə Məcnunusan ol şuxun, eşitdim,
Biçarə, sənin də yox imiş əqlü kəmalın.

* * *

Şərəfdir aşiqə ölmək yolunda cananın,
Əsiri birdəm olunca bəlayi-hicranın.

Fədasiyəm o gülün, dil bilə, işarə qana,
İtaətində varam mən o ülvi insanın.

Məhəbbətinlə sənin hər cəfayə səbr edərəm,
İcazə ver ki, olam bir dəqiqə mehmanın.

Səninlə gizli əgər bir dəqiqə söhbət edəm,
Sədaqət ilə edərdim bu canı qurbanın.

Əgər sən olmasan, ömrüm gedər fənayə mənim,
Əlacım eylə, amandır, var isə dərmanın.

Qəza gəlirsə, nə qəm, sən mənimlə olsan əgər,
Əhatə qılsa məni min bəlası dünyanın.

Gözəllər eşqi ilə məstsən, ayılmazsan,
Sənin də bircə budur, Vahid, eybü nöqsanın!

* * *

Nə gözəlsən, gözəlim, hər kəs olur heyranın!
Yıxacaqsan bu gözəlliklə evin dünyanın.

Saçların rayiheyi-müşki nəzərdən saldı,
Gözlərin valeh edib gözlərini ceyranın.

Zalim, insaf elə, can qoymadın aşiqlərdə,
Gündə yüz mən kimi biçarə olur qurbanın.

Xəstədir könlüm o gündən bəri zülfün görəli,
Həsrətindən ölərəm, olmasa gər dərmanın.

Başqa bir fikrlə hər kim sənə kəc baxsa, gülüm,
İti xəncər kimi batsın gözünə müjkanın.

Nazəninlər səni gördükdə xəcalətdən ölür,
Vay əgər töksən üzə zülfi-əbri-əfşanın!

Vahid, ümmidi-vüsal eyləmə, biçarə, sənin
Bu xəyalət ilə axır çıxacaqdır canın.

* * *

Mənim istəklimin hər kəs ki, görə rüsxarın,
İstəməz baği-behiştin nə gülün, gülzarın.

Bülbülə öz gülü xoşdur, mənə öz cananım,
Hansı aşiqdir o ki, sevməyə öz dildarın?

Bircə biganə deyil könlümü bərbad eləyən,
Tanrı yıxsın, görüm, aləmdə evin əğyarın!

Sevgilim olsa təbibim, mənə tez çarə qılar,
Tutar öz nazik əlilə yıxılan bimarın.

Mən sevən dilbəri yüzlərcə gözəllər də sevir,
El sevər, rəsmdir, istəkli, əziz sərdarın.

Bircə yol vəsl təmənnasını etdimsə ona,
Dedi min naz ilə "yox", gözləmədim təkrarın.

Məni kim görsə deyir: yarın olub qeyrilə yar,
Bağ mənim, meyvə mənim, özgə yeyir nübarın.

Bivəfalıq sözü işlənməz idi aləmdə,
Leyli Məcnununa düz etsə idi iqrarın.

Vahid, əlbəttə, uçulmaz fələyin cövründən,
Hər bina ki, tikilə şövqi ilə memarın.

* * *

Sən bir gülüsən, sevgilim, ən tazə baharım,
Bir bülbülüyəm mən də bu qiymətli diyarın.

Bir böylə gözəllik ki, təbiət sənə vermiş,
Olmaz, gözəlim, qisməti hər nazlı nigarın.

Bir naz ilə baxmaqla yıxıb könlümü getmə!
Heç ovçu atıb getməmiş aləmdə şikarın.

Eylər bu kifayət mənə, mey zövqü nə lazım,
Hər dəm ki, düşər xatirimə çeşmi-xumarın.

Hər tari-səri-zülfdə min can var əsirin,
Mənası budur, dinlə sədasın dəfü tarın.

Xanəndəyə ver fikrini, pəjmürdə oturma,
Mənasını qan, rəmzini bil “Şur”ü “Qatar”ın.

Məqsəd sənin ovsafi-cəmalındır həmişə,
Gülşənləri fəryadı tutub bülbüli-zarın.

Vahid, mey əgər zövq verir, lakin unutma,
Hər sübh zamanında onun rənci-xumarın.

* * *

Tapşır, ey gül, zülfünə daim pərişan olmasın,
Aşiqin bülbülsifət hicrində nalan olmasın.

Bir kənar eylə üzündən, aşikar olsun üzün,
Gizlənib ruyin o zülfün içrə, pünhan olmasın.

Qətlimə fərman verib əbrulərin, müjganların,
Sineyi-suzanimə dəysin, peşiman olmasın.

Cümlə dəysin sinəmə, ox ilə parə eyləsin,
Yüz müalic eyləsə, tədbiri-dərman olmasın.

Cənnəti, hurini vəsf eylər mənə zahid, gərək
Cənnəti-əladə bir sən kimi qılman olmasın.

Seyyidi Zərgər[1] idi, Vahid, cahanda mürşüdün,
Cəhd qıl, bir nöqtə bu şerində nöqsan olmasın.

* * *

Meyxanə məclisində gərək söhbət olmasın,
Bir kəsdə söhbət eyləməyə cürət olmasın!

[1] Şair Seyid Zərgər

Söhbət xilafdır, demirəm, tərkin eyləyin,
Mey məclisində, cəhd eləyin, qiybət olmasın!

Sərxoşluq etmə, gözlə meyin ehtiramını,
Salma ayağa badəni, bihörmət olmasın!

Meydən murad zövqü səfa almaq isə gər,
Mey tək büsatə zövq yetir, nifrət olmasın!

İçdikcə əhli-halı edər huşiyar mey,
Pəjmürdələnmə, qabil otur, qəflət olmasın!

Piri-muğan o şəxsə edib badəni həlal,
Zatində şübhə yox, kim onun illət olmasın!

Sən adəm ol, ədəblə mey iç, uyma cənnətə,
Kövsər, cəhənnəmə, sənə qoy qismət olmasın!

Meydir, xülasə, ruhə qəza, bir də musiqi,
Bunlardan özgə ali gərək nemət olmasın!

Zənnim xəta deyil ki, desəm musiqi kimi,
Sənətlər içrə incə gərək sənət olmasın!

Hər elmə qiymət oldu iyirminci əsrdə,
Bir yer olurmu musiqiyə qiymət olmasın?!

Vahid, o millət ki, onun musiqisi yox,
Batsın da yerli-dibli, elə millət olmasın!

* * *

Ahəstə, bülbülüm, oxu, dildar oyanmasın!
Naz ilə yatmış ol güli-bixar oyanmasın!

Sübhün zamanı dərdi coşar binəvalərin,
Gizlində nalə çək, o cəfakar oyanmasın!

Yoxdur qəmim, oyansa o gül, arzum budur;
Yansın rəqibim odlara, əğyar oyanmasın!

Ey mahiparələr, bu gecə yar gəlməyib,
Sönsün fələkdə sabitü səyyar, oyanmasın!

Süzgün baxışla yar sevindirdi könlümü,
Görcək təbibini necə bimar oyanmasın?!

Çeşmində fitnələr yatıb o gülün, ehtiyat edin,
Mümkün deyil ki, məsti-xətakar oyanmasın!

Vahid, deyirlər, indi də meyxanələrdədir,
Öz tövbəsin ki, eylədi inkar, oyanmasın!

* * *

Görüm, ey bivəfa, zülfün həmişə şanəsiz qalsın
O canlar məskəni əğyarsız, biganəsiz qalsın.

Camalın şəminə qoy mən yanım, əğyarı yandırsın,
Şəbi-hicranı görsün, şəmsiz, pərvanəsiz qalsın.

Əgər ol zülfə məndən qeyri bir aşiq könül versə,
Bu zənciri-cünun, yarəb, görüm, divanəsiz qalsın.

Mənim əfsaneyi-eşqimlə indi zövq alır aləm,
Gərək Fərhadü Məcnun şöhrəti əfsanəsiz qalsın.

Məni məhrum edən gülüzlülər cami-vüsalindən
İçib öz bağrının qanın, meyi-meyxanəsiz qalsın.

Ədavətlə könül peymanəsin sındırma, ey zalim,
Rəva görmə, məhəbbət xanəsi peymanəsiz qalsın.

Məni ol nazlı canandan ayırmaq istəyən, Vahid.
Mənimtək min bəla çəksin, gözəl cananəsiz qalsın.

* * *

Zülfündə nə lazım, gözəlim, şanə dolansın?
Qoyma, o hərəmxanəni biganə dolansın!

Eyb eyləmə, kuyində dolansam gecə-gündüz,
Şəmin gərək ətrafına pərvanə dolansın.

Saqi! Dolanım başına, mey camini gəzdir,
Sərməst olayım, başıma meyxanə dolansın.

Ol zülfə könül vermə, deyirlər mənə, əmma
Onsuz necə bəs bu dili-divanə dolansın?

Məcnun nə bərabər mənə, səhralərə qaçdı,
Eşq əhli odur, ərsədə mərdanə dolansın!

Əğyar ilə öz yarını həmdəm görən aşiq
Düşsün gərək o dəşti-biyabanə, dolansın.

Sərxoşluq ilə ömrünü sərf eyləmə, Vahid!
Arif ona derlər ki, ədibanə dolansın.

* * *

Qoyma, gözəlim, kuyinə əğyar dolansın,
İnsafmı, gülzarı gəlib xar dolansın?!

Razı deyiləm, özgə ola məhrəmi-vəslin,
Gülzari-behişti niyə küffar dolansın?!

Könlüm quşu daim dolanır şövqi-rüxünlə,
Əlbəttə, gərək Kəbəni zəvvar dolansın.

İkrah eləmə, qamətinə zülf dolaşsa,
Sərv üstünə, bu rəsmdi, şahmar dolansın.

Rəhm et, günümü eyləmə zülfün kimi qarə,
Qoyma üzünə türreyi-tərrar dolansın.

Saldı məni peyvəstə qaşın fikrinə, zalim,
Daim belə qoy çərxi-cəfakar dolansın.

Məxmur gözün fikri edib aləmi bihuş,
Vahid necə bu şövq ilə huşyar dolansın?

* * *

Göstər, gözəlim, gül üzünü görsün, utansın,
Pərvanə sorağında gəzib odlara yansın.

Bəsdir, bu qədər məst gözün fitnə törətdi,
Baxma mənə çox naz ilə, qoy fitnə dayansın.

Zülfün əcəb ahəstə yatıb tər sinən üstə,
Tərpənsə xəta baş verəcək, qoyma oyansın.

Könlümdə nələr var, sənə neylim, demək olmur,
Yox bir elə hal əhli deyim, dərdimi qansın.

Cənnət ki, deyirlər, ona bir kimsə inanmır,
Sən göstər o gülçöhrəni, qoy aləm inansın.

Bəxtim kimi biganələrin ömrü gödəlsin,
Ey gül, təki aləmdə sənin zülfün uzansın.

Çoxdan o qara gözlərinin həsrətiyəm mən,
Alsın, gözəlim, canımı, çox qoyma, yubansın.

Neylib sənə bilməm bu fəlakətzədə könlüm,
Biçarəni bir qoymadın, asudə dolansın.

Vahid, demə, eşqində cəfa çəkdim o şuxun,
Tap bir elə aşiq ki, bu sövdadə qazansın.

* * *

Gəc baxsa kim ol mahi-cəmalə, gözü çıxsın,
Düşsün o da mən kimi bu halə, gözü çıxsın!

Öldürdü məni tənəsi hicrində rəqibin,
Gəl, bir yetişək bəzmi-vüsalə, gözü çıxsın!

Mahi-ruxini çərxdə xurşidə nişan ver,
Qalsın mütəhəyyir bu cəmalə, gözü çıxsın!

Seyri-çəmən et, qönçə ləbindən ola dilxun,
Göstər üzünü, dağdakı lalə gözü çıxsın!

Çeşmü ləbini saqiyə meyxanədə göstər,
Meytək qızarıb əldə piyalə, gözü çıxsın!

At sinəmə müjgan oxun, əğyarın həsəddən
Düşsün ürəyi, ey gözü alə, gözü çıxsın!

Vahid, mənim ol gözləri xunbarimi hər kəs
Bəd gözlə əgər salsa xəyalə, gözü çıxsın!

* * *

Olsa idi əsəri naleyi-əfğanımızın,
Yenə bir rəhmi gələrdi bizə cananımızın.

Ağlarıq sübh açılınca gecələr kuyində,
Üzü gülsün bizə, bəlkə mahi-tabanımızın.

Bizə hicran günü zülmət gecə, gündüz kimidir.
Eylə rövşəndi çirağı dili-suzanımızın.

Nazənin huriliqalər bürüyüb dünyanı,
Bundan artıq nəyi var rövzeyi-rizvanımızın?

Xəmi-əbrulərin oxşatdıq hilalə o məhin,
Üzrü məqbul deyil aləmdə bu nöqsanımızın.

Çəkdik, əfsus, əbəs zülfü siyahlar fikrin,
Səbəbi bir də budur hali-pərişanımızın.

Bu təfaxür mənə, Vahid, yetər ölsəm də əgər,
Mən də bir şairiyəm Azərbaycanımızın.

* * *

Məni atdın, gözəlim, özgələrə yar oldun,
Neyləmişdim, mənə yar olmadın, əğyar oldun?

Bivəfa olmayasan, sən mənə söz vermiş idin,
Niyə biganəyə axırda vəfadar oldun?

Mən ki hər möhnətə qatlaşmışam eşqində sənin,
Nə səbəbdən mənə sən bir gül ikən xar oldun?

Hanı ol əhdə vəfa eylədiyin günlərimiz,
Niyə əğyar kəməndinə giriftar oldun?

Min cəfa eyləyəsən, mən yenə eşqimdə varam,
Mənə, hərçənd, əzəldən də cəfakar oldun.

Heyf, o zəhmətlərə, mən çəkmişəm eşqində sənin,
Fikr edirdim mənə sən, bəlkə də, qəmxar oldun.

Özün axırda peşiman olacaqsan, bilirəm,
Mənə rəhmin dəyişib, bəlkə, tərəfdar oldun.

Vahidəm, min bu qədər cövr edəsən, mən dözərəm,
Məstsən, get hələ sən, bəlkə də huşyar oldun.

* * *

Nə üçün hüsnünə, ey gül, belə məğrur oldun?
Bivəfalıqda bütün aləmə məşhur oldun.

Niyə öz aşiqini bunca nəzərdən saldın,
Kimlər öyrətdi səni, ya niyə məcbur oldun?

Bəslədim zəhmət ilə qönçə zəmanında səni,
Niyə gültək açılıb, qeyrilə məsrur oldun?

Tutdun əğyarı, məni hicr oduna yandırdın,
Sənə biganə olan kəslər ilə cur oldun.

Özgələr məclisini güntək işıqlandırdın,
Bizə yetdikdə nə tezkən belə binur oldun?

Verdin əğyarə nişan cümlə gözəlliklərini,
Pərdeyi-zülflə görcək bizi məstur oldun.

Sən hələ, Vahid, "ənəlhəqq" sözünü vird eylə,
Bir soran olmadı səndən, niyə Mənsur oldun?

* * *

Könül, inanma o şuxə, vəfası yoxdur onun,
Həqiqi məhrəm olan aşinası yoxdur onun.

Mənim təranəmə bülbül çəməndə həsrətdir,
Mənimtək eşqdə şurü nəvası yoxdur onun.

Mən indi ki varam aləmdə, ölməyib Məcnun,
O yoxsa da, deməyin, əğrəbası yoxdur onun.

Fələkdən ummaq əbəsdir ümidi-zövqi-həyat,
Binası qüssəvü qəmdir, səfası yoxdur onun.

Təbiət aşiqidir öz yaratdığı gözəlin,
Şüursuzdur əzəldən, zəkası yoxdur onun.

Əsiri-zülfi-nigar olmayan deyil aşiq,
Başında eşqü məhəbbət həvası yoxdur onun.

Bütün gözəllərədir Vahidin bil ixlası,
Gözəldən özgə şeyə ixtisası yoxdur onun.

* * *

Mən mailəm ol yarə, bəs indi necə olsun?
Qoymuş məni avarə, bəs indi necə olsun?

Bülbül kimi çox eyləmə, gəl, nalə deyirlər,
Gül həmdəm olub xarə, bəs indi necə olsun?

Salmış məni gözdən gözəlim, nazlı təbibim,
Yox dərdimə bir çarə, bəs indi necə olsun?

Qoy el mənə divanə desin, mən ki əsirəm
Ol türreyi-tərrarə, bəs indi necə olsun?

Tərki-vətən etdim rəhi-eşqində o mahın,
Qürbətdə günüm qarə, bəs indi necə olsun?

Dindirməz əgər yar məni, olmasa əğyar,
Yalvarmayım əğyarə, bəs indi necə olsun?

Hicran qəmi, qürbət sitəmi, təneyi-əğyar...
Gəldim dəxi zinharə, bəs indi necə olsun?

Vahid! Əgər öz şəminə pərvanədir aşiq,
Mən də rüxi-dildarə, bəs indi necə olsun?

* * *

Yenə yetişdi əlim vəsli-yarə, eşq olsun
Ki, həsrət olmadım ol gülüzarə, eşq osun!

Xəzan zamanı keçib, bülbülüm, fəğan etmə,
Qızıl çiçəklər açan novbaharə eşq olsun!

O gül ki, üzmüş idim, ondan öz ümid əlimi,
O indi ətir verir laləzarə, eşq olsun!

O sevdiyim gözəlin, ah, o nazənin mələkin
Dünən camalını gördüm dübarə, eşq olsun!

Ayırmaq istər idi məndən ol nigarı fələk
Ki, düşmədim aləmi-intizarə, eşq olsun!

Çəkib kənarinə hər bülbül indi öz gülünü,
Gül isə baxmayacaq bir də xarə, eşq olsun!

Bu qara gözlüləri bunca sevmişəm, Vahid,
Nə yaxşı olmamışam bəxtiqarə, eşq olsun!

* * *

Gözəl, müşkül sənintək bir nəfər sahibcamal olsun,
Yəqin ki, bu qara gözlər belə xətt ilə xal olsun.

Dişin inci, ləbin qönçə, gözündür nərgisi-şəhla,
Bu nemətlər sənin vardır, bəşərdə bu məhal olsun.

Qılıb pürnur dünyanı günəş göy üzrə, ey məhru,
Üzün nurun ona göstər, görən tək infial olsun.

Xəyali-səhv edib, ey məh, qaşın mehrabə bənzətdim,
Xəmidə qaşlarıntək, haşəlilləh, bir hilal olsun.

O zülfə şanə vur axır pərişan eylə sünbültək,
Dili-üşşaq əgərçi istəsən aşüftəhal olsun.

Kimin zülfünə, Vahid, ehtimad etdim, könül verdim,
Cahanda görmədim bir yar məntək əhli-hal olsun.

* * *

Ey könül, sev elə cananı, güləndam olsun,
Sözü şirin, özü bir şuxi-dilaram olsun.

Hər görəndə sənə məstanə gülüşlərlə baxan
Bu nəzakətlə o bir fitneyi-əyyam olsun.

Olasan ovçusu daim elə rəna gözəlin,
Sənə ahu kimi hərdən özü də ram olsun.

Bundan artıq da səadətmi olar aşiq üçün,
Yarı həmməclis, əlində meyi-gülfam olsun?!

Bu gözəl məclisimiz, ruhə qida musiqidir,
Sakit əyləşməli, qoy musiqi itmam olsun!

Kamə yetməkliyə qoymur məni kuyində rəqib,
Xəlqi nakam eləyən kəs özü nakam olsun!

Yarı əğyar ilə görcək, demə, fəryad eləmə,
Gül ola xar ilə, bülbül necə aram olsun?

Elimiz şaddı, Vətən də gün-gündən abad,
Yaşasın sülhü sevənlər – hamı xoşkam olsun!

Qorxma, eşq aləmi axır səni bədnam etsə,
Gərək aşiqlik edən dəhrdə bədnam olsun.

Vahid, istərsən əgər, musiqidən zövq alasan,
Məclisində həm Əbülfət,[1] həmi Bəhram[2] olsun!

* * *

Yarın səri-kuyində təki məskənim olsun,
Cənnət adı çəksəm, mənə tanri qənim olsun.

Derlər mənə, məşuqun olub qeyr ilə həmdəm,
İnsafmı yar özgəsinin, ad mənim olsun?

---

[1] Müğənni Əbülfət Əliyev
[2] Tarzən Bəhram Mənsurov

Hal əhli əgər olsa rəqibim, tutaram dost,
Mən istərəm hal əhlini, xud düşmənim olsun.

Mən istəmərəm ləli-ləbi-yardan özgə,
Dünyada nə dövlət, nə də bir mədənim olsun.

Sən olmasan, ey gül, mənə hər yerdə xəzandır,
Sənsiz nə baharım, nə gülüm, gülşənim olsun.

Var özgə səfası, ola bir guşeyi-xəlvət,
Bir tək mən olum, bir də simintənim olsun.

Vahid! Bu təmənnadəyəm, əhd etmişəm, ölsəm,
Canan ilə bir yerdə gərək mədfənim olsun.

* * *

Qoyma, ey məh, üzünü zülfi-pərişan tutsun,
Niyə bu hüsnilə aləm sənə nöqsan tutsun?

Gər qələt nöqtə desəm, məshəfi-hüsnün xəttin,
Bu səbəbdən məni qoy ayeyi-Quran tutsun.

Etiraz eyləmə rüxsarına xət gəlmək üçün
Ki, gərək murü mələk mülki-Süleyman tutsun.

Tökdü məstanə gözün qanımı yüz naz ilə,
Görüm, ey şuxi-xətadidə, səni qan tutsun!

Nə atarsan, təni-suzanıma tən oxlarını,
Bunca peykanı gərəkməzmi məgər can tutsun?!

Düşdüyümçün rəhi-səhralərə, eyb eyləməyin,
Əsil divanə gərək səmti-biyaban tutsun.

Vahidəm, naləvi fəryadıma rəhm eylə, gülüm,
Qorxuram ki, səni bu naləvü əfğan tutsun.

* * *

Gülün eşqində gərək bülbüli-nalan oxusun,
Aşikar eyləməyib dərdini, pünhan oxusun!

Musiqi xadimidir bülbüli-şeyda özü də,
Gərək aşiqlə bərabər edib əfğan oxusun!

Ürəfa əhlinə dünyada cəhənnəmdir o yer,
Varıb ariflər olan məclsə nadan oxusun.

Əsr qiymətli əsərlər tələb eylər bizdən,
Elmi əşarı gərək yaxşı qəzəlxan oxusun.

Borcumuzdur, Vətən hər sahədə əmr etsə bizə,
Qoymayın tərbiyəsiz kimsəni, hədyan oxusun!

Ən gözəl nəğmeyi-Davudu düşünməz cahil,
Bu muğamatı gərək elmli insan oxusun.

İki dünyadan o bir saniyə artıqdır – əgər,
Aşiqin qəmli görüb naz ilə canan oxusun.

Bilməyən kimsə nə var arizi-cananda, gərək,
Məktəbi-eşqdə əvvəlcə "Gülüstan" oxusun.

Qarabağdır bizim öz ölkəmizin Şirazı,
Qoy bu tarixi həqiqətləri hər yan oxusun!

Hər ziyafətdə bizim adətimizdir, Vahid,
Qız-gəlin şadlıq ilə oynasın, oğlan oxusun.

* * *

Hər kəs ki desə, dərdimi dildarə mənimçün,
Guya ki, təbibimdir, edib çarə mənimçün.

Bir bülbüləm, öz naleyi-zarım mənə bəsdir,
Kim yalvaracaq güldən ötrü xarə mənimçün.

Bir lalərüxün mən yenə zülfündə əsirəm,
Gördükdə deyir xəlq günü qarə mənimçün.

Candan keçərəm, bir elə hal əhli olaydı,
Dərdim deyib ol dilbərə, yalvarə mənimçün.

Pərvanədə olsaydı əgər məndə olan eşq,
Yüz şövq ilə çırpardı özün narə mənimçün.

Heç bir kəsə razı deyiləm yar yolunda,
Minnət çəkə bundan belə əğyarə mənimçün.

Başdan-başa, Vahid, bütün aləm gözəl olsa,
Artıqdır hamından yenə Məhparə mənimçün.

* * *

Əhdü peymanı düz olsaydı gülün bülbül üçün,
Bülbülün gülşəni tutmazdı sədası gül üçün.

Lalərəng oldu piyaləm həvəsi-ləlin ilə,
Qanə döndü ürəyim nəşeyi-bihasil üçün.

Afərinlər sənə bu naz ilə can almaqda,
Sən ki varsan, daha yer qalmadı Əzrail üçün.

Ney kəsilmək sitəmindən demə, fəryada gəlir,
Ucalır naleyi-ney həmdəmi-naqabil üçün.

Rahi-cananda Züleyxa da bəlalər çəkdi,
Min sitəm gördü, o bir Yusifi-şirindil üçün.

Əgər ovsafi-cəmalı o məhin şərh oluna,
Möcüzi-həllinə aciz qalacaq təhlil üçün.

Söyləməzdim səri-zülfündəki divanələri,
Dərsi-ibrət bu əgər olmasa hər aqil üçün.

Eybü nöqsansız olan kimsə tapılımaz, Vahid,
Cəhldən qaç, oxu əşarını sən kamil üçün.

* * *

Mən ki candan keçirəm sevgili cananım üçün,
O mənim dostumu düşmən törədir canım üçün.

Sevirəm, yüz desəm ol şuxə, inanmır sözümə,
Daha yox taqətim and içməyə vicdanım üçün.

Özgə bir ovçunun ahusuna zövqüm yoxdur,
Yalnız avarəyəm öz sevgili ceyranım üçün.

Hər sevimli gülün öz aşiqi, öz bülbülü var,
Mən də bir bülbüləm öz qönçeyi-xəndanım üçün.

Bir yaxın gəlmədi, bilməm, necə xatircəm olum,
Çox kəmənd atmışam ol zülfi-pərişanım üçün.

Ölkəmin Yusifinə başqa Züleyxa nə gərək,
Min Züleyxa tapılar Yusifi-Kənanım üçün.

Bu şərafət mənə nəslən qalacaqdır, Vahid,
Nə qədər xidmət edəm Azərbaycanım üçün.

* * *

Kim ki, rəqibə minnət edir vəsli-yar üçün,
Bir əndəlibdir, sevinir novbahar üçün.

Saqi, şərabımız qutarır, yarıdır gecə,
Bir az qənaət eylə, səbuhi-xumar üçün.

Gizlində vəhşiliklə mey içmək həramdır.
İnsan kimi həram deyil aşikar üçün.

Çox dərd var ki, çarə tapıblar təbiblər,
Bir çarə olmayıb ələmi-intizar üçün.

Bir qarə gözlü könlümü əsir edib mənim,
Yorğun düşən bir ovçuya bənzər şikar üçün.

Aciz xəta qılırsa, ətayə ümidi var,
Heç yerdə yox xilas yolu zülmkar üçün.

Vahid, darıxma, qoy gözü çıxsın rəqibinin,
Yaz yaxşı şerlər Vətənə yadigar üçün.

* * *

Nigarım gül üzündən eyləməz bir dəm cüda zülfün,
Qurub könlüm quşun seyd etməyə damə bəla zülfün.

Qılır zülfü kimi qarə günüm şamü səhər, ey dil
Ki, hərdəm gül cəmalinə tökər o məh qəra zülfün.

Olur eşq əhli aşüftə, qalır kim, zarü-sərgərdan,
Edər aşüftə könlümtək, dəyər badi-səba zülfün.

Olur xoş bu cahan sərtasər, ey dil, vəchi var, billah,
Edəndə naz ilə şanə o gülrux müşkasa zülfün.

Görüb, Vahid, xəyal etdim üzündə zülfi-pürçinin
Ki, guya gənc üstündə yatıbdır əjdaha zülfün.

* * *

Xəbərin yox, gözəlim, könlüm edib qan zülfün,
Eyləmə gül üzünə bir də pərişan zülfün.

Yetməsin kamə vüsalindən edən aşiqini,
Razıyam, könlüm evin eyləsə viran zülfün.

Əl vuranda sən ona naz ilə, könlüm üzülür,
Nazəninim, daha tərpətmə səbadan zülfün.

Daima məst gözün fitnələr öyrətmiş ona,
O səbəbdəndir, edib aləmi heyran zülfün.

Sənə bir dəfə baxan aşiqi min dərdə salır.
Adət etmiş bu cəfa etməyi çoxdan zülfün.

İstədim, bir də tamaşa eləyim gül üzünə,
Gör nə zalımdı, mənə vermədi imkan zülfün.

Dərdli Vahid kimi hər gün dəli-divanə olar,
Görsə gər bir dəfə hər aşiqi-nalan, zülfün.

* * *

Gələndə sübh zamanı sədası bülbülümün,
Alır bu canımı şurü nəvası bülbülümün.

Fədasıdır o da məntək gülüzlü bir gözəlin,
Bu xəstə canım olaydı fədası bülbülümün.

Bəlayə səbr edə bilmir, şikəstəxatirdir,
Nə varsa, qoy mənə gəlsin bəlası bülbülümün.

Mənim kimi o da biçarədir, fələkzədədir,
Nə var təbibi, nə dərdə dəvası bülbülümün.

Həmişə künci-qəfəsdə əsiri-möhnətdir,
Nədir sübut eləyən, yox cəzası bülbülümün.

Məhəbbət əhli bəladən ölüncə qurtarmaz,
Başında çoxdur hələ macərası bülbülümün.

Cəmali-yarə baxıb, Vahid, hər səhər yalvar
Ki, müstəcab olur hər bir duası bülbülümün.

* * *

Göstər, ey gül, üzünü bülbüli-şeyda gülsün,
Gözlərin şövqi ilə nərgisi-şəhla gülsün.

Çıx çəmən seyrinə bu hüsn ilə, bu qamət ilə,
Gül sevinsin, gözəlim, sərvi-dilara gülsün.

Aç, dağıt naz ilə Leyla kimi zülfün üzünə,
Dərdli aşiqlərinin eşqinə səhra gülsün.

Gəzmə bundan belə biganə ilə, qorxum odur,
Bivəfa söyləyib aləm sənə, dünya gülsün.

Sevgilim, indi cəsarət günü, mərdlik günüdür,
Qoyma, öz aşiqinə hər yetən ədna gülsün!

Ağlamaq eşqdə aşiqlər üçün nöqsandır,
Ki, gərək Yusifin eşqində Züleyxa gülsün.

Vahid! Aşiq isə, Məcnuna deyin ağlamasın,
Gəlsin etsin bu gözəl şuxə tamaşa, gülsün!

* * *

Etdi pünhan zülf içində ol mələksima üzün,
Gizləmiş əbr içrə san məhru-cahanara üzün.

Leyli saçlı bir pəri Məcnuna döndərmiş məni,
Rəhmə gəlməz, tutsa da ahım odu dünya üzün.

Yüz gözəl öz sevgilimdən başqa, açmaz könlümü,
Şübhəsiz, Məcnuna göstərsin gərək Leyla üzün.

Yarsız, gül üzlü canansız büsati-badədə
Qan olur könlüm, gözüm görsə meyi-həmra üzün.

Yüz könül min naz ilə baxdıqca qan etsin gərək,
Göstərincə aşiqə bir dəm o gül rəna üzün.

Bir mənim könlüm deyil divanəsi məhrulərin,
Mən kimi yüzlərlə məcnunlar tutub səhra üzün.

Zülfdən, divanədəndir hər sözün, Vahid, yenə,
Göstərər bir gün sənə ariflər istehza üzün.

* * *

Olmuşam bir bimürüvvət yar əlindən dilfikar,
Eylərəm cövrü cəfasından o şuxin ahü zar.

Şəksiz, aləmlər olur rövşən əgər zülmət isə,
Əbri-zülfün eyləsə ol mahim üzündən kənar.

Aşiqi-dil xəstəyə verməz zəkati-hüsnünü,
Sayilə, bu rəsmdir kim, lütf qılsın tacidar.

Ey könül, səbr et xəzani-hicrə, adətdir bu kim,
Ruzi-əzzəldən yazıblar hər xəzanə bir bahar.

Dilbəra, püstanmidir, sinədə ol təppə nədir,
Ya ki, sərvə yel dəyib, gülşəndə titrər iki nar?

Dami-zülfün, danə xalındır, məgər ruyin çəmən,
Gözlərin səyyadtək dil mürğünü eylib şikar.

Vahida, yaz bu sözü gər yoxdu, qeyri mümkünün,
Ta hüzuri-Vaqifi ustadə eylə bir güzar.

* * *

Fələk, bu hali-zarimdən mənim əhli-cahan ağlar,
Fəraqi-yaridə könlüm edib hərdəm fəğan ağlar.

Gözümdən caridir əşkim, misali çeşməyi-Ceyhun,
Düşə bir qətrəsi ümmana, izhari-nihan ağlar.

Yamandır aşiqin ahı, deyirlər, imtahan olmuş,
Tuta bir dəfə gər yarı, yəqinən hər zaman ağlar.

Tapılmaz heç də dərmanı, olar daim gözü giryan,
Mənim tək bəstəri-qəmdə verər həsrətlə can, ağlar.

Görə gülşəndə gər bülbül gül ilə xarı bir yerdə,
Bəziri-pər çəkib güllər, olunca ta xəzan ağlar.

Uçub mürği-könül təndən, dolanır kuyi-dilbərdə,
Çəkər yari-sitəmkarə, fədai-əlaman, ağlar.

Nigara, Vahidi giryan qılıbdır cəzbeyi-eşqin,
Edibdir sərvi qəddin firqətin misli-kəman, ağlar.

* * *

Düşəndə türreyi-dilbər xəyalə axşamlar,
Məhəbbət əhli düşər min məlalə axşamlar.

Şikəstə bülbülə bənzər bəla çəkən aşiq,
Gülündən ötrü edər ahü nalə axşamlar.

Gündüzlər aşiqə tən etmə ki, gülüb danışır,
Salar fəraqın onu, gör, nə halə axşamlar.

Düşəndə zülfün üzə, qaşların xəyalə gəlir,
Batanda gün baxar aləm hilalə axşamlar.

Şərabı yarsız içsən, bir az da qəm gətirər,
Gülüzlü yar ilə ol həmpiyalə axşamlar.

Bir özgə ləzzəti var, aşiq ilə məşuqə
Rəqibsiz yetələr gər vüsalə axşamlar.

Müyəssər olmasa gündüz sənə şərab içmək,
Unutma, Vahid, onu laməhalə axşamlar.

* * *

Sən əgər olmasan, ey gül, mənə canan kim olar?
O xumar gözlərinə valehü heyran kim olar?

Sevir aləm səni bir gözlərinin xatirinə,
Yoxsa tək zülfün üçün bunca pərişan kim olar?

Gir gülüstanə, sevinsin, oxusun bülbüllər,
Gül bahar mövsümü görsənməsə, xəndan kim olar?

İncidib salma nəzərdən düşən aşiqlərini,
Əhli-eşq olmasa, kuyində nigəhban kim olar?

Zövqi-vəslinlə əgər mən də fəğan eyləməsəm,
Hüsnünün gülşəninə bülbüli-nalan kim olar?

Çox demişlər sənə, cövr eyləmə biçarələrə,
Aqibətdə görək, ey şux, peşiman kim olar?

Ölməmişkən, gözəlim, Vahidə qiymət verir el,
O da getsə, vətənə, xalqa qəzəlxan kim olar?

* * *

Məh cəmalından, nigarim, əbri-zülfün qıl kənar,
Çahi-zülmətdən tülu etsin gün, olsun aşikar.

Dur müqabil ay ilə, zülfün götür ruxsardən,
Gün cəmalın mahi-nov gördükdə olsun şərməsar.

Zülfi-ruyin görsə bir gər bağban ruxsardə,
Hərgiz etməz meyli-sünbül nə xəyal, ey naləzar!

Zülfün içrə şöl edər şəmi-cəmalın dövrəsin,
Mürği-dil yanmaqlıq istər ruzü şəb pərvanəvar.

Badeyi-eşqin içə hər kim sənin, ey qönçə ləb,
Məst olur, ta var nə qədr ömrü, olmaz huşyar.

Kəc dolanır çərxi-dun daim mənimlə, qeyrə düz,
Tərk qılmaz bir cəfa rəsmin bu çərxi-kəcmədar.

Məcnunasa mən dolandım çölləri, ey Leylivəş,
Həmdəmim vəhşü təyur oldu, məkanım kuhisar.

Yadigar hər kimsədən bir növ qaldı dəhrdə,
Bu qəzəl də Vahidi-biçarədəndir yadigar.

* * *

Dövri-ruyində saçın hərb nizamində durar,
Gözlərin mərdumi nəzmiyyə məqamində durar.

O kəs əbrulərinin vəhmi könüldən getməz,
Bənzər ol tiqə ki, peyvəstə niyamində durar.

Mərdümi-çeşminə kirpiklərin eylər təzim,
Gəlsə sərkərdə, qoşun əhli səlamində durar.

Dil gözündən yana qaçmaz saçın ənduhindən,
Bənzər ol bəsteyi-zindanə ki, zamində durar.

Yar üçün eşqdə minlərlə bəla çəkdi könül,
Yenə öz sevdiyi məqsudü məramində durar.

Parlayar çöhreyi-qəsrində səadət günəşi,
Hər kimin dəhrdə dövlət quşu damində durar.

Göstərir Vahid həqiqətdə cəmali-yari,
Saqinin mey dolu hər əksi ki, camində durar.

* * *

Heyf, bir bilmədin, ey gül, dili-zarımda nə var!
Eşqimin sirri nədir, eyləyə bilməm izhar.

Qana dönmüş ürəyim axtarır hər yerdə səni,
İmtahan etmək üçün sinəmi aç, qəlbimi yar!

Qorxuram, şanə dəyər könlümə, zülfündə gəzir,
Eşq sərgəştəsinə qoyma, toxunsun əğyar.

Tərləmiş gül kimi gördüm səni biganə ilə,
Xəstədir könlüm o gündən, gözəlim, leylü nəhar.

Aşiqin görməsə rüxsarini, baxmaz çəmənə,
Nə qədər laləvü gül açsa, min il olsa bahar.

İldırım sürəti var tiri-nigahında məgər?
Maili-eşqin olan hüsnünə baxdıqca yanar.

Vahidəm, naz ilə gəl bir belə incitmə məni,
Nola bir dəfəlik al canımı, qəmdən qurtar!

* * *

Misli-zəncir keçib gərdənimə türreyi-yar,
Mənə divanə deyir, cümlə xəlayiq nə ki var.

Gülşəni-hüsndə bir dam qurub zülfündə,
Qıldı səyyad gözün könlümü ol damə düçar.

Dəhənin sirrinə yol tapmadım, ey qönçədəhən,
Getdi əldən nə qədər fikr elədikcə yoxü var.

Çeşmi-bimarımı gülşəndə görüb nərgis, odur,
Oldu kəc gərdəni, heyrətlə baxır məstü xumar.

Eylərəm nalə, səni qeyrilə görsəm, necə kim
Bülbül ağlar, görə gülşəndə gülün həmdəmi xar.

Qeyrilər bəzmini şəmi-ruxin eylər rövşən,
Aşiqi-zarın edərsən gününü tirəvü tar.

Tovqi-zülfü o şəhin boynuma keçmiş, Vahid,
Söyləyirlər mənə divanə, xəlayiq nə ki var.

* * *

Könül, ol şuxə yaxınlaşma, onun əngəli var,
Bivəfanın nə olur axırı, nə əvvəli var.

Məndən ayrılmaz idi sevdiyim öz canımdı,
Aramızda, görünür, gizli rəqibin əli var.

Çox çətin tərk eləsin aşiqə zülm eyləməyi,
Nə qədər indi cavandır, hələ gəlhagəli var.

Aşiqi naz ilə incitməsə, dincəlməz o gül,
Bu gözəllər arasında nə qədər işvəli var!

Bir gözəl ki, atıb öz yarını, əğyarı tuta,
Qoru ondan özünü, axırı bir cəncəli var.

Bürüyüb Leyli məlahətli gözəllər vətəni,
Demə "Məcnun" mənə, yüzlərcə mənimtək dəli var.

Vahid, ancaq bu vəfasızları məndən xəbər al,
Xatirimdə oların gör neçə cür heykəli var.

* * *

Üzündə busədən, ey gül, iki nişan yeri var;
Birində qırmızılıqdır, birində qan yeri var.

Gözündə vardır ox atmaq, müjəndə qan tökmək,
Qaşında səhv deyildir, desəm, kaman yeri var.

Saçın tutanda üzarə belə xəyal edirəm;
Çəməndə bərgi-gül üstə qara duman yeri var.

Bəlayə salma məni, dərdü möhnətim çoxdur,
Nə dildə tab qalıbdır, nə də təvan yeri var.

Vəfası olmasa da, yardan əl üzmə, könül!
Gələr tərəhhümə bir gün, yenə güman yeri var.

Rəqibə həmdəm olub, dilbərim küsüb məndən,
Belə güman edirəm, bəlkə bir uman yeri var?

Vəfalı söylədiyin çıxdı bivəfa axır,
Sənin sözündə də, Vahid, bir az yalan yeri var!

* * *

Hər kəsin dəhrdə səntək, gözəlim, dilbəri var,
Xoş onun halına, dünyada nə dərdi-səri var?!

Qorxuram, naz ilə çox baxma, yaman göz çoxdur,
Hər görən söyləyir həsrətlə: "Əcəb gözləri var!"

Düşün öz qədrini, aldatmaya biganə səni,
Əlli yerdən, gözəlim, gözlərinə müştəri var.

Gözlərin bir yana, kirpiklərinə heyranəm
Ki, dəlir bağrımı hərdən, elə bil, neştəri var!

Bir dönüb baxmaq ilə aləmi zəncirə salır,
O qara zülfünün, ey məh, nə yaman şakəri var!

Böylə bir dami-bəladən necə qurtarmaq olur?
Gözlərin tək, gözəlim, saçlarının rəhbəri var.

Vəslə yetcək nə üçün sirrini əğyarə dedin?
İndi, Vahid, səni dindirməsə canan, yeri var!

* * *

“Musiqi məclisinin türfə əlamətləri var,
Guş qıl, gör necə cansuz hekayətləri var”[1]

Musiqi zövqünə ol kəs ki, deyildir vaqif,
Bu büsatın nə bilir ki, nə şərafətləri var.

Tarı bihudə hesab etmə, əgər arifsən,
Gör ki, məhrulər əlindən nə şikayətləri var!

O da bir zülfi-siyəh dilbərin aludəsidir
Ki, sədasında pərişanlıq işarətləri var.

Xar zənn etmə, saqın, musiqi xadimlərini,
Onların zövqünə gir, gör, nə nəzakətləri var!

Musiqi qəm dağıdır, zövq verir insanə,
Dərk qılmaz bunu onlar ki, səfahətləri var.

Şairin, musiqi xadimlərinin, rəssamın,
İncə diqqətlə düşün, gör nə məharətləri var!

Musiqi zövqü Hülakulərə təsir etmiş;
Oxu tarixi, gör orda nə rəvayətləri var.

Məscid əhli nə bilir musiqi zövqün, Vahid!
Çünki cahildilər olduqca, cəhalətləri var.

* * *

Bu dilbərin nə gözəl, aşiqanə gözləri var,
Nə yaxşı canalıcı, məhrəmanə gözləri var!

Bütün gözəllər içində bu nazənin gözəlin
Gözəlliyindən əlavə, yeganə gözləri var.

[1] Beyt Səməd Qəribindir

Bu dilrüba gözəlin qan töküb, can almaqda
Qəribə cazibəli, mahiranə gözləri var.

Baxanda, ey könül, ol şuxə ehtiyat ilə bax,
Saqın ki, canalıcı, dilbəranə gözləri var.

Görəndə aşiqi min naz ilə işarə edir,
Ümumi cəzb eləyən arifanə gözləri var.

Bir özgə dilbərə, Vahid, deyilməmiş bu qədər,
Bu afətin nə gözəl, şairanə gözləri var!

* * *

Nə dərd olursa, qələtdir, deyillər, çarəsi var,
Əlacı olmaz o şəxsin ki, dildə yarəsi var.

Fəğanü naləmi, ey məh, yetirmə əflakə
Ki, yandırar səni, bu atəşin şərarəsi var.

Fəğani-aşiqi, ey gül, düşünmə bihudə
Ki, eşq gülşəninin mən kimi həzarəsi var.

Bu qədr gəl məni ağlatma, rəhm qıl, cana,
Gecə-gündüz gözümün qanlı bir fəvvarəsi var.

Bu günə qanımı tökməzdi tiri-müjganın,
Bu işdə qaşlarının, çox güman, işarəsi var.

Münəvvər eyləyən afaqı ahım atəşidir,
Bu çərxi-kəcrəvişin sanma kim, sitarəsi var.

Bu eşq bəhrinə, Vahid, o növi qərqəm ki,
Nə bir nicatə ümidim, nə bir kənarəsi var.

* * *

Könül, bu naz eləyən məhliqalərin nəyi var?
Cəfadan özgə bu zülfi qarələrin nəyi var?

Bir azca qəm dağıdan bunların gözəlliyidir,
Bu da gər olmasa, bu bivəfalərin nəyi var?

Yenə təsəlli verən aşiqə gözəllərdir
Ki, yoxsa qüssə çəkən mübtəlaların nəyi var?

Şikəstə ney kimiyəm, başqa həmdəmim yoxdur,
Havayi-eşqə düşən binəvalərin nəyi var?

Ümidi-mehrü vəfa umma aşinalərdən,
Özün də fikr elə, gör aşinalərin nəyi var?

Sədayi-musiqi etsin gərək könülləri cəzb,
Ürək sıxan, yolu xaric sədalərin nəyi var?

Üzündə dilbərimin türrələr; təəccübüyəm,
Xəzinə üstə bu kəc əjdahələrin nəyi var?

Rəqibi qoymayınız, kuyi-yarə yol tapsın,
Behişt içində bu xain gədalərin nəyi var?

Ümumə xidmət elə, qorxma, Vahid, artarsan,
Özü özün bəyənən xudnümalərin nəyi var?

* * *

Bu nazənin gözəlin yaxşı dilgüşalığı var,
Heyif, öz aşiqinə çox kəmetinalığı var.

Gözəlliyilə bərabər, sevimli dilbərdir,
Nə qeyrilərlə yaxındır, nə aşinalığı var.

Demə, gözü, qaşıdır artıran məlahətini,
Bulardan artıq hələ xalının qaralığı var.

Necə bu hüsn ilə mən ol nigarə Leyli deyim,
Onun ki, eşqdə Məcnuna bivəfalığı var?!

Gədayi-kuyi olan böylə nazənin gözəlin,
Diyari-eşqdə dünyayə padişahlığı var.

Həqiqət aşiqi pərvanədir, get, ey bülbül,
Sənin fəğanın, onun zarü binəvalığı var.

Nə rütbə istəmə, Vahid, nə şöhrət aləmdə,
O kəs ki, rütbəpərəst oldu, bil gədalığı var.

* * *

Gərçi məhəbbət aləminin çox səfası var,
Hər qarə zülfə meyl edənin min bəlası var.

Aşiq şikayət eyləməz, hər cövrə səbr edər,
Pərvanə sanma, atəşə yansa, nəvası var.

Hər aşinayə söyləmək olmaz, vəfası yox,
Çək imtahanə, bəlkə, bir əhli-vəfası var.

Qoyma qədəm, diyari-məhəbbət bəlalıdır,
Nə ibtidasi var, nə də ki, intəhası var.

Səbr ilə gün keçirə gərək əhli-eşq olan,
Hər dərd olursa, axırı bir gün dəvası var.

Bir daş ürəkli dilbərə çoxdan vurulmuşam,
Nə rəhmi var, nə dostluğu var, nə ədası var.

Şairlər içrə sanma, hünərsizdi Vahidi,
Vahid nə olsa da yenə, bil, iddiası var!

* * *

Fəxr eyləmə, ey bülbüli-şeyda, çəmənim var,
Qoy fəxr eləyim mən ki, gözəl bir Vətənim var!

Namərdəm, əgər huriyü qılmana dəyişsəm,
Gülzari-Vətəndə o gözəllər ki, mənim var.

Fəxr olmasa, Fərhadı, deyərdim, mənəm əsrin!
Minlərcə mənim xosrovi-şirinsüxənim var.

Baxdıqca bu gülrüxlərə artır yenə eşqim,
Bundan belə dünyada nə dərdü-mihənim var!

Məcnuniyəm hər bir uca boylu, qara zülfün,
Ey müddəi, gəl gör necə sərvü səmənim var!

Gəncəm, gözələm, xəlqimin istəklisiyəm mən,
Qiymətli göhər tək Vətənimdə sevənim var!

Vahid, mənə təklif eləmə özgə nigarı,
Öz sevgilim, öz dilbəri-nazikbədənim var!

* * *

Ey gül, mənə hər cövr eləyirsən, xəbərim var,
Bir gün yaxar axır səni ahim, səhərim var!

Leyli nəçidir, hüsnün ilə bəhs edə bilsin,
Məcnun nədir, ondan mənim artıq hünərim var!

Görcək məni, min naz ilə gizlətmə cəmalın,
Pis göz sənə dəyməz, gözəlim, xoş nəzərim var.

Aləm yığıla, dərdimi mindən biri bilməz,
Zülfün həvəsilə o qədər dərdi-sərim var.

Hind əhlinə göstər, gözəlim, çeşmlə zülfün,
Fəxr etməsin ahuyi-Xütən – müşki-tərim var.

Cananla mey içdikdə rəqibin gözü çıxdı,
Od tutdu, alışdı, ona bildi zərərim var.

Sultanlara baş əymərəm, hərçənd, fəqirəm,
Xoşdur mənə, səntək, gözəlim, taci-sərim var!

Vahid, hələ az yazmısan övladi-vətənçün,
Çox yerdə gedib lovğalanırsan, əsərim var.

* * *

Təmənna et, gülüm, verrəm, yolunda nəqd canım var,
Əgər bülbül deyilsəm, ondan artıq min fəğanım var.

Qara gözlər səni aldatmasın, bimaram eşqində,
Əlacım qıl, sənə, ey gül, mənim təkcə gümanım var.

Qəbul etsən, yolunda canımı yüz yol fəda qıllam,
Əsiri-eşqinəm, sənsiz bu aləmdə xəzanım var.

Əmanət saxla qəlbində ölüncə eşqimin sirrin,
Həqiqi aşiqəm, eşqində çeşmi-xunfəşanım var.

Alıb bu canımı, birdəfəlik qurtar əziyyətdən,
Baxılsa könlümə, eşqində min sirri-nihanım var.

Səni hər şeydən artıq sevmişəm aləmdə, ey zalim!
Qəza gəlsin də qaçmam, rahi-eşqində təvanım var.

Məni hər bivəfaya, Vahidəm, tutma bərabər kim,
Mənim də eşq mülkündə, əzizim, adü sanım var.

* * *

Zülfün kimi, ey gül, nə ətirli nəfəsin var!
Yoxsa bu lətafətlə can almaq həvəsin var?

Ruhum dirilir, naz ilə hərdəm ki, gülürsən,
Heyrətdəyəm, ey gül, nə məlahətli səsin var!

Tavus kimi azadə gəzirsən bu çəməndə,
Bülbül kimi nə xar qəmin, nə qəfəsin var.

Fəryadına yetdiklərin imdadına yetməz,
Fikr etmə, bu aləmdə, könül, dadi-rəsin var.

Vahid, mənim istəkli gözəl yarıma bənzər
Axtar bütün aləmdə, görək hansı kəsin var?!

* * *

Bir bilmədim, ol afəti-candan nə xəbər var?
Məcnuna o Leylayi-zamandan nə xəbər var?

Az-çox bilirik biz, bu tərəflərdə nə olsa,
Lakin nə bilək indi, o yandan nə xəbər var?

Gül fəsli-bahar olmasa, gülşən də bilinməz,
Bülbül bilər əyyami-xəzandan nə xəbər var!

Gizlindir o məhparə o gündən ki, gözümdən,
Heç bilmirəm, övzayi-cahandan nə xəbər var.

Yar olduğu yerdən sizə bir namə gəlirmi?
Biz qafilik ancaq, o məkandan nə xəbər var?

Göz yaşını etsin gərək eşq əhli rəvanə,
İstərsə gər, ol sərvi-rəvandan nə xəbər var!

Vahid, mənə min naz oxu hər gün yenə xoşdur,
Bilsəm əgər, o qaşı kamandan nə xəbər var?!

* * *

Bilsən sənə, ey gül, nə qədər hörmətimiz var,
Bir gün yetərik vəslə, əgər qismətimiz var.

Heç kimsə bu naz ilə səni bəsləyə bilməz,
Xoşdur, sənə qarşı nə qədər zəhmətimiz var.

Biz neyləyirik cənnəti, ya baği-behişti?
Öz bağımız, öz solmayacaq cənnətimiz var.

Bülbül də bizim, gül də bizim, el də bizimdir,
Kimdən, gözəlim, indi bizim minnətimiz var?

Qorxma, bizi bir qüvvə pərişan edə bilməz,
Zülfün sayı, bil, eşqdə cəmiyyətimiz var.

Dağlar hərəkət etsə də, hətta bizə qarşı,
Dəf etməyə aciz deyilik, hümmətimiz var.

Qüvvətli təbiət də bizə baş əyir indi,
Eşq əhliyik, hər yerdə bizim qüdrətimiz var.

Qüdrətli zəfər bayrağı parlar əlimizdə,
Azadəliyə, sülhə böyük rəğbətimiz var.

Biz fəxr eləsək, haqlıyıq insanlığa, Vahid!
Xalqa, vətənə bir bu qədər xidmətimiz var.

* * *

Canın istər, ol deyil aşiq ki, canandan keçər,
Aşiq oldur, mən kimi canan üçün candan keçər.

Mən qılma türreyi-canandan, ey vaiz, məni!
Hansı bir divanə ol zülfi-pərişandan keçər?

Şeyx Sənanə məzəmmət qılma, ey naseh, əbəs!
Görsə hər kəs ol büti-tərsanı imandan keçər.

Xaki-kuyin bilsə zahid baği-cənnət olduğun,
Uymaz ol əfsanə fikrə, baği-rizvandan keçər.

Xizr əgər ömründə bir dəm görsə zülfüləlini,
Tərk edər zülmat seyrin, abi-heyvandan keçər.

Bu nə möcüzdür, qılıb heyran sərasər aləmi,
Mah rüxsarın görən mehri-dirəxşandan keçər?

Maili-qəddü rüxün, ləli-ləbin aludəsi
Qönçəvü gül istəməz, sərvi-gülüstandan keçər.

Dişlədin ləlin, könül, vəhm eylə, qanundan saqın,
Sanma ol bimehr rəhm eylər sənə, qandan keçər.

Vahida, sərraf olan görsə o şuxun ləblərin,
Meyli-yaqut eyləməz, ləli-bədəxşandan keçər.

* * *

Məşuqə gərçi aşiqənazü itab edər,
Aşiq şikayət eyləməz, hər cövrə tab edər.

Min dəfə cövr edib mənə bu mahparələr,
Bir dəfəsi yazılsa əgər, yüz kitab edər!

Mən aşiqəm, dedim, dedilər: – Ey əsiri-eşq,
Bir dərdə düşmüsən ki, əlacın şərab edər.

Bir an şərabım olmasa, dərd öldürər məni,
Hər kim bu dərdə çarə edə, min səvab edər.

Dağlarda lalələr qədəhi doldu jalədən,
Gülgün şərabə qəmli könüllər şitab edər.

Cana, ləbindən eylə bu dərdin əlacını,
Əğyarə sirr söyləməyə dil hicab edər.

Ya al bu canı, ya ki, düzəlt ehtiyacımı,
Bu həsrət atəşi məni, yoxsa kəbab edər.

Vahid, o şuxə dərdini de cami-vəsl ilə,
Bir lütf göstərərsə, səni feyziyab edər.

* * *

Aşiqin görcək rəqib ilə səni fəryad edər,
Rəsmdir, bülbül gülü xar ilə görsə, dad edər.

Lütf edib, ey sərvi-qədd, ruhim, xilas et cismdən,
Şahi-adil həbsdən məhbusini azad edər.

Qan olur bülbül kimi bağrı şikəstə aşiqin,
Har zaman kim gülşən içrə ləli-nabin yad edər.

Naz ilə qılsa xuram eşq əhlini ol ahuvəş,
Şəksizdir kim, dalınca gəzdirib, səyyad edər.

Gəlsə bir dəfə xuramə ol qəddi-sərvi-rəvan,
Həşri-kübradən əlamətlər yəqin bünyad edər.

Qeyz ilə qılsa nəzər bir dəfə əhli-aləmə,
Bu cahan mülkün nigahi-tünd ilə bərbad edər.

Vahida, bifəhmli bilməz kəlamin qədrini,
Necə hikmət bilməyənlər hikmətə irad edər!

* * *

Ey gözüm, aləmi-insanlığa məhrəmsən əgər,
Sakit ol məclisi-meyxanədə, adəmsən əgər.

Ürəfa əhli üçün məclisi-mey cənnətdir.
Qoyma bu bəzmə qədəm, əhli-cəhənnəmsən əgər.

Mey içib, sərxoş olub, özgəni təhqir eləmə,
Sən öz ətvarını təhqir elə, sərsəmsən əgər.

Ölçüdən xaricə çıxma, yıxar axır səni mey,
Tutalım ki, hamıdan içkidə möhkəmsən əgər.

Məstü mədhuş zamanında bir ayinəyə bax,
Özün öz əksini təsvir elə, ələmsən əgər.

Gör səni badə nə halə salıb, ey xanəxərab!
Ağla öz halına bir dəm, nola, xürrəmsən əgər!

Heyfdir badəyə sərf etdiyin ol şanlı həyat,
Bilik uğrunda onu sərf elə, hatəmsən əgər.

Mübtəladır bu bəlayə, demə Vahid özü də,
Onu da elm ilə təşviq elə, adəmsən əgər.

* * *

Zülfünə naz ilə hərdəm o pəri şanə çəkər,
Könlümü bənd edib ol zülfi-pərişanə çəkər.

Gülşəni-hüsndə zülf içrə qoyub xali-siyəh,
Könlümün mürğünü ol damə tərəf danə çəkər.

Daim əğyarım ilə məhrəm olub cananım,
Mübtəla aşiqi gördükdə üzün yanə çəkər.

Həvəsi-zülfü məni çəkdi biyabanə tərəf,
Eşqi-Leyli necə Məcnunu biyabanə çəkər!

Etmə eşq əhlinə bihudə məzəmmət, zahid!
Nə qanırsan, bu bəlakeşləri, aya, nə çəkər?

Bu qara gözlü gözəllər məni divanə kimi
Zülf zəncirinə bağlar, hərə bir yanə çəkər.

Alır əğyar səfa türreyi-müşkinindən,
Müttəsil dərdini ancaq dili-divanə çəkər.

Atəşi-eşq ilə, Vahid, yanıram, mən bilirəm,
Şəm odundan onu ki, hər gecə pərvanə çəkər.

* * *

Məni görən kimi yarım özün kənarə çəkər,
Kənarə naz ilə biganəni dübarə çəkər.

Nə söz dedim o gülə, məndən inciyib getdi?
Bizim barışmağımız yengi il baharə çəkər.

O qarə xalları yarım yenə düzüb üzünə,
Fələk necə günün ətrafına sitarə çəkər.

Bu eşq məclisini "Şur"ə istəsək, gətirək,
O "Rast" pərdələrin tarzən "Qatar"ə çəkər.

Bir az da zövqə gəlib sakit olsa məclisimiz,
İnan ki, musiqimiz düz sabah naharə çəkər.

Mənim öz istədiyim nazəninlərin əksin
Təbiətin əli yüzlərlə mahiparə çəkər.

Görəndə şəmi-cəmalın bu mahiparələrin,
Vücudum eşqdə pərvanətək şərarə çəkər.

O laləüzlüyə, Vahid, nə pislik eyləmişəm?
Mənim bu sinəmə qəm dağın aşkarə çəkər.

* * *

Kimdə vardır, gözəlim, səndə olan cazibələr
Sənə dünyada məgər aşiq olan də qəm elər?

Bəsdir, öldürməyəcəksən, gözəlim, dünyanı,
Hər üzü göyçək olan da bu qədər çəm-xəm elər?!

Qaş-göz atma mənə, biganə paxıllıqdan ölür,
Az qalır, bağrına girsin o əyilmiş qəmələr.

İncimə, göz yaşı axsa, səni gördükdə, gülüm,
Gül göründükdə bahar fəsli bulud şəbnəm elər.

Nazü qəmzən, yerişin, şux baxışın aləmdir,
Bir də zülfün üzə töksən, o da bir aləm elər!

Heyfsən, gəzmə, yaraşmaz sənə, biganə ilə,
O açıb sirrini dünyaya, səni məhrəm elər.

Vahidəm, ömrümü mən eşqlə sərf eyləmişəm,
Eşq ya öldürər axır məni, ya adəm elər.

* * *

O incə, nazlı baxışlar, o atəşin gözlər,
Həzin-həzin nə baxır, sanki aşiqin gözlər.

Sənin kimi, gözəlim, nazənin gözəl çoxdur,
Ki, yoxdur heç birisində, bu nazənin gözlər!

Sənin o gözlərini bircə yol görən aşiq,
İnan ki, söyləyəcək yüz yol: afərin, gözlər!

Sorulsa məndən, əsir eyləyən kim oldu səni?
Baxın bu gözlərə, ərz eylərəm; həmin gözlər.

Vəfalı olmasa, bir gün də çox güman dözməz,
Vəfalı olsa, yüz il aşiqin yəqin gözlər.

Həmişə şad oluram intizari-vəslin ilə,
Necə ki, bir təzə damad olan gəlin gözlər.

Mən öz nigarımı, eyb etmə, gözləsəm, Vahid!
Ki, bülbül öz gülünü, aşiq həmdəmin gözlər.

* * *

Könül, üşşaq qanın çox töküb ol tiği-əbrulər,
Haçan, bilməm, gəlir rəhmə cəfadən yari-bədxulər.

Olur gözdən rəvan xuni-cigər, ahim şərarindən,
Bu oddan cismimi, yarəb, xilas eylər axan sulər.

İlandır, qıvrılıb yatmış, nigarim, gənci-hüsn üstə,
Və ya kim həlqələnmiş dövri-ruyin üzrə keysulər.

Salıb yüz fitnəvi aşub çeşmin mülki-dünyayə,
Həzər eylər, düşər xovfə səni gördükdə cadulər.

Görüm hərgiz təcəllayi-cəmalın şami-zülf içrə,
Olur gündüz kimi rövşən mənə ol şami-ziculər.

Tutubdur ləşkəri-xətt arizin, cana, xərac istər,
Ki, guya mülki-Rum üstə gəlib yəğmayə hindulər.

Götür zülfün üzündən, ey üzü xurşiddən ənvər,
Olubdur qəlblər qarə, tutubdur jəng güzgulər.

Rəqibin tənəsindən inciyib heç etiraz etmə,
Gərək səbr eyləsin aşiq, əgər min olsa bədgulər.

Şikayət etməmək yeydir cəfayi-çərxi-zalimdən,
Bahari-ömrümü qılsa xəzan gər badi-qayğulər.

Daha guş etmə, Vahid, pəndinə vaizlərin hərgiz,
Neçə evlər qoyub viranə cəhl ilə o bayqulər.

* * *

Gözəlim, gül üzünə kim ki, tamaşa eylər,
Qorxuram, eşqimizin sirrini ifşa eylər.

Kəcnümalər sənə mənə verir öz qəlbi kimi,
Qəlbisaflar səni düzgün yola məna eylər.

Yüz min aşiq gələ, mindən biri Məcnun olmaz,
Yenə Məcnununu təyin özü Leyla eylər.

Bu cəfalar ki, mənə dilbəri-məhrulər edir,
Cümləsin toplasalar bir yerə, dünya eylər.

Duydum axır ki, rəqibin mənə xainliyini,
O mənim istədiyim yarı təmənna eylər.

Eşq sövdasına kim düşsə, bəlalər çəkəcək,
Şeyx Sənan ola gər, eşq onu rüsva eylər.

Qorxma, Vahid, hədə eylərsə də, biganə sənə,
Nuri-həqq, zülmət olan yerdə təcəlla eylər.

* * *

"Könlüm yenə cananın əlindən gilə eylər",[1]
Bülbül nə cəfa çəksə, şikayət gülə eylər.

Fəxr eylər idim vəslinə, hicranına yandım,
Tale, nə bilim ki, məni axır belə eylər?!

Zalim fələkin gərdişi atəşlərə yansın!
Əvvəlcə nə cövr eyləsə əhli-dilə eylər.

Divanəsiyəm bir üzü göycək, qara xalın,
Zülfün mənə zəncir kimi silsilə eylər.

Bilsən sənə, ey gül, nə qədər aşiq olan var,
Təqribən əgər saysan, o min qafilə eylər,

Gər badi-səba zülfünə yol tapsa o şuxun,
Min tənə çəmənlərdə gedib sünbülə eylər.

[1] Misra Heyran xanımındır

Vahid, yenə mən hüsnünə heyranəm o mahin,
Rəhm eylə, desəm, cövr eləmə, o, hələ eylər.

* * *

Çeşmin ki alır naz ilə can, işvəni neylər?
Müjganın oxundan yıxılan şivəni neylər?

Sərvi-çəmənə qamətin iftadəsi baxmaz,
Möhtacı tamaşayi-rüxün gülşəni neylər?

Gəl cövr elə, mən yalvarım həqqə, sən inanma,
Tanrım görək axır, səni neylər, məni neylər?

Dəfn eyləmə, olsam səri-kuyində şəhidin,
Üryan gəzən aşiq kəfəni, mədfəni neylər?

Canı, təni nəzr eyləmişəm rahi-vəfadə,
Yarın sevən aşiq dəxi canı, təni neylər?

Qəm pirəhənin seyli-sirişk içrə buraxdım,
Girdabdə qərq olsa gəmi, yelkəni neylər?

Öz dostu ki min cövr elədi Vahidə, getdi,
Qıl indi təsəvvür, ona gör düşməni neylər?

* * *

Hər kim mənə zülm eyləsə, ey gül, zərər eylər,
Bir gün sənə də naleyi-zarım əsər eylər.

Gülüzlülər eşqində əyər xakə də dönsəm,
Qəbrim daşına badi-səbalər güzər eylər.

Kuyindən əyər dərbədər etmiş məni əğyar,
Ahim odu bir gün onu da dərbədər eylər.

Biganə məni həsrəti-vəslinlə qocaltdı,
Çox çəkməz, onu haqq özü məndən betər eylər.

Zülfün üzünü il uzunu tutsa, darıxma,
Aydın gecəni zülmət edən kəs səhər eylər.

Min naz ilə ol şux qəfildən məni yıxdı,
Zənn etmə ki, səyyad ox atarkən xəbər eylər.

Vahid, səni istər sala biganə nəzərdən,
Qəm çəkmə, bu bəsdir, sənə xalqın nəzər eylər.

* * *

Qaşların tiği, gülüm, almaq üçün can istər,
Tökməyə dəhrdə nahaq yerə min qan istər.

Gözün istər günümü qarə edə şamü səhər,
Daima göz yaşımı təşneyi-ümman istər.

Tapşır əbrulərinə, rəhm eləsin aşiqinə,
Nədən üşşaqlərin könlünü büryan istər?

Dolanır mürği-könül gəşt eləyir kuyində,
Səri-zülfündə sənin bənddir o, zindan istər.

O qara zülfünün az çəkməmişəm həsrətini,
Mübtəla könlümü hər ləhzə pərişan istər.

Nə olar, çox da gözəlsən, özün insaf eylə,
Hansı gül aşiqini sən kimi nalan istər?

Hər baxanda, gözəlim, incimə gül ləblərinə,
Bülbülün adətidir, qönçəni xəndan istər.

Bilməmişlər dəhənin sirrin hələ indiyəcən,
Kəşf qılmaq bu müəmmanı çox imkan istər.

Nüktə bilsin – o adamlıq ham zahidlərdə,
Ləli-ləbin var ikən, çeşmeyi-heyvan istər.

Vahidi cazibeyi-eşqin edibdir Məcnun,
Yoxsa divanəliyi hansı bir insan istər?!

* * *

Könlüm quşu, ey gül, səni şamü səhər istər,
Bülbül necə gülşəndə gülü tazə-tər istər.

Aşüftə qılıb könlümü zülfün kimi, getdin,
Məşuqə məgər aşiqini xuni-cigər istər?

Dur mahə bərabər, götür ol zülfünü üzdən,
Rüxsarını görməkliyi şəmsü qəmər istər.

Ver izn, doyunca öpüm, ol ləli-ləbindən,
Könlüm quşu tuti kimi şəhdü şəkər istər.

Eşq atəşinə dözmədi Məcnun da mənimtək,
Bu mərəkeyi-eşq, həqiqət, hünər istər!

Uymazdım onun eşqinə, bilsəydim əzəldən,
Biganələri məndən o gül bixəbər istər.

Gözlə, bu gözəl şerləri, Vahid, itirmə,
Səndən gələcək nəsl gözəl bir əsər istər.

* * *

Musiqi nəşəsi min sevgili canana dəyər.
Əsəri-naleyi-ney arif üçün canə dəyər.

Musiqi əhlinə insaf ilə qiymət qoymaq
Ləhni-Davud ilə min təxti-Süleymanə dəyər.

Bixəbərlər nə bilir, ləhceyi-xanəndə nədir,
Əhli-hal olsa bu söz qədrdə milyanə dəyər.

Pərdeyi-qəm dağıdır tarə dəyəndə mizrab,
Türreyi-dilbərə hərdən necə ki şanə dəyər.

Musiqilə ola hər xəstəyə aləmdə əlac,
Bu təbabət yenə min çareyi-Loğmanə dəyər.

Bizə bu elm haram olmuş idi keçmişdə,
Yəni şeytan işidir, rəxnəsi iymanə dəyər.

Yaşasın qırmızı şöhrətli Sovet qanunu,
Bu səxavət neçə min Hatəmi-dövranə dəyər.

Qıldı hər yerdə bina musiqi məktəblərini,
Nəğmənin faidəsi indi hər insanə dəyər.

Xalqımız musiqi elmin oxuyur hər yerdə,
Ölkəmizçün bu şərəf mehri-dirəxşanə dəyər.

Musiqilə məni dəfn eyləsələr, Vahid, əgər,
Qəbrimin torpağı min rövzeyi-rizvanə dəyər.

* * *

Aşiq öz dərdi-dilin istədiyi yarə deyər,
Deməz əğyarə ürək sirrini, dildarə deyər.

Rəhmsiz bir gül üçün bülbüli-biçarəyə bax,
Nə qədər cövrü cəfa çəksə, gedib xarə deyər.

Aşiqi-kamil olan sirrini pünhan saxlar.
İnanıb yarə deyərsən, o da əğyarə deyər.

İltica eyləməz heç bir kəsə həqdən qeyri,
Zülmdən təngə gələn dərdini sərdarə deyər.

Bir pərinin nə zamandır ki, bəlasın çəkirəm,
Nə yanar halıma, nə dərdimə bir çarə deyər.

Xoş o günlər ki, səri-zülfün əsiri mən idim,
İndi aləm mənə hicrində günü qarə deyər.

Mənim əhvalımı bir əhli-vəfa dost olsa,
Can verib, can alan ol şuxi-sitəmkarə deyər.

Nazəninlər nə bilir, aşiqin ahında nə var,
İldırım şöləsinə sabitü səyyarə deyər.

Yenə ol zülfü sevirdim, gözəlim, qorxuram, el:
– Fitnə zəncirinə bağlandı bu biçarə, deyər.

Gərək ol yarə deyəm, könlümü qəm seyli yıxıb,
Rəxnə görmüş bir evin sahibi memarə deyər.

Qiyməti-ləlini yarın deməyin əğyarə,
Gövhərin qədrini sərraf xiridarə deyər.

Eşq sirrin demə, Vahid, bu qaragözlülərə,
Məst dərk eləməz, arif, sözü huşyarə deyər.

* * *

Vəhm qılmaz könül, ol həlqeyi-keysudə gəzər,
Gör nə Məcnundu ki, zəncirdə asudə gəzər.

Xuni-dil cari olur hicrdə göz yaşı ilə,
Rəsmdir, fəsli-xəzan bərg düşüb cudə gəzər.

Vadiyi-hicrdə bir Leyli sorağında könül
Olub avarə, cünun eşqinə aludə gəzər.

Dil kəminində durub, xalini zülf içrə görüb,
Rəsmdir, oğru, gözüm, gecə qaranqudə gəzər.

Vurma məşşatə dəxi şanə o zülfi-siyəhə,
Mürği-dil riştəbəriştə o siyəh mudə gəzər.

Göz yaşımda dolanır, hüsni-ruxin mövclənir,
Afitab əksi düşüb, sanki gündüz sudə gəzər.

Dolanır ayineyi-qəlbdə mehri o məhin,
Necə bir əks ki, Vahid, düşər güzgudə gəzər.

* * *

Vurar məşşatə şanə türreyi-cananə hərdənbir,
Edər aşiqlər əhvalın pərişan şanə hərdənbir.

Dedim: – Bənd eyləmə, cana, səri-zülfünlə eşq əhlin,
Dedi: – Zəncirə bağlansın gərək divanə hərdənbir.

Fələk kəcliyinə salmış, qaşların yayilə bəhs eylər,
Düşər hər ay başında mahi-nov nöqsanə hərdənbir.

Səni tanrı, səba, düşsə güzarın ol səri-kuyə,
Yetir ərzim mənim də ol güli-xəndanə hərdənbir.

Dağıtma bunca zülfün ruyinə, etmə günüm qarə.
Üzün göstər, nola, ey məh, məni-nalanə hərdənbir.

Bu nəşə zahidin əskik deyil zövqi-behiştindən,
Mey içsəm yar ilə meyxanədə məstanə hərdənbir.

Mənə röyadə görmək də səadətdir inan, Vahid!
Alaydım yarı ağuşə nəzakətyanə hərdənbir.

* * *

Cəmalın şəminə, cana, yanar pərvanələr bir-bir,
Çəkər zənciri-zülfün, həsrətin divanələr bir-bir.

Edər üşşaq könlüm cəm ikən aşüftə, hər saət
Pərilər zülfünə dəydikcə, ey dil, şanələr bir-bir.

Yenə bilməm, nə əfsun eyləmiş caduyi-çeşmin kim,
Dəyibdir bir-birinə mərdümi-fərzanələr bir-bir?!

Nə meydir, gözlərin qurbanı, bilməm badeyi-eşqin
Ki, içdikcə tapar huşyarlıq məstanələr bir-bir?

Ləbin öpmək xəyalilə dili-sağər olub pürxun,
O həsrətlə gəzər əldən-ələ peymanələr bir-bir.

Dəhanindən əsər yoxdur, demişlər, şərti var, amma
Yetər təhqiqinə, şərh etsələr fərzanələr bir-bir.

Könül, qıl şöleyi-ah ilə rövşən bəzmi-canani,
Həsəd narinə yansın şəm kimi biganələr bir-bir.

Ərəqdirmi düzülmüş arizi-alində sərtasər,
Gül üzrə jalədir, yainki ol dürdanələr bir-bir?

Məzaqi-ləlini görmüşlə, derlər cami-mey içrə,
Şərəfyab ol cəhətdəndir olub meyxanələr bir-bir.

Ayılmaz məscid əhli, Vahida, xabi-cəhalətdən,
Məgər əhli-riyadən tərk ola əfsanələr bir-bir!

* * *

Bəxtiyar aşiq odur ki, onu cananı sevir,
Binəva bülbülünü, öz güli-xəndanı sevir.

Mən o zülfün azı yüz dəfə bəlasın çəkdim,
Dəli könlüm yenə ol zülfi-pərişanı sevir.

Etibar olmaz özün göstərən aşiqlərdə,
Əhsən ol aşiqə cananını pünhanı sevir!

Əsri-hazırkı gözəllikləri görmür zahid,
İndi də cəhlini gör, rövzeyi-rizvanı sevir.

Sevirəm mən o nəzakətli gözəl dilbəri ki,
Musiqi elmini, rəssamı, qəzəlxanı sevir.

Pir könlüm gəlir ilhamə görərkən hərdən,
Bir nəcabətli gözəl qız gözəl oğlanı sevir.

Vahidin ovçuluğu olsa da, insafı da var,
Öz kəməndinə düçar etdiyi ceyranı sevir.

* * *

O gül mənə bu gecə həmzəban olan gecədir,
Deyib, gülüb, danışıb, mehriban olan gecədir.

Vəfa səhifəsini şərh edəm gərək o gülə,
Həqiqi eşqimizə imtahan olan gecədir.

O sərv boylu səhər seyri-laləzar edəcək,
Çəmən çiçəklərinin bağrı qan olan gecədir.

Xüsusi ətr alacaq öz gülündən hər bülbül,
Xədəngi-nazə könüllər nişan olan gecədir.

Bu xoş dəqiqələri, ey könül, qənimət bil,
Bəla əsirləri şadiman olan gecədir.

Rəqib eşitsə, nigarım mənimlə həmdəm olub,
Həsədlə ömrü bu qəmdən xəzan olan gecədir.

Gül isə pərdeyi-ismətdən aşikar olacaq,
Vüsalə yetməyə bülbül nihan olan gecədir.

İnanma, əl çəkə bülbül gülün kənarından,
Sevimli dilbərinə pasiban olan gecədir.

Gülüzlülər səni, Vahid, yenə əhatə edib,
Təfaxür eylə ki, bəxtin cavan olan gecədir.

* * *

Eşqin tamam nəşəsi divanəlikdədir,
Meyxanənin məlahəti məstanəlikdədir.

Cahillər ilə arifin olmaz əlaqəsi,
Hal əhlinin təkamülü fərzanəlikdədir.

Ləlin xəyali könlümə dolsa, əcəb deyil,
Gizlin xəzinənin çoxu viranəlikdədir.

Yetməz vəfası axirə namərd olanların,
Şəxsin bütün dəyanəti mərdanəlikdədir.

Vahid, əgərçi sənətə qiymət verirsə xalq,
Şerin də qədrü qiyməti dürdanəlikdədir.

* * *

Hər aşiqin məhəbbəti bir məhliqayədir,
Eşq aləmində mehrü vəfa payə-payədir.

Bülbül də məntək öz gülünün mübtəlasıdır,
Ahü fəğanı xarilə güldən gilayədir.

Yüz dəfə cövr edib mənə, bilməm, nə sirr var,
Zövqü məhəbbətim yenə ol bivəfayədir.

Vaiz ki, cənnət ilə cəhənnəm sözün deyir,
Mənaca qanmayır, bu nə rəmzü kinayədir.

Zahid şərab nəhyi üçün ayə söyləyir,
Lakin sorulsa, anlamayır hansı ayədir.

Ahuyi-Çin deyənlər o mişkin qəzalinə, üçün,
Mərdümlər içrə göz görə meyli xətayidir.

Cövrü cəfayə adət edən mahirulərin,
Əvvəlcə hər cəfaları mən binəvayədir.

Vahid, cahana bağlama bel, yoxdur axırı,
Guya bir evdəsən, neçə günlük kirayədir.

* * *

Ey könül, sən sevdiyin ol nazlı afət özgədir,
Bülbüli-şeydayə gülzari-lətafət özgədir!

Aşiqüməşuqə məst olmuş xəyali-vəsl ilə,
Barigahi-eşqdə zövqi-xilafət özgədir!

Dəhrdə didari-yar ilə şərafət etmədim,
Əhli-eşqə kuyi-cananda şərafət özgədir!

Qurmuşuq biz bu ziyafət məclisin bir şövq ilə,
İncəlik, min nazənin söhbət, zərafət özgədir!

Xəlqimiz yüzlərcə məclislər, ziyafətlər görüb,
Ən gözəl, qiymətli, ən ali ziyafət özgədir!

Nazəninlər bir tərəf, bir yanda rindi-meypərəst,
Bir işarə arifə eylər kifayət, özgədir!

Zənn edirdim görmədən, Vahid, nəzakət əhlisən,
Anladım görcək səni, əhli-nəzakət özgədir!

* * *

Nigar ilə bizim əhdü qərarımız belədir,
Şəhidi-xəncəri-eşqik, şüarımız belədir.

Görəndə şad oluruq yarı, görməsək qəmgin,
Bizim xəzanımız ilə baharımız belədir.

Gülüzlülər sevinirlər hey ağladıqca bizə,
Biz eşq bülbülüyük, ahü zarımız belədir.

Nigar cövr qılır, biz yolunda can veririk,
Bizim cahanda qalan yadigarımız belədir.

Bu qarə gözlülərin məstiyik, təbibə dedim;
Bizim də eşqdə rənci-xumarımız belədir.

Nə gizli sirrimiz olsa, rəqibə söyləmərik,
Həmişə bir-birinə etibarımız belədir.

Bizimlə həmdəm olan, Vahid, od tutub yanacaq,
Məhəbbət atəşiyik biz – diyarımız belədir.

* * *

Sevgilim, eşq olmasa, varlıq bütün əfsanədir,
Eşqdən məhrum olan insanlığa biganədir.

Sevgidir, yalnız məhəbbətdir həyatın cövhəri,
Bir könül ki, eşq zövqün duymasa, qəmxanədir.

Mən əsiri eşqiyəm öz xalqımın, öz yurdumun,
Sevməyən öz xalqını, öz yurdunu divanədir.

Qoy Vətən daim işıqlansın gözəl bir şəm tək,
Könlüm ol şəmin ziyasın seyr edən pərvanədir.

Nazənin, rəna gözəllərdir baxırsan hər yana,
Bəs bu torpaq indi bir cənnət deyil, aya, nədir?

Ölkəmizdə gör nələr var, başqa bir aləmdəyik,
Hər çiçək bir nazənin, hər qönçə bir cananədir.

Vahidəm mən, sevgilim, məndən xəyanət görməzsən,
Şairəm, eşqim də öz qəlbim kimi mərdanədir.

* * *

Məqsəd üzündür, aşiqə cənnət bəhanədir,
Ləlin yanında çeşmeyi-kövsər fəsanədir.

Bülbüllərin sədası tutub səhni-gülşəni,
Bihuş edib məni, nə gözəl, xoş təranədir.

Çəkmiş kənarə hər kəs öz istəkli dilbərin,
Gülüzlülərlə söhbətimiz məhrəmanədir.

Nə xardən əsər görünür, nə rəqibdən,
Pəh-pəh, nə yaxşı dövr, nə yaxşı zəmanədir!

Sərməst edib bizi yenə bu qarəgözlülər,
Süzgün baxışları nə gözəl, şairanədir.

İndi təsəvvür eylə bu bağın gözəllərin,
Hal əhli anlayar, bu nə rəmzü kinayədir.

Vahid, sevin ki, xalq özü qiymət verir sənə,
Təbin gövhər saçan nə tükənməz xəzinədir!

* * *

O can alan nə bilir, aşiqin pənahı nədir?
Ona bu hüsnü verən qüdrəti-ilahı nədir?

Səfasın özgə görür, mən bəlalərin çəkirəm,
Mənim bu qanə dönən könlümün günahı nədir?

Dağıtdı zülfün üzə dilbərim, keçəndə dedim:
– Bunun yanında behiştin gülü giyahı nədir?

Bu qara gözlülərin olmayınca Məcnunu,
Cahanda kim biləcək, eşq barigahı nədir?!

Gecə-gündüz edirəm ahü nalə kuyində,
Soruşmayır, bu qədər bir fəqirin ahı nədir?

Gülüzlü, nazlı gözəllərmiş, indi mən bilirəm,
Məhəbbət əhlinin aləmdə qibləgahı nədir?

Tarında, Vahid, əgər Qurbanın məlahəti var,
Dayan bir indi görək, Zülfünün "Segah"ı nədir!

* * *

Naz edir bülbülə gül bir belə – mənası nədir?
Bülbülün bəs gülü sevməkdə təmənnası nədir?

Aşiq hər cövrə dözür, bəlkə də bir hikməti var?!
Bu işin fikr elə, gör, əsl müəmması nədir?

Öldürür, gündə dirildir məni öz cananım,
Keçmişin indi mənə möcüzi-İsası nədir?

Bülbülün ki, bu qədər naləsi dünyanı tutur,
Kimsə bilmir hələ, qəlbindəki sövdası nədir?

Mən olan yerdə mənimtək ola bilməz Məcnun,
Sən olan yerdə onun sevdiyi Leylası nədir?

Qoyma incitsin ipək köynək o nazik bədənin,
Hanı güldə bu lətafət? Onun əzası nədir?

Sən də, Vahid, vətənin güllərinin aşiqisən,
Sən ki varsan, çəmənin bülbüli-şeydası nədir?

* * *

Qəm çəkmə, bülbülüm, güli-xəndan bizimkidir,
Gəldi bahar fəsli, gülüstan bizimkidir!

Qoyma rəqibi zövq ala bu laləzardən,
Əlvan geyimli sünbülü reyhan bizimkidir!

Biz bağbaniyik bu lətafətli güllərin,
Rəna yerişli sərvi-xuraman bizimkidir!

Çoxlar səfayi-eşqilə öz növbətin sürüb,
Növbət bizimdir, indi bu dövran bizimkidir!

Əğyarə söyləyin, o da çox lovğalanmasın,
Biz çəkmişik bəlasını, canan bizimkidir!

Biz indi də həyatla ayaqlaşmasaq əgər,
Yox kimsənin günahı, bu nöqsan bizimkidir!

Vahid maarif eşqilə tapmış şərafəti,
Biz talibi-məhəbbətik, ürfan bizimkidir!

* * *

Demə Məcnuna dəli, bəlkə də, Leyla dəlidir,
Eşq olan yerdə bütün aqilü dana dəlidir.

Saldı Yusif kimi öz sevgilisin zindanə,
Qoydu rüsvalığı aləmdə Züleyxa, dəlidir.

Eşq zəncirinin iftadəsi bir mən deyiləm,
Həvəsi-silsileyi-eşq ilə dünya dəlidir.

Sarılır çiyninə, gah boynuna, gah qamətinə,
Əjdahalar kimi ol zülfi-çəlipa dəlidir.

Bir vəfasız gül üçün naləsi dünyanı tutub,
Aşiqin qəlbi kimi bülbüli-şeyda dəlidir.

Bircə Şirin ilə Fərhadə məzəmmət yoxdur,
Vadiyi-eşqdə Vamiq dəli, Əzra dəlidir.

Əl götürməz bu qara gözlülərin zülfündən,
Hər yetən zənn eləyir Vahidi, guya dəlidir.

* * *

Mən istəyən gözəlin saçları ipək kimidir,
Üzü çəməndə açılmış qızıl çiçək kimidir.

Olub əsiri, sevərdim o zülfü il uzunu,
Bu dərd kəsir məni, heyif, bir az gödək kimidir.

Göyün gözəlləri aləm deyir, mələklərdir,
Mənim də istədiyim yerdə bir mələk kimidir.

Gəhi rəqibə salır meylini, gah aşiqinə,
Hayan gəlir – əsir ol bivəfa, külək kimidir.

Bu hüsnə bir də bəzək verməyin nə mənası?
Gözəlliyin sənə, ey gül, elə bəzək kimidir!

Üzündə xalını gördüm gülüzlü dilbərimin,
Bu rəngdə hil, dedim, olmaz, bu lap mixək kimidir.

Həmişə özgələr ilə deyib, gülüb, danışır,
Mənimlə sirr nədir, sevgilim ögey kimidir?

İnanma, əl çəkə zahid ölüncə məsciddən,
Xərabəlikdən uzaqlaşmaz – hörümçək kimidir.

Həmişə mən varam aləmdə, ölmərəm, Vahid!
Əsər ki, qaldı cahanda, o, ölməmək kimidir.

* * *

Sanma, könlüm bu çəmənzardə xürrəm kimidir,
Yarsız aşiqə cənnət də cəhənnəm kimidir.

Açılır, zülfün açıldıqca tutulmuş könlüm,
Zülfünü görmədiyim gün mənə matəm kimidir.

Yıxdı min aşiqi-biçarəni, bir qəmzən oxu,
Mərhəba gözlərinin şəstinə, Rüstəm kimidir.

Özünü qaşlarının taqinə bənzətmək üçün
Yeni ayı fələkin indiyəcən xəm kimidir.

Gözəlim, lalə yanağındakı tər qətrələri
Təzə gül yarpağı üstündəki şəbnəm kimidir.

Bir fəqir aşiq əgər sevgili cananı ilə
Tuta mey camını əldə, o elə Cəm kimidir.

Dilbərim həmdəm olub qeyr ilə, Vahid, nə qəmim!
Qəmi-eşqi mənə hicran günü həmdəm kimidir.

* * *

Mənim istəklim o üç nalız gözəldən biridir,
Həmi göyçək, həmi on yeddi yaşından iridir.

Belə bir dilbər üçün can verən aşiq ölməz,
Bəxtəvərdir, o bu dünya yaşadıqca diridir.

Nə cəfa etsə gözəllər mənə, eyb eyləməyin,
O mənim qanə dönən könlümün öz təqsiridir.

Can fədadır elə canane – vəfa əhli ola,
Bivəfa olsa gözəl, aşiqin ömrün çürüdür.

Bilmədim, yar üçün əğyarə gedib yalvardım,
Dedim, ey dil, dönəsən qanə, bu minnət yeridir?!

El yığıldı o gülün başına pərvanə kimi,
Elə bildim, gözəlim eşq, məhəbbət piridir.

Sadə dildə bu qədər incə qəzəllər ki yazır,
Bu yetər Vahidin haqqında ki: “el şairidir!”

* * *

Aləm deyir, istəklin əcəb nazlı mələkdir,
Hər şivəsi min hiylədir, hər nazı kələkdir.

Hər kəs ki yeni meyvəsin istərsə baharın,
Baxsın bu gözəl dilbərə – xalis çiyələkdir.

Söz verdi nigarım məni incitməyə bir də,
Tez döndü sözündən, bu açıq dəbbələməkdir.

Qiymətli bəzəklə qadının zinəti artmaz,
Övladə gözəl tərbiyə qiymətli bəzəkdir.

Vahid, çalış, ətrafını incitmə özündən,
Cəhd et, elə söz yaz ki, o söz xalqa gərəkdir.

* * *

Hər aşiqə öz istədyi yarı gözəldir,
Hər bülbülə öz sevdiyi gülzarı gözəldir.

İlqarı gözəl olmayanı istəməz aşiq,
Can ver elə canane ki, ilqarı gözəldir.

Mən bir uca boylu gözəlin zülfünə bəndəm,
Rüxsarı gözəl, şivəsi, rəftarı gözəldir.

Yüzlərcə gözəl başqa vilayətdə də çoxdur,
Amma bizim ölkə bütün – elcarı gözəldir.

Yar olsa mənimlə, mənə biganə nə eylər?
Uçmaz elə bir xanə ki, memarı gözəldir.

Mən istədiyimçün o gülü qeyri də sevdi,
Qiymətli o şeydir ki, xiridarı gözəldir.

Vahid, mənə insaf elə, sima ilə baxma!
Əhsən, elə bir şairə əşarı gözəldir!

* * *

Könlüm sənə pabəstədir, ey şux, bir ildir,
Nə öldürür eşqin məni axır, nə dirildir.

Aşiqlrini qəsdin əgər məhv eləməksə,
Mən hazıram, əvvəl mənə məqsudunu bildir.

Meylim sənədir, bir sənə aləmdə əsirəm,
İstər isən azad elə, istər məni öldür.

Kəc baxma, bütün xəlq dəyər bir-birə, zalim!
Zülfün girəhin açma ki, qarətgəri-dildir.

Məbhut eləyib aləmi ayineyi-ruyin;
Nə şəkli-şəmayildi, bu nə hüsnü cəmildir!

Rüxsarına ol xali-siyəhdirmi düzülmüş,
Ya bərgi-gül üstə düzülən daneyi-hildir?

Vahid, demə kim, yar ilə şirindi mey içmək,
Zəhr olsun o işrət ki, həkimanə deyildir!

* * *

Xəmidə qaşların fikrilə, ey məh, qamətim xəmdir,
Mənə əbrulərin mehrabi-məsciddən müqəddəmdir.

Düşübdür atəşi-rüxsarın üzrə zülfi-pürçinin
Ki, guya gənci-hüsn üstə yatıb şahmari-ərqəmdir.

Məni gah öldürür nazın, dirildir gah göftarın,
Məgər İsəbni-Məryəmsən, nigarım, bu nə aləmdir!

Görüb ləli-ləbin, mey şişəsin sındırdı saqilər,
Neçün? Eşq əhlinə ləli-ləbin meydən mükərrəmdir?

Bu hüsnlə, nigarım, sən mələksən, ya pəriçöhrə?!
Ona adəm demək olmaz, sənə der ki, bu adəmdir.

Məni hicran oduna yandırıb gəl etmə xakistər,
Fəraqin atəşi eşq əhlinə nari-cəhənnəmdir

Salıbsan Vahidi kuyində ayrı, bilməzəm vəchin,
Vəli biganələr, məndən səva, ol bəzmə məhrəmdir.

* * *

Bizə divanəlik nə zülfdən, nə şanələrdəndir,
Bu rəsmiyyət bizə bizdən qədim divanələrdəndir!

Qəmi-eşq ilə yanmış könlümü viranə zənn etmə,
Bu viranə, gühərlər bəsləyən viranələrdəndir!

O şuxun gözlərindəndir, könül, dərdü qəm çəksək,
Xəyal etmə, bu afətlər bizə biganələrdəndir!

O nuşanuş kim, hər dəm gəlir meyxanə səmtindən,
O, məscidlərdən ikrah eyləyən məstanələrdəndir!

Bizi sərməst edən cami-məhəbbətdir, get, ey vaiz,
Bu sərxoşluq nə bu meydən, nə bu meyxanələrdəndir!

Nola, gər atəşi-eşq ilə yansaq, şöləmiz yoxdur,
Bu xasiyyət bizə nə şəm, nə də pərvanələrdəndir!

Demişdir müddəi: – Vahid kəməndi-eşqdən qaçmış,
Bu əqlə sığmayan, ellər deyən əfsanələrdəndir!

* * *

Könlüm yenə bülbül kimi şeydayi-vətəndir,
Məcnun edən aşiqləri Leylayi-vətəndir.

Yüzlərlə gözəl aşiqi olsam da mən, amma
Qəlbim yenə də aşiqi-sevdayi-vətəndir.

Dünyaya gözəllik verən, əlbəttə, günəşdir,
Ondan da gözəl xəlqə təcəllayi-vətəndir.

Qoymaz bu müqəddəs yerə biganə toxunsun,
Hər kəs ki, sədaqətlidir, əbnayi-vətəndir.

Tərifi-behişt eyləməsin xəlqimə heç kəs,
Cənnət də, behişt də bizə səhrayi-vətəndir.

Vahid, elə zənn eylə ki, mən Yusifi-əsrəm,
Məşuqə mənə eşqi Züleyxayi-vətəndir.

* * *

Gözəllər, mahpeykərlər könüllər qan edənlərdir,
Cəfa rəsmində bu bimehrlər tüğyan edənlərdir.

Ümidi-vəsl ilə hər qarə zülfə payibənd olma
Ki, onlar aşiqi sərgəşteyi-hicran edənlərdir.

Bu müşkin türrəli, ahu baxışlı nazənin bütlər,
Fəzayi-eşqdə üşşaqı sərgərdan edənlərdir.

O məcnunlar ki, eşq içrə əsiri-dami-zillətdir,
Dəmadəm arizuyi-türreyi-canan edənlərdir.

Züleyxa ismətində naz edən hər şuxə aldanma!
Əzizi-Misri onlar bəsteyi-zindan edənlərdir.

Rüxün dövrün müsəxxər qılsa xəttin, etiraz etmə,
Məlahət mülkünə zinət verən, üsyan edənlərdir.

Gülüzlü nazəninlərdən cəfalər çəkmişəm, Vahid!
Neçün ki, əndəlibi-könlümü nalan edənlərdir.

* * *

Həyata zövq verən sevgidir, məhəbbətdir,
Məhəbbət hər kəs üçün ən böyük səadətdir!

Nə məclisin olur olsun, ümumə xidmət elə,
Ümumə xidmət özü başqa bir şərafətdir!

Büsati-meydə özün düz aparmayan kimsə
Nəsihət ilə düzəlməz, gədatəbiətdir!

Bir azca nəşələnib əzmə ruhin özgələrin,
Utan bu tutduğun işdən, bu ki qəbahətdir!

Ətrafi-məclisi seyr et, ədəblə badəni iç,
Nə gəldi ağzına, sərf eyləmək pis adətdir!

Ki, yoxsa pul da gedə, hörmətin də məclisdə,
Bu məstlik, belə işrət görək nə hacətdir?

Nə tara fikir verirsən, nə də qəzəlxanə,
Ya şerdir bu və ya nəğmədən ibarətdir?

Qədəh əlində gül ol, bülbül ol, görən kəslər
Dalınca söyləməsinlər: nə biləyaqətdir!

Bilərmi, cahilə yüz dəfə söyləsən, Vahid,
Və lakin arifə bir kəlmə söz kifayətdir!

* * *

Sənin gözəlliyin, ey gül, bütün məlahətdir,
Bu hüsn səndə ikən ən böyük səadətdir.

Rəqibə gözlərinin mail olduğun bilirəm,
Mən arifəm, bir işarə mənə kifayətdir.

Qaşın, gözün, yerişin, kirpiyin, iki zülfün,
Nə fitnədir bu yığıbsan, məgər qiyamətdir?

Heyf ki, qiymətini bilmədin, yanır ürəyim,
Gözəl ki, bilmədi öz qiymətin, cinayətdir.

Deyim ki, gülmə, danışma, rəqibə naz etmə.
Necə deyim, gözəlim, səndə gülmək adətdir.

Rəqibin aşiqisən, könlüm inciyib səndən,
Gülündən ayrı salan bülbülü rəqabətdir.

Nə eybi var, yenə öz aşiqinlə gülsən əgər,
Gülürsən özgələr ilə, bu ki xəyanətdir.

Şikayət eyləmə, Vahid, həmişə şükr eylə,
Dayanmışıq, hələlik can ki var, səlamətdir.

* * *

Hərdən kim, naz edir mənə canan, xoşum gəlir,
Naz eylədikcə könlüm olur qan, xoşum gəlir.

Yenə küsüb, acıqlı baxır sevgilim mənə,
Canım ola o gözlərə qurban, xoşum gəlir.

Bir an rəqibi görməyə yoxdur görən gözüm,
Öz yarım incidir məni hər an, xoşum gəlir.

Zəhləm gedir nigarimə baxdıqca özgələr,
Saymır rəqibi ol güli-xəndan, xoşum gəlir.

Mümkünsə, bir gözəl sev – onun mübtəlası ol,
Gördükdə hər gözəl demə: – Bundan xoşum gəlir.

Zövqi-vüsal ilə yenə könlüm açılmayır,
Yaxdıqca könlümü qəmi-hicran xoşum gəlir.

Gül bülbül ilə olmalıdır, xar xar ilə
Yar olsa bir qız ilə bir oğlan, xoşum gəlir.

Vahid, vətən gözəllərinin mübtəlasıyam,
Dönmüş behiştə Azərbaycan, xoşum gəlir.

* * *

Qətlim üçün xəncərin çəkmiş o xəm əbru gəlir,
Salmağa əfsunə dil ol dilbəri-cadu gəlir.

Vəhm qıl, ey aşiqi-biçarə, canından bəsa,
Qan tökən cəllad olub, ol məhvəşi-bədxu gəlir.

Atəşi-ahim göy üzrə yandırıb kövkəbləri,
Dudi-ahimdən qaralmış ol siyah keysu gəlir.

Eşq bazarinə gər çəksən mətavü hüsnünü,
Zümreyi-sövdagəranü mehrə yüz mehru gəlir,

Zülfünü sal boynuma, cana, yəqin etsin görən,
Bənd olubdur dami-səyyad içrə bir ahu gəlir.

Gülşəni-eşqində Vahid ağlayır, vahid müdam,
Ol səbəb sərvin ayağinə gözümdən su gəlir.

* * *

Nə dərdi vardı könlün, nazlı yarə indi deyir,
Deməzdi sirrini ol gülüzarə, indi deyir.

Çəməndə inciməyin bülbülün fəğanından,
Gülündən hər nə çəkib, novbaharə indi deyir.

Vəfasız olduğunu mən demişdim ol şuxun,
O vaxt mən deyəni el dübarə indi deyir.

O məhliqanın əzəldən əsiri-zülfü mənəm,
Mənə rəqiblərim bəxtiqarə indi deyir.

Deyim ki, cövr eləmə, qorxuram, desin aləm;
– Bu binəva qəmini zülmkarə indi deyir.

“Az iç şərabı” – dedi, dərdimi təbibə dedim,
Şərab imiş, demə, hər dərdə çarə, indi deyir.

Güman ki, çoxdan o şuxun əsiridir Vahid,
Çıxartmayıb hələ də aşikarə, indi deyir.

* * *

Billahi, vəfasız demək ol şuxə cəfadır,
Yüz dəfə cəfa qılsa mənə, eyni vəfadır!

Müşki-Xütən olmaz səri-zülfün kimi xoşbu,
Hər kim desə çin zülfünə gər müşk, xətadır!

Mən eyləmə eşq əhlinə meyxanəni, zahid!
Meyxanə mənim ruhim üçün dari-şəfadır!

Ali olan insanlara cəhd eylə, qulam ol,
Şah olma, o naəhlə ki, əcdadı gədadır!

Kimdir, dedim, aşüftə qılan zülfi-siyahin?
Niqtə gəlib ol şux dedi: – Badi-səbadır!

Vahid, yanacaqsan, bilirəm, nari-fəraqə,
Virdin dəxi bundan sora ah ilə nəvadır.

* * *

Ey könül, eşq aləmin seyr et, bu aləm başqadır
Kim, bu aləmdə məsərrət başqa, matəm başqadır!

Dəm qənimətdir, demişlər, bir gülüzlü yar ilə
Həmdəm ol, mey camın əldə tut ki, bu dəm başqadır!

Mən necə əbrulərə mahi-məhərrəm söyləyim,
Bu qılınclar başqadır, mahi-məhərrəm başqadır!

Kim desə keysuyi-pürxəm zülfünə, divanədir,
Eşqdə zəncir başqa, zülfi-pürxəm başqadır!

Kuyinə gəlməzsə zahid, vəchi var, məzurdur,
O ki, cənnət var, demişlər, onda Adəm başqadır!

Qətrə-qətrə tər düzülmüş ruyinə, şəbnəm deyil,
Pürbəha dürdanədir, gül üzrə şəbnəm başqadır!

Şerdən bəhs etmə, Vahid, biz də dünya görmüşük,
Şerdə Azər kimi ustadi-əzəm başqadır!

* * *

Öyünmə çox, gözəlim, çox da gözlərin qaradır!
Təbiətin işidir, gündə min gözəl yaradır.

Bu canı istə verim, özgə bir şeyim yoxdur,
Mən aşiqəm, nəyim olsa, mənimki aşkaradır.

Səni görən kimi aləm mənə behiştə dönür,
O gün ki, gül üzünü görməsəm, günüm qaradır.

Rəqibə vermə nişan, yaxşı saxla qoynunda,
Mənim də eşqim o bir cüt dərilməmiş naradır.

Desəm qılınc qaşına, qorxuram dilim kəsilə,
Sözün düzü, nə bilim, bəlkə əyri ayparadır?!

O yerdə ki, dəli könlüm səni gəzib soruşur,
Özüm də bilməyirəm çox zaman, o yer haradır?

Rəqib tənəsi, Vahid, mənə toxundu o gün,
Sızıldayır ürəyim, sanki ox dəyib, yaradır.

* * *

Könlüm bir ahu gözlü əlindən yaralıdır,
Gəlməz kəməndə, Azərbaycan maralıdır.

Süzgün baxışla aləmi salmışdır heyrətə,
Ya lənkəranlı, ya bu gözəl astaralıdır.

Hərdəm ki, saçları bürüyür gül cəmalını,
Sanki günəş buludda tutulmuş, qaralıdır.

Bir zərrəcə yaxınlığımız olmayıb hələ,
Məndən günəş qədər o pərivəş aralıdır.

Hər gün bir ayrı cür bəzənir qönçə gül kimi,
Əynində tirmə köynəyi var, zərxaralıdır.

Qaş-gözlə gündə yüz can alır, aşiq öldürür,
Alnında tale ulduzu var, ayparalıdır.

Vahid, var olmasa, səni heç kimsə istəməz,
Canan sevər o aşiqi pullu-paralıdır.

* * *

Bir nazənin bəyənmişəm, əsli qazaxlıdır,
Hərdən gülümsəyirsə də, çox qaşqabaqlıdır.

Biganə dindirəndə o gül can deyir ona,
Mən can desəm, acıqlı baxır, çox maraqlıdır!

Naz eləyir rəqibimə, dindirməyir məni,
Guya ki, qönçə güldü, onun ağzı bağlıdır.

Al qırmızı geyir Qarabağ nazəninləri,
Bilməm, nə üz verib o gülə qarə bağlıdır.

Fərhadı olmuşam yenə bir lalə üzlünün,
Şirin baxışla yüz can alır, nəsli dağlıdır.

Olmaz zəmanəmizdə belə nazənin gözəl,
Yüz min nigarə tənə vuran gülyanaqlıdır.

Vahid, nə lazım öylə gözəl, qanmır aşiqi,
Sevmək bir öylə dilbəri ki, anlacaqlıdır.

* * *

Bilməm, bu nazənin kimin istəkli yarıdır?
Ya hansı bəxtiyarların bəxtiyarıdır!

Açdıqca gül cəmalını, ellər fərəhlənir,
Guya, gözəllik aləminin novbaharıdır.

Dünya bu nazənin mələkin həsrətin çəkir,
Xəlqin sevimli afəti, həm şəhriyarıdır.

Yüz dəfə yansaq eşq oduna, qorxu bilmərik,
Çünki diyarımız bizim odlar diyarıdır.

Bir vaxt səcdəgah idi atəşpərəstlərə,
Şəhri-Səba ki, mərkəzi dərya kənarıdır.

Qan etmə, saqi, bağrımızı, badə tez gətir,
Doldur qədəhləri, gecəmiz keçdi, yarıdır.

Hər kim deyirsə, sevmə bu rəna gözəlləri,
Bilmir ki, sevgi aləmi biixtiyarıdır.

Bir gün gələr ki, mən gedərəm, xəlq söyləyər:
– Biçarə Vahidin bu qəzəl yadigarıdır.

* * *

Uyma, ey könlüm, vüsali-yarə, hicran yaxşıdır,
Naz edincə aşiqə zülm etsə canan, yaxşıdır.

Kuyi-canandır verən zövqü məhəbbət aşiqə,
Bülbüli-şeyda üçün seyri-gülüstan yaxşıdır.

Söz qanan bir əhli-hal eşqində candan keçməli,
Qanmayan naəhldən anlaqlı heyvan yaxşıdır.

Hiyləgərlik şəninə layiq deyil insanlığın,
Tülkütək yaltaqlanan alçaqdan aslan yaxşıdır.

Tabe olmaqdan Züleyxaya tək vəfasız dilbərə,
Yusifi-biçarəyə, əlbəttə, zindan yaxşıdır.

Xalqımız hər əsrə layiq qəhrəmanlar bəsləyir,
Yüz min acizdən bu gün bir mərdi-meydan yaxşıdır.

İndi lazımdır ayaqlaşmaq müasir dövr ilə,
Vahida, hər şerinə bir tazə ünvan yaxşıdır.

* * *

Bir nəfər əhli-vəfa min bivəfadən yaxşıdır!
Bir sədaqət əhli min əhli-riyadən yaxşıdır!

Hansı güldür, hüsndə, səndən gözəldir, sevgilim,
Hansı bülbül eşqdə mən binəvadən yaxşıdır?!

Qaşların çərxin hilalindən, üzün xurşiddən,
Surətin ayineyi-giytinümadən yaxşıdır!

Bir daha xalın gözəllik artırır ruxsarına,
Bir qələt sözdür, demişlər, ağ qaradən yaxşıdır!

Gözlərin səhrayi-Çin ahulərindən dilfirib,
Ənbəri-keysulərin mişki-Xətadən yaxşıdır!

Səhhəti-bimari-eşqin Kəbəyi-kuyindədir.
Əhli-dərdə xaki-rahin tutiyadən yaxşıdır!

Min bəla tufanı qopsa, zərrə gəlməz eynimə,
Rəxnə görməz hər bina kim ibtidadən yaxşıdır!

Cahilə təbliği-ürfan eyləmək asan deyil,
Dideyi-xəffaş üçün zülmət ziyadən yaxşıdır1

Yar ilə biganənin, əlbəttə, Vahid, fərqi var,
Tap elə biganə ki, dust-aşinadən yaxşıdır!

* * *

Məhəbbətin, gözəlim, baisi-məlalımdır,
Qəzayi-ruhumsən, gözlərin qəzalımdır.

Fərəh verir qəmi-hicrin məni-fələkzədəyə,
Vəfasız olma, demə: – Talibi-vüsalımdır.

Rəqib qoy mənə tən eyləsin rəqabət ilə,
Həmişə səcdəgahimsən, qaşın hilalımdır.

Xəyali-xalın ilə xatirimdə min qəm var,
Adın fədası, sübutum sirişki-alımdır.

Nə səndə rəsmi-cəfa tərk olur, nə məndə vəfa,
Məhəbbətin həmişə dildə xoş məqalımdır.

Əgər ölsəm də qəmindən o yari-bimehrin,
Yenə bu halıma yanmaz, o qədri zalımdır.

Əsir edən məni, Vahid, o nazənin dilbər –
Məhəbbətim, mələkim, yari-məhcəmalımdır.

* * *

Səndən, gözəlim, könlüm o gündən nigarandır,
Bir kimsə də sormur, bu nə fəryadü fəğandır.

Rüsvayi-cahan olmasa, eşq əhli tanınmaz,
Aşiqlərə rüsvağılı, bil, namü nişandır.

Yar olmasa, gülşəndə baharın nə səfası?
Bülbüllərə, gül olmasa, hər yerdə xəzandır.

Mən sevdiyimi görsən əgər, sən də sevərsən,
Aləm onu hər yerdə deyir: – Sevməli candır!

İstərsən əgər dilbərin əl çəkməyə səndən,
And iç ona şirin dil ilə, tez inanandır.

Öz sevgilinin şəmi-rüxün aləmə göstər,
Pərvanələrin eşq oduna qəlbini yandır.

Vahid, düşün öz qədrini, namərdə əyilmə,
Göz dik elə bir qüdrətə ki, ruzi-rəsandır.

* * *

Soruşma halımı, ey dil, bu halım çox pərişandır,
Fəraqi-yardə əzbəs çəkib qəm, könlüm al-qandır.

Nədən bu çərxi-zalim qəlbi-üşşaqi kəbab eylər,
Əlindən əlaman, ey çərxi-dun, dil-mürği büryandır.

Keçirdim, nagəhan düşdü güzarım səmti-bulvarə,
Nə gördüm, bir büti-məhru misali-hurü qılmandır.

Töküb zülfün üzə çin-çin, görənlər söyləyir əhsən!
Deyirlər, mərhəba, əhsən, bu süni-həyyü sübhandır.

Baxan ol mahi-rüxsarə yəqinən kim, olur heyran,
Nə qədri vəsf edim, vəsfi tükənməz, əql heyrandır.

Duranda mən bərabərdə o yari-gülcəmal ilən
D e d i : – Əl çək, səni tanrı, kənarımdan bir az yan dur.

D e d i m : – Qurban sənə canım, qəbul et, mən sənə nökər.
Desinlər, yarına Vahid nə yaxşı bəndəfərmandır!

* * *

Ey gül, sənə könlümdə məhəbbət yenə vardır,
Əvvəl var idi vəslinə həsrət, yenə vardır.

Zülfündən idi sübhə kimi hər gecə söhbət,
Hər yerdə, hər işrətdə o söhbət yenə vardır.

Çox zalımı məhv etdi, dəyişdirdi təbiət,
Səndə, mələyim, vəhşi təbiət yenə vardır.

Zülfün, nə qəm, eylərsə könül mülkünü yəğma,
Fəth etsə qoşun hər yeri, qarət yenə vardır.

Min fitnə yatıb naz ilə ahu baxışında,
O məsti-xətadidədə adət yenə vardır?

Göstərmə o gül çöhrəni, qoy bilməsin aləm,
Hazırda bizim əsrdə cənnət yenə vardır.

Vahid, bu qəzəldə sənə Möcüz[1] verib ilham,
Sənətkar özü yoxsa da, sənət yenə vardır.

* * *

Sənin kimi, gözəlim, gülüzarımız vardır,
Xəzanə dönməyəcək novbaharımız vardır.

Təranəmiz bürüyüb hər diyarı bülbül tək,
Ətirli günlərimiz, taləzarımız vardır.

[1] Şair Mirzəli Möcüz Şəbüstəri

Bizim kimi hələ də bəxtiyar olan yoxdur,
Gözəl zəmanə, gözəl ruzigarımız vardır.

Behişt çiçəklərinin həsrətin çəkən deyilik,
Bizim də cənnətə bənzər diyarımız vardır.

Bu sevgi aləmidir, qorxma kimsədən, gözəlim,
Sevib, sevilməyə öz ixtiyarımız vardır.

Təbiət indi bizim qarşımızda acizdir,
Gözəllik aşiqiyik, iqtidarımız vardır.

Bu fəxrdir bizə, Vahid, həmişə aləmdə –
Yanında xalqımızın etibarımız vardır.

* * *

Xalq arasında məni rüsva qılan bir yardır,
Aləm içrə firqeyi-məhrulərə sərdardır.

Rəhm yox, insaf yox, hər gün cəfa tiğin çəkib,
Daima qanlar tökən bir zalimi-xunxardır.

Yüz cəfa eylər, görüb hər yanda bir əhli-dili,
Yoxdu bir kəsdən hərası, öylə kim qəddardır.

Çox çətindir əhli-üşşaqin səlamət olmağı,
Hər qədər kim, ol pərizadə cahanda vardır.

Kimə, yarəb, eyləyim, bilməm, şikayət dərdimi,
Büsbütün aləm əlindən ol pərinin zardır!

Bənd edibdir zülfünə könlüm quşunu ol sənəm,
Guyiya, könlüm olur Mənsur, zülfü dardır.

Aşiqindən üzmə əl biganəvar, ey sərvi-qədd,
Hər nə olsa, Vahidi-biçarə xoşrəftardır.

* * *

Gözəlim, gül üzünə aşiq olanlar çoxdur,
Şəmtək atəşi-eşqində yananlar çoxdur.

Baxma min naz ilə, incitmə məni, qorxum odur
Ki, düşər fitnə, bu eyhamı qananlar çoxdur.

Sanma, bir sənsən alan naz ilə can aşiqdən,
Gündə yüz işvə ilə canım alanlar çoxdur.

Cənnətə, huriyü qılmana inanmazdım əzəl,
Gördüm, ey gül, səni, bildim inananlar çoxdur.

İndi get, sən özünə layiq olan bülbülü tap,
Gəzmə hər kəslə, sədaqətli cavanlar çoxdur.

Başqa bir aşiqi vardır, desələr aşiqinin,
Baxma, biganələr içrə bu yalanlar çoxdur.

Vahid, hər bir gülün ardınca düşüb yalvarma,
Yurdumuzda canalan sevgili canlar çoxdur.

* * *

Sənsiz, ey şux, mənim xoş güzəranım yoxdur,
Sən ki yoxsan, elə bil, cismdə canım yoxdur.

Eşq pərvanəsiyəm, qəm oduna tabım var,
Xəstə bülbül kimi hər ləhzə fəğanım yoxdur.

Bu yaman gündə mənim bircə ümidim sənsən,
Sənsiz heç bir kəsə aləmdə gümanım yoxdur.

Zülfünə bağlı olandan bəri Məcnun kimiyəm,
Elə sərgəştəyəm, heç yerdə məkanım yoxdur.

Səbrü aramımı əldən qəmi-hicranın alıb,
Bir də qəm çəkməyə cismimdə təvanım yoxdur.

Hazıram canımı eşqində fəda eyləməyə,
Qəsəm ola canına, bir zərrə yalanım yoxdur.

Vahidəm, atəşi-həsrət bürüyüb dövrü bərim,
Yanıram, halıma bir qəlbi yananım yoxdur.

* * *

Sənin kimi, gözəlim, sərvinazımız yoxdur,
Nə istəyirsən elə, etirazımız yoxdur.

Bizim gözəllərədir səcdəmiz, sitayişimiz,
Bir özgə məbədə razi-niyazımız yoxdur.

Fələk verib bizə aləmdə dərdü qəm yükünü,
Bu yükləri çəkəcək bir tərazımız yoxdur.

Nigarımız nə cəfa qılsa, razıyıq, amma,
Rəqibdən səri-kuyində razımız yoxdur.

Bizim əqidəmiz artıqdır əhli-məsciddən,
Fəqət riyayi-orucmuz, namazımız yoxdur.

Bəlayi-hicrilə bir kimsəsiz əsirlərik,
Nigarə ərz eləyən dilnəvazımız yoxdur.

Cəmali-yar ilə pərvanələrtək odlanırıq,
Bir ayrı şövqilə suzi-güdazımız yoxdur.

Məhəbbət ilə sevir qəlbimiz gülüzlüləri,
Həqiqət əhliyik, əhli-məcazımız yoxdur.

Gözəllər hüsndə sultani-əsrdir, Vahid,
Hayıf ki, kamil olan bir Əyazımız yoxdur.

* * *

Könül, eşq əhlinə yetsə əgər yüz min bəla, xoşdur,
Yetişsə aşinadən-aşinayə hər cəfa, xoşdur.

Cahanda dövlətü mülk ilə malə etmərəm rəğbət,
Qapında ruzü şəb, şahim, mənə qürbü gəda xoşdur.

Şikayət etmərəm çərxi-sitəmkarın cəfasından,
Cəfayi-çərxdən olsa əgər qəddim duta, xoşdur.

Qəribasa könül eylib vətən ol zülfi-mişkinin,
Düşübdür seydvəş damə, yəqin eylüb xəta, xoşdur.

Kəsilsəm ney kimi gər bənd-bəndimdən fərağında,
Fəqanü nalə tərkin qılmaram, ey məh, nəva xoşdur.

Könül istər məkan tutsun gecə-gündüz o zülf içrə,
Necə divanəyə zəncirə olmaq mübtəla xoşdur.

Bəlanı arizu eylər bu Vahid, mübtəla olsun,
Bəli, eşqin yolunda aşiqə, ey gül, bəla xoşdur.

* * *

Yarın rəhi-eşqində könül qan ola, xoşdur,
Hicrində gözüm hər gecə giryan ola, xoşdur.

Mən ki, bu qara gözlülər eşqində əsirəm,
Sinəm hədəfi-navəki-müjgan ola, xoşdur.

Sən əsrimizin indi Züleyxasısan, ey gül!
Aşiq sənə min Yusifi-Kənan ola, xoşdur.

Yığma başına, naz ilə bir şanə çək hərdən,
Könlüm kimi zülfün də pərişan ola, xoşdur.

Gəl sinəni göstər mənə hər sübh zamanı,
Gül bülbül üçün çaki-giriban ola, xoşdur.

Rüxsarın odu könlümü yaxdıqca sevinnəm,
Pərvanə üçün şöleyi-suzan ola, xoşdur.

Canan nə cəfa eyləsə, Vahid, yenə səbr et,
Eşq əhli əsiri-qəmi-canan ola, xoşdur.

* * *

Gözəlim, gözlərinin söhbəti hər yanda olur,
Bu məlahətli baxışlar quzu ceyranda olur.

Bir əlac et mənə, istəkli təbibim sənsən,
Aşiqin çarəsi öz sevdiyi cananda olur.

Bülbül istər gülü, tuti şəkəri, mən də səni,
Eşq sevdası bu üç aşiqi-nalanda olur.

Nə təbiət görüb ömründə, nə dünya yetirib,
O gözəllər ki, bizim Azərbaycanda olur.

Gül əgər bülbülü incitsə, vəfasız deməyin,
Qızların taqsırı olmaz, günah oğlanda olur.

Bu gözəllik ki, sənin var, gözəlim, insafən,
Nə mələkdə, nə pəridə, nə bir insanda olur.

Mübtəla könlümə bilməm, nə olub, hər gün itir,
Axtarırkən yenə ol zülfi-pərişanda olur.

Vahidin bəlli deyil məskəni pərvanə kimi,
Gah şəmə dolanır, gahi gülüstanda olur.

* * *

Bülbül gülü sevirsə də, gül xarə yar olur,
İstəklin əhli-hüsn ola, bietibar olur.

Layiq deyildir hər gözələ aşiq olmağın,
Qanuni-eşqi kim ki, bilər, bəxtiyar olur.

Etmək gərəkdir təcrübə eşqin bəlaların,
Səhv eyləyən bu işdə inan, qəmküsar olur.

Mən bir rəqibə mail olan yarə mailəm,
Gahi mənimlə, gahi rəqibə, düçar olur.

Lazımdır indi, səbr eləsin əhli-eşq olan,
İbrətlə baxmayan bu işə biqərar olur.

Kaş, eylə nazənin gözəli sevməyəydim heç,
Vahid, bu fikirdən ürəyim tarimar olur.

* * *

Qiyamə gəlsə qəddin, həşrdən əlamət olur,
Zəmanə əhli dəyər bir-birə, qiyamət olur.

Zəkati-hüsnün ilə al təsəddüq aşiqdən,
Həmişə fikrü xəyal eyləmə, vəcahət olur.

Gədayi-kuyinə zülm etməyi rəva görmə,
Cəfanı tərk elə, şahlarda ki, ədalət olur.

Qılırsa aləmi rövşən göy üzrə mah, vəli
Üzün şüasını hər kim görə, xəcalət olur.

Nə göydə şəmsü qəmər hüsnünə olur həmta,
Nə yerdə qönçədə ləlin kimi lətafət olur.

Həmişə mən sənə meylü məhəbbət eyləyirəm,
Və leyk səndən, əzizim, mənə ədavət olur.

Bu beş gün ömürdə təni-rəqibə döz, Vahid,
Kim ki, səbr edə, billəh, başı səlamət olur.

* * *

Aparır ayə fələk mehri-cəmalından nur,
Bədnəzərlər nəzərindən eləsin həq səni dur!

Xət gəlib arizi-cananı tutub sərtasər,
Sanasan, mülki-Süleymanı tutub ləşkəri-mur.

Küfr zülfün görüb, imanə gəlir kafirlər,
Çahi-zülmətdən o xurşidliqa qılsa zühur.

Yetər, ey mahi-təmamim, sənə nöqsan, həzər et,
Olma, gəl qəlbiqara kəslərə hər bəzmdə cur!

Tari-keysulərini tökdü, nigarim, üzünə,
Könlümün telləri tərpəndi necə naleyi-Şur.

Mənə, ey zahid, əgər verməsələr sevgilimi,
Nə gərəkdir mənə cənnətdəki qılman ilə hur?!

Bağlamışdır məni, Vahid, o pəri zülfü ilə,
İndi bildim ki, necə darə çəkilmiş Mənsur!

* * *

Zülm eyləmək eşq əhlinə, cana, nə üçündür?
Aşiq ki, verir canını – cananə üçündür.

Sevməz o qara zülfünü heç kimsə mənimtək,
Zəncirə həvəs eşqdə divanə üçündür.

Xəlq olmamısan aşiqi incitməyə, zalım!
Bax, gör bü gözəllik sənə, aya, nə üçündür?!

Hər aşiqin öz sevdiyi məşuqəsi vardır,
Gül bülbül üçün, şəm isə pərvanə üçündür.

Bülbül nə bəla çəksə yolunda sənin, ey gül,
Qəlbində məhəbbət yenə biganə üçündür.

Zahid buraxıb məscidi, meyxanəyə gəlməz,
Bayquş yaranandan bəri viranə üçündür.

Vahid, məni sərdəftəri-eşq içrə yazıblar,
Məcnun sözü dillərdə bir əfsanə üçündür.

* * *

Gül üzündə, gözəlim, zülfi-pərişan görünür,
Bağ içində, elə bil, sünbülü reyhan görünür.

Bülbül hər ləhzə fəğan eyləsə gər gülşəndə,
Gül görüb bülbülün əfğanını, xəndan görünür.

Səcdə etdim görərək çaki-giriban o gülü,
Sübhdür, sandım o dəm, mehri-dirəxşan görünür.

Mənə çox müşkül olur dərdü qəmi-hicranın,
Leyk biganə baxırsa, ona asan görünür.

Vəslə yetcək dedim: – Ey məh, yetirmə məqsudə!
Yetməmiş vəslinə, vəslin mənə hicran görünür.

Həmdəm olmuş o xətü xalına zülfi-siyəhin,
Əhsənullah, yenə küfr içrə müsəlman görünür.

Leylivəş bir sənəmin eşqi ilə Vahidi-zar,
Yenə Məcnun kimi sərgəşteyi-dövran görünür.

* * *

Bu cəfalər mənə ol mahliqadən görünür,
Nə cəfa qılsa əgər, yarü vəfadən görünür.

D e d i m : – Aşüftə edən kimdi o zülfi-siyahin,
D e d i : – Səndən deyil, ol badi-səbadən görünür.

Gər, həbibim mənə zülm etsə, cəfadən, nə əcəb!
Hər nə qədr cövrü cəfa qılsa, səxadən görünür.

Baxmayın eyd günü ayna ilə ayə, vəli
Mahi-nov ol iki əbruyi-dütadən görünür.

Məst çeşmindir baxan çini-səri-zülf içrə,
Ya ki, ey ayinərüx, ahu Xətadən görünür?

Vahida, etmə şikayət bu mələkrulərdən,
Bəxtimin tirəliyi çərxi-qəzadən görünür.

* * *

Məndən, könül, o nazlı nigarə nə dedin bəs?
Çəkdin o güləndamı kənarə, nə dedin bəs?

Əvvəl bunu bildim ki, dedin aşiqin öldü,
Ondan sora ol şuxə dübarə nə dedin bəs?

Mən məst yıxıldım o dilaramı görən tək,
Evlər yıxan o çeşmi-xumarə nə dedin bəs?

Meydənmi qızarmışdı onun arizi-ali,
Ziynət verən ol baği-baharə nə dedin bəs?

Mən xəsteyi-eşq olduğumu sordumu səndən,
Göstərdimi bimarinə çarə, nə dedin bəs?

Daği-qəmi-hicranə nəhayət verəcəkmi,
Bu barədə ol laləüzarə nə dedin bəs?

Dərdindən ölən Vahidi heç bir soruşurmu;
Ol bikəsi kim qoydu məzarə, nə dedin bəs?

* * *

Boynuma keysulərin ol şux zəncir eyləmiş,
Qətlimə əbrulərin cəllad şəmşir eyləmiş.

Əhd qılmışdı, məni öpsün ol mahim bu gün,
Bilmirəm, aya, neçin əhdində təxir eyləmiş.

Seyd qıldı gözləri şahbaz tək könlüm quşun,
Guyiya, səyyadi-bidil bəndi-nəxcir eyləmiş.

Qaşların tökməzdi qanım bunca, vazeh, bilmişəm,
Gözlərin bu qətlimə müjganını tir eyləmiş.

Aşiqin könlünü yıxma, yıx həsari-Kəbəni
Kim, Xəlilüllah onu aləmdə təmir eyləmiş.

Lütf edib qeyrə vüsalın, lakin ol məh aşiqin
Yüz qəmü dərd ilə hicrində o dilgir eyləmiş.

Vahida, umma, nigarın cövrü zülm etsə sənə,
Çün səni qalu bəladan çərxi-dun pir eyləmiş.

* * *

Bülbülün naleyi-cansuzuna bais gül imiş,
Gülə həm aşiqi-sərgəştə olan bülbül imiş.

Mən deyirdim ki, o məh mehrü vəfa sahibidir,
Demə bəs, mehrü vəfadan o özü qafil imiş!

Daşa təsir elədi, ahım oduyla yandı,
Bir əsər etmədi ol şuxə, nə ahəndil imiş!

Piri-meyxanə sözün şeyx qəbul elədi dün,
Adəm övladıdır, həqqa ki, hələ qabil imiş.

Yoxdur aşiq, dedi ol məh, mənə səndən qeyri,
Gizli məndən, demə, biganələrə mail imiş.

Eşqə dil verməz idim, bari qəmin bilsəydim?
Nə bilim, eşqdən üşşaqə bəla hasil imiş?

Vahida, müşkül işə xəlqdə səbr olsa əgər,
Olur tədric ilə asan hər iş, müşkül imiş.

* * *

Mən bilməmişdim, istədiyim qeyrə yar imiş,
Əvvəl vəfalı, axırı bietibar imiş!

Canan yolunda nalə ilə keçdi günlərim,
Eşq əhlinin nəsibi bütün ahü zar imiş!

Zülfünmü könlümü, gözəlim, tarimar edən,
Ya ki könül əzəldən elə tarimar imiş!

Ahu baxışlı gözlərinin mübtəlasiyəm,
Könlüm kəməndi-zülf ilə çoxdan şikar imiş!

Oldum əsiri bir gözəlin, indi bilmişəm,
Məcnun nə vəchdən vətənindən kənar imiş!

Fərhadə tənə eyləyəni səngisar edin,
Bax Bisütuna, eşqə o da yadigar imiş!

Vahid, olur ki, sevgi fəlakət də törədir,
Zənnimcə, eşqə mail olan bəxtiyar imiş!

* * *

Məcnun hələ də eşqdə divanə deyilmiş,
Leyli o zamanlar ona cananə deyilmiş.

Məcnunu giriftari-qəmi-eşq eləyən var,
Divanə deyənlər ona fərzanə deyilmiş.

Çox fərqi var, arif düşünər əql ilə eşqin,
Eşq əhli kamal əhlinə həmxanə deyilmiş.

Pərvanə yanır şövqi-cəmalınla, sanırdım,
Öz könlüm imiş hər gecə, pərvanə deyilmiş.

Zülfündə gəzən şanəni biganə bilirdim,
O, məhrəm imiş könlümə, biganə deyilmiş.

Pirimdən eşitdikdə xərabatiyi-eşqi,
Öyrəndim o gəncinəni, viranə deyilmiş.

Var üzrü, əgər sevməsə eşq əhlini zahid,
Məzurdur, onun təbi zərifanə deyilmiş.

Əlbəttə, həqiqət çıxacaq zahirə, Vahid,
Bir iş tap, onun əvvəli əfsanə deyilmiş.

* * *

Nigarım bəzmi-işrətdə belində xəncər əyləşmiş,
Məgər Nüşabə təxtində gəlib İsgəndər əyləşmiş!

Rəqibi-şuxi gördüm hüripeykərlər miyanində,
Guya ki, qəsri-cənnətdə gəlib bir kafər əyləşmiş.

Bu bəzmi-canfəzadə afitabi-aləmaramı,
Və ya cami-mey əldə ol büti-siminbər əyləşmiş.

Dəmi-möcüznümalərdən bulur can xalq məclisdə,
Deyildir küfr, zənnimcə, desəm peyğəmbər əyləşmiş!

Ruxi-dövründə görcək zülfi-pürçinin xəyal etdim,
Sərasər kişvəri-Daranı tutmuş ləşkər, əyləşmiş.

Busat əhlin bütün cəzb eyləmişdir çeşmi-məstilə,
Sanırsan, şəhri-Babildə gəlib cadugər əyləşmiş.

Bakı şairlərindən, Vahida, Yusifdi rəhmətlk,
O getdisə, onun indi yerində Azər əyləşmiş.

* * *

Artırar hüsnünü gəldikcə rüxi-dildarə xət,
Necə xoş olmaz əgər ağ üzrə olsa qarə xət.

Yox əcəb, tutsa ləbin dövrünü xəttin mur tək,
Mail olmuş mən kimi ol ləli-şəkkərbarə xət.

Xətti-reyhanın rüxün dövründə görmüş bağiban,
Səbzədən çəkmiş, odur kim, səfheyi-gülbarə xət.

Hindivü xalın mənimtək mehr salmış ruyinə
Ki, vətəndən etmiş ol biçarəni avarə xət.

Mehri-rüxsarın tutandan ol nigari-məhvəşin,
Eyləmiş zülfü kimi rövşən günümü qarə xət.

Ruzi-hicran ərzi-hal etmək sənə mümkün deyil,
Ol cəhətdən yazmışam kuyində hər divarə xət.

Vahidəm, eşq atəşiylə yandı canım şəm tək,
Eylə ki, gördüm çıxıb ol arizi-gülnarə xət.

* * *

Qaşların taği edib taği-kəlisanı şikəst,
Hüsnünün məshəfi İncil ilə Quranı şikəst.

Qarət eylər ərəqin dövrünü üzdən səri-zülf,
Qoyma hindubeçə qılsın dürri-qəltanı şikəst.

Həddi olmaz sənə həmtaliq edə şəmsü qəmər,
Şöleyi-hüsnün edər, mehri-dirəxşanı şikəst.

Gər bu qamətlə xüram eyləyərsən bağ içrə,
Tanri şahiddi, edər sərvi-xuramanı şikəst.

Ləblərin ləli-Yəməndir, dəhənin hoqqeyi-dürr,
Dişlərin dövri-ləbin eyləyər mərcanı şikəst.

Daneyi-xalını rüxsarın əra görsə əgər,
Zahid eylər təməi-rövzeyi-rizvanı şikəst.

Vəsf edər əhli-riya Vahidə qılmanü behişt,
Bilməyir, yarım edər hüriyü qılmanı şikəst.

* * *

Həmişə eşqinlə eylərəm fəğan, ey dost,
Olubdur hər tərəfə göz yaşım rəvan, ey dost.

Gərək müdam eləyəm nalə əndəlibasa,
Bahari-ömrümü sən eylədin xəzan, ey dost.

O gül cəmalına həsrət qoyubsan aşiqini,
Məni fəraqın edib çünki bağrıqan, ey dost.

Əlimdən aldı səni gərdişi-zəmanə, odur,
Fələk cəfası edib qəddimi kəman, ey dost.

Könül vətən eləmiş zülfün içrə, müddətdir,
Qəribü bikəsə lazımdır bir məkan, ey dost.

Nə qədər səbr qılım firqətin cəfasına mən,
Fəraq tirinə, könlüm olub nişan, ey dost.

Şikəstə Vahidi salmış bəlayə hicranın,
Yoxumdu təqatü tabım, gedib təvan, ey dost.

* * *

Töküb rüxsari-alına nigarım zülfi-mişkinbu,
Sanarsan, xotteyi-Rumi tutubdur ləşkəri-hindu.

Nə canan, afəti-dövran, üzü qarətgəri-iman!
Kəman əbruyi-mişkinmu nikuru eyləyib çadxu.

Həzər qıl, ey dəli könlüm, səri-zülfünə bənd olma,
Salar kim, seydvəş damə səni ol həlqeyi-keysu.

Vuranda zülfünə şanə o yari-afəti-dövran,
Olur üşşaqlər giryan ki, bəlkə, şanə salsın mu.

Qəmindən müttəsil xəmdir, nigara, Vahidin qəddi,
Zəkati-hüsnünü lütf et, ona sən, ey kəmanəbru.

* * *

Səni görcək dedim, ey dil, nə dilaradır bu?!
Bu qədər cazibə var bunda – Züleyxadır bu.

Can verir naz ilə, min can alır aşiqlərdən,
Gündə min möcüzə var bunda, Məsihadır bu?

Bircə Məcnun idi Leylanı sevib aşiq olan,
Buna min aşiq olan var, necə Leyladır bu!

Eşq dərdin çəkən aşiq meyi-nab içməlidir,
Piri-meyxanə özü verdiyi fitvadır bu.

Zülf sevdası məni gör necə başdan çıxarıb,
Bircə mən bilmədim, axır ki, nə sevdadır bu?!

Gözəlim, aləmə minlərcə gözəllər gələcək,
Çox da hüsnünə fəxr eyləmə, dünyadır bu.

Mənə yüz dəfə vəfasızlıq edən bir gözəli
Sevirəm mən yenə, göz bir, nə müəmmadır bu!

Sən tamaşa elə, Vahid, bu pəriçöhrələrə,
Fürsəti fövt eləmə, yaxşı tamaşadır bu.

* * *

Səni gördükdə dedim: – Xosrovi-xubandır bu,
Bu vəcahətlə, həqiqət, məhi-Kənandır bu.

Dili-qəmginimi şad etdin, atıb qəmzə oxun,
Sənə qurban olum, ey şux, nə ehsandır bu?!

Xəttü xalın görüb ol məshəfi-ruyində, dedim,
Bu səvad ilə yəqin nöqteyi-Qurandır bu.

Mənə peyvəstə nə ox atsa ol əbruyi-kaman,
Dil basar bağrına, gəldikcə deyər candır bu.

Ey deyən eyləmə hicran günü fəryadü fəğan,
Necə fəryadü fəğan etməyim, hicrandır bu!

Çünki çox görmüşəm əğyarə vəfa eylədiyin,
Bivəfa söyləsə hər kim sənə, böhtandır bu.

Xalq söylər məni, Vahid, görüb ol zülfə əsir,
Filhəqiqət, hələ divaneyi-dövrandır bu.

* * *

Dindirmədi, ey dil, səni canan, əcəb oldu!
Etdin nə qədər naləvü əfğan, əcəb oldu!

Yüz dəfə dedim, vəsl təmənnasına düşmə,
Yandırdı səni möhnətü hicran, əcəb oldu!

Gülüzlü gözəl yarın olub qeyrilə həmdəm,
Çıxsın gözün, olsun ciyərin qan, əcəb oldu!

Ol zülfə könül, vermə, dedim, qoy desin aləm
İndi sənə divaneyi-dövran, əcəb oldu!

Qoydun niyə əğyarı yaxın kuyinə yarın?
Cənnətdən uzaqlaşmadı şeytan, əcəb oldu!

Vahid, elə bir dövrdə gəldik bu cahanə,
Bir gözdə göründü bütün insan, əcəb oldu!

* * *

Mənimlə mehriban yarım nədən namehriban oldu?
Uyub biganəyə öz aşiqindən bədgüman oldu.

İki canan sevən məhparələr neyçin xəyal etməz?
Ki, Züleyxa Yusifin eşqiylə rüsvayi-cahan oldu?

Həyatın ləzzətindən bivəfalar zövqsüz qalmış,
Vəfasız olduğundan bülbülə gül bağrıqan oldu.

İki bülbül sevən gül görməmişdim ömr bağında,
Özüm gördüm, mənə indi bu, dərsi-imtahan oldu.

Nə məndən əl çəkir ol gül, nə öz istəkli yarından,
Bu sirri mən düşündükcə bahar ömrüm xəzan oldu.

Məhəbbət aləmi bir başqa aləmmiş, təbiət də
Qəribə bir müəmmadır, mənə indi əyan oldu.

Xəta etdim, könül verdim vəfasız nazənin yarə,
Bu cüzi eşqimiz, Vahid, dönüb bir dasitan oldu.

* * *

Ey gül, səni axır, bilirəm, öyrədən oldu!
Saldın məni hicranə, bu bilməm, nədən oldu?

Dözdüm nə qədər zəhmətə, hər nazını çəkdim,
Könlüm qəmi-eşqinlə əsiri-mihən oldu.

Sən böylə vəfasız da deyildin, bilirəm mən,
Zənnimcə, səni bu işə təhrik edən oldu.

Rüsvayi-cahan eylədin axır məni, getdin,
İndi mənə biganə gəlib tənəzən oldu.

Bir vaxt peşiman olacaqsan bu əməldən,
Səndən bu işin bəlkə hesabın çəkən oldu.

Gəzdin, gözəlim, qeyr ilə, mən dərdini çəkdim,
Gəldi nə bəla başıma, bu, qüssədən oldu.

Vahid o gülün vəslinə biganə yetişdi,
Dərdin çəkən aləmdə bir ancaq Həsən oldu.

* * *

Ey gül, səni hər kəs ki, sevib bəxtəvər oldu,
Eşqində bir ancaq mənim ömrüm hədər oldu.

Kim sevdi qara zülfünü, ağ günlərə çıxdı,
Tale mənə yar olmadı, bir dərdi-sər oldu.

Mən ağladım öz halıma, biganə sevindi,
Şükr eylə ki, mən qaldım, o məndən betər oldu.

Kuyində mənə zülm eləyəndən biri qalmıb,
Ahım odu yandırdı, hamı dərbədər oldu.

Yıxmaqdı məni məqsədi namərd rəqibin,
Bar vermədi məqsudi, bütün bisəmər oldu.

Ayrılmaz idik bir-birimizdən, aramızda,
Göz dəydi bizə, bəlkə də, bir bədnəzər oldu.

Ev yıxmağı, qan tökməyi zənn etmə hünərdir.
Hər kim vətənin sevdi, o əhli-hünər oldu.

Vəhşiliyə, namərdliyə, nadanlığa nifrət!
İnsanlıq ilə ömr eləyən bəxtəvər oldu.

Səndən sora, Vahid, ayıq ol, qoy deməsinlər,
Dünyaya gəlib-getdi, hayıf, bixəbər oldu.

* * *

Fəxr etdik, o gül bəlkə bizim yarımız oldu,
Tale bizə yar olmadı, əğyarımız oldu.

Aşiqlərə bülbül dedilər, biz də sevindik,
Hər bir gülə verdikdə könül, xarımız oldu.

Durduq bir ümid ilə gözəllər tərəfində,
Mindən birisi bəlkə tərəfdarımız oldu.

Sevdayi-qəmi-eşq idi sərmayəmiz əldə,
Nə öylə xiridar, nə bazarımız oldu.

Təkfir ilə zikr etdi bizi mollanümalər.
Zahid dediyi cənnətə inkarımız oldu.

Yar etdi cəfalar bizə, biganədən umduq,
Düşmən bizə öz sevgili dildarımız oldu.

Vahid, fələyə əyməmişik sərvət üçün baş,
Sərvət bizə öz gövhəri-əşarımız oldu.

* * *

Coşdu mey, bənzədələr bəlkə ləbi-yarə onu,
Bu öyünməkliyi tez saldı ayaqlarə onu.

Gəzdi əldən-ələ, ayinə də çox fəxr elədi,
Aqibət əksi-rüxün söykədi divarə onu.

Gül də etmişdi camalinlə gözəllik bəhsin,
Çəkdi axırda o yüngüllüyü bazarə onu.

Ey deyən, eşqdə pərvanə məhəbbət nə bilir,
Bəs nə məcbur eləyir yanmağa odlarə onu?

Məni cananimə həsrət qoyanı, istəmişəm
Tale həsrət qoya öz sevdiyi dildarə onu!

Mən desəm, gəzmə rəqib ilə, nə mənası onun?
Özü bilsin gərək ol dilbəri-məhparə onu.

Deməyin, eşqə düşən aşiqə olmaz çarə,
Özü çox yaxşı bilir Vahidi-biçarə onu.

* * *

Zülfün götür üzdən dedim, ol məh şəkə düşdü,
Ayinə kimi könlünə, gördüm, ləkə düşdü.

Əbrulərinə tiğ dedim, qanımı tökdü,
Qan eyləməmiş gör nə böyük mərəkə düşdü!

Bildim ki, məni öldürəcək naz ilə ol şux,
Bu vahimədən qəlbimə min səksəkə düşdü.

Cövr etmə, dedim, aşiqinə rəhm elə, ey gül,
Çox zülm edən axırda gəlib pis kökə düşdü.

Zahid mənə tərk eylə, dedi, badeyi-nabı,
Bir söz dedi, yüz dəfə başından yekə düşdü.

Gah könlümü istər ala qəmzən, gəhi çeşmin,
Biçarəni gör bir necə çəkhaçəkə düşdü.

Vahid nə qədər incə qəzəllər demiş, amma
Başdan-başa bu bir qəzəli məzhəkə düşdü.

* * *

Qıldın əsir türryei-tərrarə könlümü,
Zəncirə bağladın bu günü qarə könlümü.

Qıldım xəta, cəmalına bir eylədim nəzər,
Saldın kəməndi-zülfünə biçarə könlümü.

Atdın həmişə səngi-cəfa, şişə könlümə,
Sındırdın, almadın ələ sədparə könlümü.

Sinəm bərabərində ölümdən ki qorxmuram,
Eylə nişanə birbəbir oxlarə könlümü.

Zülfün salıb kəməndə məni, dəstgir edib,
Mənsur tək gərəkdi çəkə darə könlümü.

Qanım tökəndə xəncərü tiri-nigah ilə,
Bir də, dübarə yarələmə yarə könlümü.

Aşiqlər içrə eşq büsatında Vahidəm,
Zülfün xəyalı eyləyib avarə könlümü.

* * *

Hər aşiqin ki möhnəti var, ağlar, ağlamaz?!
Vəsli-nigara həsrəti var, ağlar, ağlamaz?!

Bir bivəfa nigardan ötrü gəda kimi,
Xain rəqibə minnəti var, ağlar, ağlamaz?!

Eldən düşüb kənara, vətəndən uzaqlaşıb,
Qürbətdə min əziyyəti var, ağlar, ağlamaz?!

İstəkli dilbəri gedib əğyarə yar olub,
Bədnam olub, xəcaləti var, ağlar, ağlamaz?!

Yarəb, o kəs ki, mərd ola, namərd zalımın
Daim ona xəyanəti var, ağlar, ağlamaz?!

Məğrur olub o kimsə, yox əsli, nəcabəti,
Kim əhl olub, nəcabəti var, ağlar, ağlamaz?!

Yandırsa, Vahida, fələyi ahim atəşi,
Ondan kimin şikayəti var, ağlar, ağlamaz?!

* * *

Daim bu gözəllik o cəfapişədə qalmaz,
Tünd olsa, axar qanı meyin – şişədə qalmaz.

Şirin sözün ol lalərüxün gər görə Fərhad,
Dağı çalar öz başına, bir tişə də qalmaz.

Bir zərrə əgər mehrini görsəydim o mahın,
Ölsəm də, nə qəm, ruhum o əndişədə qalmaz.

Müjganları qanlar içər ol mərdümi-çeşmin,
Kim der ki, əsər bərgə yetər, rişədə qalmaz?

Vahid, bu gözəldir ki, deyib Gəncəli Şövqi:
"Gül qönçədə, söz qəlbdə, mey şişədə qalmaz".

* * *

Hər gül açıla, ol güli-rəna kimi olmaz,
Hər aşiq olan bülbüli-şeyda kimi olmaz!

Minlərcə bu dünyaya gözəllər gələ bir də,
Mən sevdiyim ol şuxi-dilara kimi olmaz!

Güldən o təmənnanı ki, bülbül qılır hərdən,
Min başqa təmənna bu təmənna kimi olmaz!

Fəxr etməsin öz sevdiyi Leylasına Məcnun,
Min Leyli əgər gəlsə, bu Leyla kimi olmaz!

Vahid, demə çox, ətirli güllər yetişibdir,
Hər ətir gəlib ənbəri-sara kimi olmaz!

* * *

Könül mürğü səri-zülfündən, ey gül, bil, kənar olmaz!
Əsiri-eşq olanlartək ona bir rəhgüzar olmaz.

Edər bədməstlik daim xumarasa siyəh çeşmin,
Töküb eşq əhlinin qanın ki, bir an huşiyar olmaz.

Vurarlar tənə daşilə məni biganələr sənsiz,
Odur kim, bu sınıq könlüm yerində bərqərar olmaz.

Camalın şəminə, ey məh, yanar şamü səhər könlüm,
Nə pərvanə yanar mən tək, nə ruyin kimi nar olmaz.

Gəlib tən eyləyər sənsiz mənə biganə gördükdə,
Təəccübdür, mənim hali-dilimdən şərmsar olmaz!

Səri-kuyində müddətdir, dolannam zarü sərgərdan,
Fəraqından təni-zarımda bir dəm ixtiyar olmaz.

Bu söz zərbülməsəldir, xəlq içində söylənir, Vahid,
Vəfa umma gözəllərdən, gözəldə etibar olmaz!

* * *

Ey gül, məni sən istəsən, ömrüm hədər olmaz!
Sülh olmasa, övladi-Vətən bəxtəvər olmaz!

Azadəliyi, sülhü sevirlər bizim ellər,
Bir yerdə ki, sülh olsa, o yerdən zərər olmaz!

Odlar Vətənin nazlı gözəllər bürüyübdür,
Ellərdə məsəl var ki, gözəlsiz şəhər olmaz!

Ahim odu, bəlkə, eləsin qəlbinə təsir,
Neysan suyunu içməsə, daşdan göhər olmaz!

Hicran gecəsi mən çəkəni çəkməsin əğyar,
Zənnimcə, qiyamət günü bundan betər olmaz!

Zülfün üzünü tutsa da, göyçəkliyin artır,
Zülmət gecələr olmasa, aydın səhər olmaz!

Vahid, sənə, qəm çəkmə, rəqabət edən olsa,
Min göl qovuşa bir yerə, bəhri-Xəzər olmaz!

* * *

Zülfün niyə bir an, gözəlim, şanəsiz olmaz?
Adət belədir, eşq evi biganəsiz olmaz!

Tən eyləmə, zülfündən uzaqlaşmasa könlüm,
Bir yerdə ki zəncir ola, divanəsiz olmaz!

Qəmdən yanaram, ruyini göstərmə rəqibə,
Bir şəm ki, şövq artıra, pərvanəsiz olmaz!

Məxmur gözün qoymadı bir könlümü rahət,
Bir dəm bu sitəm xanəsi məstanəsiz olmaz!

Sən şövqi-ləbi-yar ilə iç badə içəndə,
Kimdir deyə, mey məclisi peymanəsiz olmaz?!

Bir dilbərin eşqində bütün dillərə düşdüm,
Həngamədir eşq aləmi, əfsanəsiz olmaz!

Vahid mey içir gizli, deyirlərdi, eşitdim,
O, rindi-xərabatıdı, meyxanəsiz olmaz!

* * *

Gözətlərəm yolunu – yari mehriban gəlməz,
Rəqibə yar olub ol məhluqə, güman, gəlməz.

Qərarü səbrimi əldən alıbdır hicrani,
Gecə səbaha kimi eylərəm fəğan, gəlməz.

Qılıbdır tərki-vətən dilbərim qəribasa
Ki, qürbət ölkələr içrə edib məkan, gəlməz.

O gül vüsalinə həsrət qoyubdur aşiqini,
Edib fəraqində bu göz yaşımı rəvan, gəlməz.

Nə qurtarır məni qəmdən, gəlib nə canım alır,
İlahi, başımın üstə o canalan gəlməz.

Cəfayi-dilbərə, ey dil, həmişə səbr eylə,
Nə gəlsə, aşiqə məşuqədən ziyan gəlməz,

Bu dərdü qüssə əlindən şikəstə Vahidini
Xilas etməyə ol şahi-məhvəşan gəlməz.

* * *

Xilqətdə sənintək, gözəlim, can ola bilməz,
Əxlaqı gözəl, sevgili canan ola bilməz!

Fəxr eyləməsin öz gülünə bülbüli-şeyda,
Bir gül hələ də sən kimi xəndan ola bilməz!

Minlərcə gözəllər yetirir gündə təbiət,
Amma sənə bənzər gözəl insan ola bilməz!

Yüzlərcə əgər hüsnünə adam ola heyran,
Bir kimsə mənimtək sənə heyran ola bilməz!

Sən tərbiyədə, hüsndə bir başqa gözəlsən,
Rəftarinə, əxlaqinə nöqsan ola bilməz!

Hürriyyətə, insanlığa layiq səni gördüm,
Hər kəs səni sevmişsə, peşiman ola bilməz!

Öz aşiqinin naz ilə qan eyləmə könlün,
Hürriyyət olan yerdə könül qan ola bilməz!

Hər xoş görünən kimsəyə aldanma heyifsən,
Hər xoş görünən kimsədə vicdan ola bilməz!

Bu hüsnlə çoxlar səni istər sevə, ey gül,
Vahid kimi eşqində qəzəlxan ola bilməz!

* * *

Könül, əsir olalı, zülfi-yarə hər ikimiz,
O gündən olduq əcəb, bəxtiqarə hər ikimiz.

Nə qəm, əhatə bizi etsə əşk tufanı,
Xilas olub çıxarıq bir kənarə hər ikimiz.

Bu mahiparələr eşqindən əl çəkən deyilik,
Bu yolda olsaq əgər parə-parə hər ikimiz.

Mənimlə eşqdə, guya ki, bülbül həmdəm olub,
Gələndə bir gəlirik ahü zarə hər ikimiz.

O öz gülüyçün edir nalə, mən nigarım üçün,
Bu növü gəlmişik axır qərarə hər ikimiz.

Şəm içrə yanmağı pərvanə dərs alıb məndən,
Odur ki, mailik eşq içrə narə hər ikimiz.

Bu əhdi eyləmişəm, Vahid, öz nigarım ilə:
Çıxanda birgə çıxaq laləzarə hər ikimiz.

* * *

Sənin cəmalın ilə fəxr edir bizim elimiz!
Sən olmasan, nəyə lazım baharımız, gülümüz?

Güləndə gül dodağın qəlbimiz sevinclə dolur,
Fərəhlənir səni görcək çəməndə bülbülümüz.

Bu ölkənin sənə qarşı böyük məhəbbəti var,
Səninlə xoş keçinir ruzigarımız, ilimiz.

Bu sadəlik, bu gözəllik böyük səadətdir,
Vətəndə yox sənə bənzər həqiqi sevgilimiz!

Tərəhhüm eylə bizə, ey gözəllərin mələyi,
Yanında özgələrin qoy qısalmasın dilimiz.

Səni sevənlərinin biz də aşinalarıyıq,
Cahanı axtarasan, yox bizim müqabilimiz.

Görünmədən bizə, Vahid, bu bir səadətdir,
Bu ilki bayramı da oldu yar mailimiz.

* * *

Həqiqi olsa idi, sevgilim, məhəbbətimiz,
Sevinc ilə yaşadardı bizi həqiqətimiz.

Səbəb nə oldu, deyirlər, o güldən incimisən,
Səbəb budur ki, müvafiq deyil təbiətimiz.

Gərək deyil bizə cənnət, nə cənnət huriləri,
Vətən gözəlləri huri, Vətən də cənnətimiz!

Vətən məhəbbəti olmazsa, məhv olub gedərik,
Vətənlə daim olur eşqi-zövqə rəğbətimiz.

Ol ahu gözlü hələ düşməyir kəməndə yaxın,
Neçin ki, bizdən onu hürküdür qiyafətimiz.

Vətən gözəlləri artdıqca xəlqimiz sevinir,
Var indi öz gülümüz, özgədən nə minnətimiz?

Murada yetdi rəqib, ey fələk, xərab olasan!
Nə vaxtadək qalacaq könlümüzdə həsrətimiz?

Bu sevgidən gərək indi biz istifadə edək,
Cavan ikən nə qədər əldə vardı fürsətimiz.

Biz aşiqik, gərək eşq aləmində nalə edək,
Neçin ki ruzi-əzəldən bu oldu qismətimiz.

Görəndə Vahidi dərd əhlidir, çox incitmə,
Bizim də var ona, ey gül, bir azca hörmətimiz.

* * *

Könlüm açıldı zülfünü gördükdə şanəsiz,
Biganə batdı matəmə, qaldı nişanəsiz.

Göstərmə gül cəmalını, artırma naləmi,
Bülbül bahar olanda dayanmaz təranəsiz.

Daim gözün xəyalını könlümdə bəslərəm,
Bimarı kim görübdür, ola xəstəxanəsiz?

Cəllad min bəhanə ilə qəsdi-can edər.
Sən öldürürsən aşiqi hər gün bəhanəsiz.

Zülfündən ayrı ruhum uçur, axtarır səni,
Sakit olarmı, bir quş ola aşiyanəsiz?

Hər yerdə, Vahid, indi sənin söhbətin gedir,
Xalqın sevən bir aşiq olarmı fəsanəsiz?

* * *

Eşqin məni döndərdi, gülüm, bülbülə sənsiz,
Könlüm tutulur, baxsam əgər bir gülə sənsiz.

Zülfün ucu göstərdi mənə eşq kəməndin,
Düşdüm yenə Məcnun kimi dildən-dilə sənsiz.

Gördüm üzünü fikri bir ay qaldı sərimdə,
Gözlərdən iraq döndü keçən bir ilə sənsiz.

Leylası üçün dözmədi bir möhnətə Məcnun,
Haqq aşiqiyəm, dözmüşəm hər müşkülə sənsiz.

Hər aşiqin öz yarınadır meyli, mənim də
Meylim gülə yoxdur, həvəsim sünbülə sənsiz.

Sən görsən əgər Vahidi rəhmin gələr, ey gül,
Biçarə edir ahü fəğan bir belə sənsiz!

* * *

S ə y y a r

Göz mərdümi ki, əşk tökər bir gilə sənsiz,
Bir tifldir, ağlar, mənə eylər gilə sənsiz.

V a h i d

Bilməm, yenə çeşmin nə xəta eyləmiş, ey büt,
Min fitnə düşüb məmləkəti-Babilə sənsiz.

B ə d r i

Bir guşeyi-çeşm ilə dönüb baxmaram, ey gül,
Dünyaya gözəllər gələ min qafilə, sənsiz.

V a h i d

Zövrəq kimi əmvaci-qəm içrə elə qərqəm,
Tufan da çıxarmaz məni bir sahilə sənsiz.

B ə d r i

Yüz dəfə əgər şəmi-rüxünlə dili-aşiq
Pərvanə kimi yansa da, gəlməz dilə sənsiz.

Vahid

Şur ilə görüb naləmi eşqində müğənni,
Tərk etdi "Nəva" pərdəsini "Zabilə" sənsiz.

Ta görməsəm ol müshəfi-rüxsarini bir də,
Min canım ola, verməərəm Əzrailə sənsiz.

Ey lalərüxüm, Bədriyə heyranəm əzəldən,
Dözmüş necə hicranına min dağ ilə sənsiz!

Vahid nə demişlər yenə Səyyar ilə Bədri,
Bir bilmədim, ol dilbəri-şirindilə sənsiz?

* * *

Çəkdi səni tale bu gülüstanə, gözəl qız!
Şövq ilə yanaş bülbüli-nalanə, gözəl qız!

Sən şəminə öz sevgili pərvanəni yandır,
Batsın həsədindən qəmə biganə, gözəl qız!

Öz qaynatanı, qaynananı dindir ədəblə,
Düşsün bu gözəl şöhrətin hər yanə, gözəl qız!

Artsın şərəfin cümlə qohum-qonşu yanında,
İş gör ki, ola layiq o insanə, gözəl qız!

Biz oğlumuzu tapşırırıq bir sənə yalnız,
Ancaq səni də sevdiyin oğlanə, gözəl qız!

Namusla, şərəflə yetirin siz başa ömrü,
Mərd ailə vurmaz ləkə vicdanə, gözəl qız!

Qiymətli qəzəldir, bunu Vahid sənə yazmış,
Sənsən sədəfi-ismətə dürdanə, gözəl qız!

* * *

Vardı kuyində, xoş ol dəm ki, nigahbanlığımız,
Bu gədalıqda idi aləmə sultanlığımız!

Ağla hicran günü, ey mərdümi-çeşmim, gecələr,
Bir səhər güldürəcəkdir bizi giryanlığımız.

Yarə can verməyə yol vermədi kuyində rəqib,
Nəzr qıldıqsa, qəbul olmadı qurbanlığımız.

Fariq olsaq, nola məcmuyi-pərişanlıqdan,
Bağlıdır türreyi-canana pərişanlığımız.

Ləbi-canan var ikən çeşmeyi-heyvan sevirik,
Adəm olsaq, bizə yetməzmi bu heyvanlığımız?

Ey könül, indi vüsal aləminin qədrini bil,
Bir səmər verməyəcək sonra peşimanlığımız!

Gərək insanlığa dair çalışaq, Vahid, əgər
İstəsək, aləmə məşhur ola insanlığımız.

* * *

Yarəb, tükəndi cəhl ilə səbrü qərarımız,
Oldu ziyadə möhnəti-qəlbi-fikarımız.

Məhrum qıldı cəhl bizi feyzi-elmdən,
Heyfa ki, keçdi qəflət ilə ruzigarımız.

Məstdir şərabi-qəflət ilə cümləmiz müdam,
Billah, görünməyir gözə bir huşyarımız.

Qəm bəstərində dərdü qəmə olmuşuq düçar,
Yox bir təbibi-haziq, ola qəmküsarımız.

Zahid salıbdı bizləri dami-cəhalətə,
Müşkül o damidən ola bir dəm fərarımız.

Dünyada elmsiz yaşayıb gün keçirmədən
Yeydir ki, məhv olub, yox ola cümlə varımız.

Vahid şikəstə bülbültək eyləyir fəğan,
Solmuş xəzani-cəhl ilə bağü baharımız.

* * *

Təngdir qönçə dəhanın, gec gəlir avazə söz,
Bir sənəmdir – nazənin, qoymuş özünü nazə söz.

Sordum ağzın sirrini hər kimsədən, ey tazə gül
Tapmadı, yüz min xəyal etdi, bu məxfi razə söz.

Dərk qılmaz zahidi-bizövq kim, nazik sözü,
Çox çətin qandırmaq olsun mərdümi-qanmazə söz.

Söz bir oxdur sinəmə dəydikcə, ey qaşı kaman,
At könül şəhrinə, açsın eşq üçün dərvazə söz.

Rişteyi-canimlə ahım suzəni hər gün çəkər,
Cildi-sinəmdə hədisi-eşqinə şirazə söz.

Yetməz, ey mahim, təmamə vəsfi-hüsnün xəlq əra,
Gər qəza katibləri yüz min kitabə yazə söz.

Olmasa ustad bəzmində sözün, Vahid, qəbul,
Pirlər yazsın cavanlarçın yenə bir tazə söz.

* * *

Dün gecə açdı nigarım üzünü ay kimi,
Gördüm ol mahın əyilmiş qaşını yay kimi.

Sürəti-tiri-nigahını təsəvvür elədim,
Ki, gəlir sinəmə şəst ilə tramvay kimi.

Eşq bazarının aləmdə mənəm həmmalı,
Almışam çiynimə qəm yüklərini tay kimi.

Saldı gözdən məni ol sərvi-rəvanım, getdi,
Gözümün yaşı fərağında axır çay kimi.

Gördüm həmsöhbət olub qeyr ilə şirin-şirin,
Bu həsəd qıldı əsər könlümə əzvay kimi.

Vahida, qaldın hamından geri, çox acizsən,
Ciddü cəhd eylə ki, lap olmuyasan zay kimi.

* * *

Səhvdir, müşk desəm türreyi-əmbər muyə,
Bu xətadır, səni nisbət qılayım ahuyə.

Zülfünün qeydini çəkdik qəmi-hicrin ilə,
Ruzigarım dönüb, ey mahi-təbi-zücüyə.

Taəti-məscidü mehrabə baş əyməz zahid,
Qılsa bir dəfə nəzər gər o kaman əbruyə.

Mən edir eşqdən üşşaqini, bilmir səbəbin,
Zahidi-qafilə bax, gör nə gedib uyquyə!

Dilbəra, baxma çox ayinədə əksi-rüxinə,
Tuti göftarə gəlir, baxsa əgər güzguyə.

Pasiban olmuş o gənci-ruxinə xali-siyah,
Tapşırıbsan niyə cənnət açarın hinduyə?

Atəşi-ahim ilə göydə yanar kövkəblər,
Bir də ahim əsər etməz, o büti-məhruyə.

Bağban görsə güli-ruyini gülşəndə, gülüm,
Kafərəm, bir də salam meyl güli-xoşbuyə.

Vahidi dəfn eləyin rəhgüzərində o məhin,
Bəlkə, təsir edə, qəbrim görüb o bədxuyə.

* * *

Bixəbərdir zahid ol kim, sərv qamətdən hənuz,
Vəsf edər aşiqlərə ruzi-qiyamətdən hənuz.

Adət etmiş aşiqə tənü məlamət etməyi,
Heç usanmaz zahidi-qafil bu adətdən hənuz.

Qaşların tağın görüb məscid əra mehrabdə,
Baş götürməz ol səbəb zahid ibadətdən hənuz.

Qarət eylər zülfi-ruyindənərağ dürrünü kim,
Çəkməz əl ol üzü qarə oğru qarətdən hənuz.

Ləli-nabin rəngini bir dəfə cam içrə görüb,
Mey dönübdür qanə, ey gül, ol əlamətdən hənuz.

Kəbeyi-taqə qaşın nisbət qılan bilməzmi kim,
Ol səbəbdən düşməmiş Kəbə şərafətdən hənuz.

El məlamət daşilə hey səngisar eylər məni,
Vahidəm, çevrəmdə var səngi məlamətdən hənuz.



## OLMADIM ŞAD

Olmadım bir ləhzə, yarəb, bu vətən küncündə şad,
Səbrim əksildi günü-gündən, qəmim oldu ziyad,
Bivəfa gördüm, kimə dünyada etdim etimad,
Çərxi-dun sübhü məsa oldu mənimlə kəcinad,
Əlaman, çərxi-sitəmkarın əlindən dad, dad.

Rəhmsiz səyyadi-çərxə seydvəş oldum şikar,
Dami-fəqrə payibənd etdi məni ol kəcmədar,
Mərdümi-iqbalimi çərx eylədi dərdə düçar,
Söndürüb iqbalımın şəmin edibdir tirətar.
Yetdi daim çərxi-bədxudən mənə zülmü fəsad.

Dövr zülm etdi mənə peyvəstə, çərci-bihicab,
Atəşi fərq içrə yandırdı məni, qıldı kabab.
Etmədi ahü fəqanimdən fələk şiçictinab,
Qalmayıb bir mu qədər ol zülmü qəmdən məndə tab
Aglar oldu halıma, əhvalım hər kəs qıldı yad.

Dərdü qəmdir bəstəri-eşq içrə hər gün həmdəmim,
Bir müalic tapmadım, ta eyləsin nəfi-qəmim,
Buteyi-dərdü qəm içrə yandı, məhv oldu tənim,
Böyləmi keçsin, rəvadırmı; həbibim, aləmim?
Bəs deyilmi, çərxi-dun eylər mənə bunca inad?

Gəldi könlüm təngə, Vahid, qüsseyi-dövrandən,
Yoxdu bir kimsə xəbər tutsun məni-nalandən,
Bedtər oldu xaneyi-dünya mənə zindandən,
Səbrü aramım kəsildi naləvü əfqandən,
Qüsseyi-dərdü bəladən olmadım bir ləhzə şad.

## İMDAD QIL

Qardaşım, təhsili-elmə aç gözün, imdad qıl!
Elm oxu, bilmərrə cəhli xatirindən yad qıl!

Elmsiz insan olur daim bəlayə mübtəla,
Elm ilə dərdi kənar et, qəmli könlün şad qıl!

Köhləni-nəfsi dayandır, əqli parlat, et, gözüm,
Elm evin abad, cəhlin xanəsin bərbad qıl!

Məstsən qəflət şərabında, həmiyyət vaxıtdır,
Huşyar olmaqlığa öz xalqını mötad qıl!

Qıl vətən övladına təlim elmü sənəti,
Cəhldən qaytar tamamin, elmdə ustad qıl!

Qeyrlər icad edirlər telqraf, telfon, müdam,
Sən də bir məktəb vətən övladına icad qıl!

Xalqına fürsət var ikən xidmət et, Vahid, müdam,
Ta ki sən də bu sədaqətlə cahanda ad qıl!

## DÜŞÜNCƏ

Ahım şərəri yetsə, nolur ərşi-bərinə,
Səbr etmək olurmu vətənin dərdi-sərinə?

Cəmşidi-cəmə, gör ki, zər axır nələr etdi,
Ey fəxr eləyən sübhü məsa simü zərinə?!

Bilməz vətənin qədrini ol kəs ki, dənidir,
Sərraf tanır gövhəri, yetcək nəzərinə.

Zahid, nə yatıbsan, hamı millətlər oyandı,
Qafil, gözün aç, uyma cəhalət səfərinə.

Cəngahidə düşməndən həras eyləməz əsla,
Bir mərd ki, məğrur ola daim hünərinə.

Bir Kəbeyi-əhli ürəfadır vətən, ey dil!
Şənü şərəfi yetmiş onun ərşi-bərinə.

Vahiddən umub, şerinə naqis demə, zira
Bitəcrübədir, görməmiş əsarü qərinə.

## ETMƏZ

Ləzzəti-xeyri görən şər işə iqdam etməz,
Mərdi-aqil özünü nakəsi-əyyam etməz.

Bir kəs ki ola bil əslü nəsəbdən ali,
Aqibət mərd isə kəndisini bədnam etməz.

Mərdi-baqeyrət olan qeyrət ilə gün keçirər.
Yəni bir ölmək üçün düşmənə ikram etməz.

Ədlü insafı olan zülm eləməz məzlumə,
Rəhmsizlik kişini sahibi-ehkam etməz.

Mərifət badəsini nuş edə hər kimsə əgər,
Bir də, zənnimcə, o heç mayili-günfam etməz.

Zahidasa füqəra malına tikməz gözünü,
Nücəbazadə özün dəhrdə bədnam etməz.

Vahid, hər kimsə ki, öz nəfü ziyanın bilsə,
Olar asudə cahan içrə, günün şam etməz.

## ƏDALƏT

İzhar ola gər pərtövi-ruxsari-ədalət,
Dünyanı tutar büsbütün ənvari-ədalət.
Can nəqdini bazari-cahanda tutar əldə,
Şövqilə ola kim ki, xiridari-ədalət.

Can bəxş edər əmvatə misali-dəmi-İsa,
Hər bəzmdə kim zikr ola küftari-ədalət.

Zöhhak kimi hər kim edə zülmdə tüğyan,
Fövq eylər onu Gaveyi-əhrari-ədalət.

Hər kəs ki, dilər dəf qıla düşməni-xəlqi,
Alsın əlinə tiği-şərərbari-ədalət.

Qərq eylər onu Nildə Musanın ilahi,
Hər kim edə Firon kimi inkari-ədalət.

Xurşidi-ədalətlə cahan olsa münəvvər,
Zalimlərə izhar olar asari-ədalət.

Sancılsın ədalətlə tərazuyi-sədaqət
Ta gərm ola bundan belə bazari-ədalət.

Xalqın evi bərbad olamaz bil bunu, Vahid!
Hərgah onu təmir edə memari-ədalət.

## HÜRRİYYƏT

Xoş olmasaydı cahanda məali-hürriyyət,
Həqiqətən, olamazdı məqali-hürriyyət.

Olardı tirə bəşər çeşminə cahan yeksər,
Görünməsəydi günəştək cəmali-hürriyyət.

Pozar, bütün dağıdar əbri-zülmü ədl ilə,
Ki, yetdikcə kəmalə hilali-hürriyyət.

Həmişə şeştəri-heyrətdə şahi mat eylər,
Gələndə gərdişə əsbi-cidali-hürriyyət.
Yetirsə mehdi-cahan min nəfər səadətmənd,
Zəmanə bir də yetirməz misali-hürriyyət.

Görüm ki, xanəsi bərbad ola o bədxahın,
Bu isə qəsdi ola payimali-hürriyyət.

Tamam əsrdə naqis qalır hilal kimi,
Hər ol kəs etməsə kəsbi-kəmali-hürriyyət.

Gərək ki, rişəsi zülmün kəsilsin aləmdə,
“Ədalət” ilə ucalsın nəhali-hürriyyət.

Sanırsa zahid özün əhli-mərifət, əmma,
Bilirmi, nolduğun olsa suali-hürriyyət?

## MƏKTƏB NƏ DEMƏKDİR?

Məktəb demək insanlar üçün xaneyi-ibrət,
Məktəbdir edən növi-bəşər ruhunu rahət.
Məktəbdir işıqlandıran afaqı sərasər,
Məktəblə fəqət parələnir pərdeyi-zülmət.
Məktəb əgər olmazsa bu dünya üzərində,
Məhv eyləyər insanları bilmərrə cəhalət.
Şənü şərəf insanlara məktəblədir ancaq,
Məktəbsiz olan kimsədə zənn etmə ləyaqət!
Cahilləri məktəbdir edən mərdi-xirədmənd,
Vəhşiləri məktəbdir edən vaqifi-hikmət.
Məktəblə bilər xalq nədir xilqəti-aləm,
Məktəbdir olan kaşifi-əsrari-təbiət.
Məktəbdir edən zülmdən insanları azad,
Məktəblə olur məqsədə nail bəşəriyyət.
İnsan, bəli, məktəblə olur hər işə dara,
Məktəblə tapar xəlqi-cahan rahi-həqiqət.
Məktəblə fəqət göstərir övladi-zəmanə
Tarixdə, həm elmdə, sənətdə məharət.

## ƏLACIMIZ

Nə Xızra bağlıdır, nə Məsihə əlacımız,
Zəhmətlə hasil olmalıdır ehtiyacımız!

Qılsaq kədərdən ayineyi-qəlbi saf əgər,
Haşa ki, səngi-tən ilə sınsın zücacımız.

Bazari-rəzmə çəksən əgər can mətaini,
Şəmşiri-abidar ilə artar rəvacımız.

Hürriyyət ilə nəşvü nüma bulmuşuz müdam,
Qılmaz qəbul qeydi-əsarət məzacımız.

Bir zərrə ilə məhv qılar əbrü-zülməti,
Olduqca nuri-ədl ilə rövşən səracımız.

Düşmən sözünə bavər edib qəflət etməriz,
Tutmaz dənilər ilə bizim imtizacımız.

Qət etməyincə rişeyi-ömrünü zalımın,
Hərgiz cahanda olmayacaq ibtihacımız.

Daim gərək biz əsgər olaq, istəsək nicat,
Yox bundan özgə iştə cahanda əlacımız.

## HÜRRİYYƏT TƏRANƏSİ

Bizi mərdanə doğmuşdur təbiət ibtidasından,
Ədunun qorxmarıq qanlar tökən növki-cidasından.

Ölüncə şikvəyə dil açmarıq ədayi-birəhmin,
Əgər yüz yol kəsilsə başımız tiği-cəfasından.

Ədulər bağrını çatlatmışıq meydani-hərb içrə,
Biz ol fatehlərik haqqın zəfərpərvər sədasından.

Şərari-tiğimizdən hər zaman düşmən fərar etmiş,
Qaçar xəffaşi-bədtinət necə şəmsin ziyasından.

Şəhid olmaq fəqət hürriyyət uğrunda səadətdir,
Əsarətlə həyatın bisəmər zövqü səfasından.

Sevərsək Gavətək azadəlik, məzlumi-dünyanı
Xilas etmək gərək Zöhhakı-əsrin hər bəlasından.

Əgər məzlumu qurtarmaqsa məqsəd zülmi-zalımdan,
Gərək bilmərrə yıxmaq qəleyi-zülmü binasından.

## HÜRRİYYƏT TƏRANƏSİ

Artardı zülmü zillət içində əzabımız,
Göstərməsəydi mehri-ruxin inqilabımız.

Məzlumə zülm edən yetəcəkdir cəzasına,
İştə budur, ədulara qəti cavabımız.

Bədxahi-xalq olan görəcək öz qiyamətin,
Vəkta, quruldu ədlilə yövməl hesabımız.

Yetməzmi, eyşü nuş ilə sərməst olan dəni,
Fəqr ölkəsində xuni-dil olmuş şərabımız.

Bilmərrə məhv eyləyəcək əbri-zülməti,
Saçsa cahanə nuri-ruxin afitabımız.

Qılmaq xilas acizi zənciri-zülmdən,
Yüz dəfə Kəbədən olur artıq səvabımız.

Aydın ürəkli şəxslərin aşinasıyıq,
Çirkinlər ilə olmaz, əvət, intisabımız.

Şeytan fikirli növi-bəşər canın almağa,
Parlar səmayi-ədldə tiri-şəhabımız.

Ölsək də xoşdur, haqqü ədalət yolunda biz,
Düşmən min olsa zərrəcə yox iztirabımız.

## ƏMƏL ŞƏRARƏSİ

Məqsud yetişməksə əgər fəzlü kəmalə,
Səy etməliyik elmə, dönərsək də hilalə.

Heç yerdə tərəqqi eləməz elmsiz insan,
Bibəhrə olur gər su verilməzsə nihalə.

Halın nəzərə almalı məzlumi-cahanın,
Bitərbiyəlikdən yetişib cümlə məlalə.

Məzlumi-cahan nəfinə cəhd etməliyik biz,
Bu hali fəqət salmalı hər ləhzə xəyalə.

Azğınlara göstərməliyik rahi-həqiqət,
Daim buna dair yazaq, əlbəttə, məqalə.

Etməzmi kifayət, sitəmi-cövri-ədudən
Əbnayi-zaman yetmədədir gündə zəvalə.

Cəhd etməli azadəlik uğrunda həmişə
Təbdil eləyək hicri-qəmin eyşü vüsalə.

Bir an füqəra sinfi gərək yatmaya rahət,
İbrətlə fəqət baxmalı keyfiyyəti-halə.

Düşmən çalışır yıxmağa əhrari-zamanı,
Haydı, ona qarşı çıxalım cəngü cidalə!

## UCAL MƏLƏKİM!

Qadınla yüksələcək şəni Azəristanın,
Olursa tərbiyə uğrunda səyi nisvanın.

Bəşər tərəqqi edər tərbiyətlə dünyada,
Fənadır aqibəti tərbiyətsiz insanın.

Qadından aslıdır ətfalə tərbiyət vermək,
Bunu tələb eləyir iqtizası dövranın.

Çalış bu tərbiyət uğrunda mərd igidlər tək,
Baxıb şəfəqqətinə aləm olsun heyranın.

Çəkildi pərdeyi-zülmət, yıxıldı əhli-nifaq,
Yayıldı aləmə gün tək ziyası ürfanın.

Götür o pərdəni üzdən, cahanı qıl rövşən.
Binayi-zülməti yıx, aç üzari-tabanın.

Şərəflə ömrünü sərf et maarif uğrunda.
Gözətlə izzəti-nəfsin, unutma vicdanın.

Ucal, ucal, mələkim! Yüksəlir səninlə həyat,
Ucal ki, yüksələ aləmdə şöhrətü şanın.

## TOFİK FİKRƏTƏ BƏNZƏTMƏ

Bir yerdə ki, hala ucalırkən bəşəriyyət,
Vəhşiliyi pamal eləyirkən mədəniyyət,
Saçmış şəfəqin gün kimi dünyalara ürfan,
Zülmətdən uzaqlaşmadadır aləmi-insan;
Elmin, hünərin rütbəsi bir payəyə çatmış,
İnsanları şiş göylərə hətta əl uzatmış,
Diqqətlə düşündükcə bu gün dövri-zamanı
Bambaşqa görürsən bütün övzayi-cahanı.
Məktəb – deyə hər kimsədə bir zövq nümayan,
Sənət – deyə hər kimsədə bir çöhreyi-xəndan.
İnsanlara lazımdır həqiqətdə çalışsın,
Olduqca gərək elm ilə, ürfanla alışsın.
Vaxta bütün ətrafı tutub elm ilə ürfan,
Bəhru-bəri hər dəmdə dolaşmaq olur asan.
Yalnız nə ki, bu yolda çalışsın gərək ərlər,
Onlarla qadınlar da çalışmaqda bərabər.
Zira qurucu böylə qurub tərzi-həyatı,
Bizdən də həyatın budur ancaq tələbatı!

## ZƏRBƏÇİLƏR

Bu gün fitlər gün doğmadan səsləndi,
Dəniz coşa gəldi, göllər tərpəndi.
Təkərlər oxudu, zindan can dedi,
Qəlbimə zəhmətdən bir fərəh endi.

“An”lar keçir, dəqiqələr yürüyür...
Kürələr ağzından atəş püskürür.
Seçmək olmaz usta kimdi, fəhlə kim,
Bu sevgiyə, eşqə təkərlər gülür.

Təkərlər fırlanır, zindan hayqırır,
Zərbəçi qolları düşməni sıxır...
Qabarlı əllərdən, gülər üzlərdən
Bir an keçir yeni bir alət çıxır.

Çəkicini bərk vur, zərbəçi yoldaş,
Əks-səda versin sənə dağü daş.
Sosializm tarixinə yazılır sənin
Çəkdiyin zəhmətin, qan-tərin, qardaş!

## ÖLKƏMİZİN

Salıbdır aləmə şöhrət səfası ölkəmizin,
Gözəlləşir günü-gündən binası ölkəmizin.

Baharda çölləri çulğar çiçəklərin qoxusu,
Çəmənlərində bitən dadlı meyvədir çoxusu.
Çayı, balı, düyüsü, çəltiyi, gözəl lumusu...
Əzəldən hər yanı tutmuş sədası ölkəmizin.

Ətirli, güllü, yaşıl dağlarında laləsi var,
Əlində hər birinin bir qızıl piyaləsi var,
Səfalı çeşmələri, ruh açan şəlaləsi var,
Dirildir aləmi abü havası ölkəmizin.

Gəlin kimi duman altında gizlənib meşəsi,
Buludların olub eşqində ağlamaq peşəsi.
Gözəllik artırır hər bir ağacda öz rişəsi,
Bəzəkli quşlar olub aşinası ölkəmizin.

Süzər gölündə gözəl durnalar, gözəl qazlar,
Bəzənmiş ay kimi kolxozda işləyən qızlar.
Bir özgə ləzzət alırlar hünərli kolxozlar,
Olubdu hər yeri ruhun qəzası ölkəmizin.

Gözəl vətənmizə fabrik-zavod gözəl yaraşır,
Yeni binaları, məktəbləri qədərdən aşır.
Traktoru, maşını hər yeri gəzib dolaşır,
Var indi texnikada ixtisası ölkəmizin.

Daşı, duzu, mazutu, torpağı cavahirdir,
Xəzinələr elimin hər yerində zahirdir.
Bax indi gör yeni nəsli ədibü şairdir,
Füzulilər yetiribdir ziyası ölkəmizin.

Yüz illər ilə bizi bəy, xan işlədib yordu,
Şərəfli xalqımızı incidib, qanın sordu.
Vətənmiz indi deyil zülm edənlərin yurdu,
Sovet hökumətidir rəhnüması ölkəmizin.

Bizə yaxın gələ bilmək kimin cəsarətidir?!
Vətənmiz indi azad xalqlar vilayətidir.
Leninə – partiyaya ellərin məhəbbətidir
Qızıl çiçəklər açıbdır fəzası ölkəmizin.

Bu fəxrdir mənə, Vahid ki, xalq şairiyəm,
Böyük Füzulilərin xaki-payinin biriyəm,
Bütün bəşər yaşadıqca mən ölmərəm, diriyəm,
Ucaltdı ömrümü nəşvü nüması ölkəmizin!

## SABİRƏ

Sabir! Ey möhtərəm böyük şair!
Şerdə, nəzm, nəsrdə mahir.
Yazdığın dahiyanə məzhəkələr
Göstərir xalq içində möcüzələr.
Bəllidir məncə hər kəsə hünərin,
Oxunur hər bir ölkədə əsərin,
Əgər ölsən də, qəm deyil, zira
Etdiyin fikri xalq edir icra.
Dad edərdin həmişə: "Hürriyyət!"

O əsarətdə gördüyün millət
İndi azadə ömr edir, xürrəm,
Bitdi məzlumu ağladan matəm...
Bəy, xanın qalmamışdır asarı,
Onları məhv qıldıq elçarı.
Kəndlinin öz əlindədir torpaq,
Hamının keyfi kök, damağı da çağ.
İşləyirlər həvəslə kolxozda,
Hamı rahətdi qışda, həm yazda.
Mollalar söndülər bütün-bütünə,
Onda dönmüşdülər çoban itinə.
Əridi yağla bəslənən qarnı,
Bir təpik gördü zalımın karını.
Bəzən az-maz görünsə də arabir,
Müztərib halda qorxusundan əsir.
Bizi gördükdə quyruğun bulayır,
Qurd kimi şöngəyib, durub ulayır.
İndi bir dərbədər uşaq yoxdur,
Onların zəhmətin çəkən çoxdur.
Naxələf bilmə yüksələn elini,
Qurdular hər tərəfdə heykəlini.
Bir də sızlarmı qəlbi-məcruhun?
Bizi, əlbəttə, seyr edir ruhun.
Bu təfaxir sənə kifayətdir,
Millətin istəyincə rahətdir.
Öldün, əfsuslar ki, bihörmət,
Vermədi, varlılar sənə qiymət.
Gər olaydın Sovet zamanında,
Şərəfin çoxdu kütlə yanında.
Sənə qiymət qoyardı cəmiyyət,
Yaşayardın həmişə biminnət.
Necə şairlər indi xoş güzəran
Keçirirlər günəş kimi xəndan.
Bu bizimçin böyük səadətdr,
Şanlı, tarixi bir şərafətdir.

## MƏNİM SƏSİM

Çal, aşıq, oxuyum bir el mahnısı,
Sazında dinləsin tellər səsimi.
Yurdumun qocaman bir bülbülüyəm,
Eşitsin ölkələr, ellər səsimi.

"Ərağ"ı "Rast" qıl, çal "Şahnaz"la,
Muğamı başlayım "Şur"ü "Hicaz"la,
Dünyanı coşdurum bu xoş avazla,
Aparsın hər yana yellər səsimi.

Qoy səsim ən uca dağlara yetsin,
Hava dalğalansın, dumanlar getsin,
Dərələr, təpələr hərəkət etsin,
Öyrənsin nəhrlər, sellər səsimi.

İçilsin toylarda sərin qımızlar,
Oynasın bir yerdə oğlanlar, qızlar.
Türkmən elləri, igid qırğızlar,
Qazaxlar, özbəklər dinlər səsimi.

Rus, erməni, gürcü can bir qardaşıq,
Tacik, tatar, beloruslar yoldaşıq,
Biz hamımız birik, bir vətəndaşıq,
Səslər Ukraynada çöllər səsimi.

Yalan söz bilmərəm, sözüm gerçəkdir,
Ölkəmiz günəşdən şəndir, göyçəkdir,
Bütün yaşıllıqdır, güldür, çiçəkdir,
Alqışlar bülbüllər, güllər səsimi.

Şairəm, sevgimə uyğundur ölkəm,
Əməkçi xalqımın dostuyam möhkəm,
Düşmən nə eylərsə etsin, qəmi kəm,
Kəsə bilməz xain əllər səsimi.

Budur dilimizin gözəl şüarı,
Sədaqətlə hər bir oğlan, qız, qarı
Seçib-seçilməyə var ixtiyarı.
Sevər azad olan dillər səsimi.

Zalımlar seçkidən bütün qovuldu,
Od tutdu xainlər, külü sovruldu.
Düşmənin gözləri çıxdı, ovuldu,
Zəfərlər qoynunda bəslər səsimi.

Xalqımız xoş günə çıxandan bəri,
Leninin adıdır dillər əzbəri,
Heç zaman unutmaz Vahid rəhbəri,
Yazsınlar tarixə illər səsimi.

## BİZDƏDİR

Həyat bağçasının bağbanı bizik,
Yarpağı söz açan güllər bizdədir.
Bizdən ilham alır şeyda bülbüllər,
Nəğməyə can verən dillər bizdədir!

Şairim! İncə söz ustadı bizik,
Böyük Vaqiflərin övladı bizik.
Sənət dünyasının Fərhadı bizik,
Dağlara səs salan ellər bizdədir!

Dərələrdən axan gümüş bulaqlar,
Göylərə baş çəkən dumanlı dağlar.
Sünbüllü tarlalar, çiçəkli bağlar,
Al-əlvan geyinmiş çöllər bizdədir!

Ətirli bağların sarmaşığıyıq,
Elin bəzəyiyik, yaraşığıyıq.
Eldən törənmişik, el aşığıyıq,
Uca boylar, nazik bellər bizdədir!

İnsan sevərmi heç ruhsuz gözəli,
Şairin olmasa şeiri, qəzəli.
Aşığın olarmı sözü məzəli?
Sazı dilləndirən tellər bizdədir!

Dünyamız nəşəylə, keflə doludur:
Biz gedən doğru yol – Lenin yoludur.
Qolumuz rəhbərin polad qoludur,
Qüvvətdən düşməyən əllər bizdədir!

Vahidəm, qüssədən, qəmdən azadam,
Xalqımın dostuyam, yadlara yadam.
Bəzəkli ölkəmə baxdıqca şadam,
Yaşılbaş sonalı göllər bizdədir!

## SAMUR MARŞI

Nə kəsib durmusan yüksək dağları?
Susuzluqdan yanır gül budaqları,
Yolunu gözləyir Bakı bağları.
Bizimdə ətrafa bir dolan, Samur!

Kanalın başında körpü salınır,
Elin zəfər marşı hər gün çalınır,
Qudurmuş çayların köpü alınır,
Ey coşub dağlara səs salan, Samur!

Bizim də çöllərin ruhun tazala,
Yayılıb şöhrətin elə, mahala,
Özün gələcəksən axır kanala,
Yalvara-yalvara, bunu qan, Samur!

Sənə qiymət verir böyük gələcək,
Səninlə çöllərin üzü güləcək.
Gəl bizim yerlərə, nazını çəkək,
Xidmətində duraq hər zaman, Samur!

Bizə həmişəlik bu şad bayramı,
Oktyabr verib, eşidib hamı.
Bu xoş gündən alır ellər ilhamı,
Sən də gəl ol bizə mehriban, Samur!
Ey coşub dağlara səs salan Samur!

## BİZİM YERDƏDİR

Ay aşıq, söhbət aç güldən, çiçəkdən,
Çəmənlər zinəti bizim yerdədir.
Bülbüllər zövq alır güllərimizdən,
Baharın ləzzəti bizim yerdədir.

Çal, oxu şur ilə çoban-bayatı,
Sazında təriflə bu şən həyatı.
Ətirli gülləri, bağı, bağatı,
Gözəllik xilqəti bizim yerdədir.

Elimdən, arxamdan, qəm uzaqlaşır,
Zövqümüz, nəşəmiz həddindən aşır.
Xalqımız fərəhlə gülüb, oynaşır,
İnsan səadəti bizim yerdədir.

Sazın, kamançanın, qarmonun, tarın,
Oxuyub-çalanın, gülün, baharın.
Ədibin, şairin, hər sənətkarın,
Ən böyük qiyməti bizim yerdədir.

Nə tarixlərdə var, nə başqa dildə,
Çoxuşaqlı qadın varmı bir eldə
Hökumətdən alsın bir min hər ildə?
Analıq hörməti bizim yerdədir.

Faşistin zülmünə dünyalar baxır,
Analar bağrına süngülər taxır.
Körpə uşaqları yandırıb-yaxır,
Bala məhəbbəti bizim yerdədir.

7 noyabrdan aldıq ilhamı,
Şadlıqla keçirdik bu şən bayramı.
Dünya yoxsulları sevinir hamı,
Fəhlə hökuməti bizim yerdədir.

Bir çox bayramları gördüksə əgər,
Bugünkü bayrammız hamsına dəyər!
Bu xoş günü görən sevinməz məyər?
Könüllər bəhcəti bizim yerdədir.

Silinsin dünyadan boş həngamələr,
Səslənsin dillərdə coşqun nəğmələr.
Yazılsın rəhbərə təbriknamələr,
Dünyalar cənnəti bizim yerdədir.

## BURUQ MAHNISI

Buruqda çıxmışam göylə yarışa,
Bizə günəş, ay eyləyir tamaşa.
Borularla qara neftimiz axır,
Elə bil ki, göydə ildırım çaxır.
Mator fırlanır,
İşıqlar yanır.
Gündə varlanır
Qızıl ölkəmiz!

Qəlbimdə canlanır sevgi, məhəbbət,
Bəxtiyar xalqıma bəslərəm hörmət.
Mənə ilham verən azad ölkəmdir,
Elin mərd oğluyam qolumda qüvvət.
Mator fırlanır,
İşıqlar yanır.
Gündə varlanır
Qızıl ölkəmiz!

Xəyalım quş kimi açıb qol-qanad,
İşlədikcə mənə xoş gəlir həyat.

Baxdıqca yurduma açılır könlüm,
Rəqs edir qarşımda bütün kainat;
Mator fırlanır,
İşıqlar yanır.
Gündə varlanır
Qızıl ölkəmiz!

Mübariz xalqımın çoxdu hünəri,
Çıraqban eyləmiş kəndi, şəhəri...
Çıxardar zahirə polad qollarım
Təbiət gizlədən xəzinələri.
Mator fırlanır,
İşıqlar yanır.
Gündə varlanır
Qızıl ölkəmiz!

Günəşlə çıxıram birgə döyüşə,
Həvəslə gedirəm hər gün mən işə.
Torpağın altından çıxardaraq mən,
Verirəm ölkəmə məhsul həmişə,
Mator fırlanır,
İşıqlar yanır.
Gündə varlanır
Qızıl ölkəmiz!

## AZAD QADIN

Gözəl desən gözələm mən, pəri desən pəriyəm,
Məni sevən igidin mən sevimli dilbəriyəm.

Mənim həmişə yerim pak olan könüllərdir,
Bilikdə, işdə, ləyatqətdə dillər əzbəriyəm.

Silahım əldə mənim elmdir, maarifdir,
Azadlıq ellərinin qəhrəman bir əsgəriyəm.

Şərəfli, sevgili yurdum Sovetlər ölkəsidir,
Günəşdən alnı açıq xalqımın münəvvəriyəm.

Əl açsa cəbhəmizə düşmənin gözün ovaram,
Faşistə zərbə çalan mərd igid bərabəriyəm.

Mənimlə parlayacaq gənc nəsli yurdumuzun,
Bugünkü əsrimizin mən işıqlı ülkəriyəm.

Qanadlanıb uçaram nazənin səmalərdə,
Ayın gözəlliyi, ulduzların da zivəriyəm.

Mənim səadətim öz xalqımın səadətidir,
Bu bəxtiyar Vətənin mən də nazpərvəriyəm.

Həmişə eşqdə bülbül gülün fədası olur,
Vəfalı dilbərimin mən də bir səməndəriyəm.

## SƏNİN

Ey Tiflisə gedən Bakı gözəli,
Yayıldı ellərə sorağın sənin.
Sünbüllər açıldı, güllər qızardı,
Dəyərkən Tiflisə ayağın sənin.

Tirmənin üstünü çiçəklə bəzə,
Xumar baxışına can gərək dözə.
Sənanın dağına çıx gəzə-gəzə,
Tərlətsin laləni yanağın sənin.

Tökmə ağ üzünə qara zülfünü,
Könlüm də ordadır – ara zülfünü.
Ehtiyatla hərdən dara zülfünü,
Qoy düşüb itməsin darağın sənin.

Sən gəzən yerlərdə özgə hal olar,
Güllər ayağına payimal olar,
Bir kəlmə danışsan tuti lal olar,
Güldürər qönçəni dodağın sənin.

Vahidəm, eşqinlə dastan qoşaram,
Başqa gözəllərdən uzaqlaşaram,
Ölmərəm, dünyada yüz il yaşaram
Gər olsam bir gecə qonağın sənin.



# 1940-1964

## QIZIL ORDU

Qızıl Ordu girən kimi meydana,
Saldı faşizmin canına muryana.

Göstəririk düşmənə öz həddini,
Hey yarırıq müdafiə xəttini,
Bu dərd əyibdir Hitlerin qəddini,
Möhtac olub indi dava, dərmana,
Qızıl Ordu girən kimi meydana.

Təyyarəmiz buraxdıqca qumbara,
Qorxusundan düşmən girir ambara,
Hitlerin qəlbinə dəyir min yara,
Ağlı çaşır, olur dəli-divana,
Qızıl Ordu girən kimi meydana.

Əsgərimiz atanda əl bombasın,
Yıxır yerə faşistlərin gombasın,
Biri qıçın tutur, biri ombasın,
Səksəni birdən yıxılır yan-yana,
Qızıl Ordu girən kimi meydana.

Hitler hələ plan çəkir xülyada,
Bu günləri gətirməyirdi yada,
Flotmuzun gücün görcək dəryada,
Deyir, yaman düşdü başım tufana,
Qızıl Ordu girən kimi meydana.

Qüssəsindən Hitler olubdur dəli,
Çox yaşamaz qan soran bir zəli,
Çıxdı boşa arzularından əli,
Dad eləyib, gəlir ahü əfqana,
Qızıl Ordu girən kimi meydana.

Bir zamanlar basmışdı Göbbels gopa,
Guya olarladır bütün Avropa,
Əksinə, özlərin basıblar topa,
Hər tərəfdən başlayıb el üsyana,
Qızıl Ordu girən kimi meydana.

Düşmənin ömrünə yetibdir xəzan,
Məhv olar axırda yolundan azan!
Əldə tüfəng minlər ilə partizan,
Düşmənə od vurur mərdü mərdana,
Qızıl Ordu girən kimi meydana.

Düşmən bizə gəlməsin boş-boş hədə,
Bir də onu qoymarıq əl tərpədə,
Biz hamı bir can kimi ilk cəbhədə,
Arxada milyon dayanıb milyona!..
Qızıl Ordu girən kimi meydana.

Bir təzə xəstəlik tutub Hitleri,
Qudurmuş it kimi qapır hər yeri,
Musselin də onun köhnə kuryeri,
Hitler üçün dönüb qotur madyana,
Qızıl Ordu girən kimi meydana.

Vermirik heç zalım əduyə fürsət,
Onlardan hər gün alırıq qənimət,
Əvvəl axır bizimdir qalibiyyət,
Tülkü-mülkü neylər igid aslana!
Qızıl Ordu girən kimi meydana.

Az deyil ordumuzda Bəxtiyarlar,
İsrafillər, Kamallar minlərlə var!
Koroğludan qalıb bizə yadigar,
Bizim ərlər aman verməz düşmana!
Qızıl Ordu girən kimi meydana.

Cürət verir bizə Lenin bayrağı,
Neyləyəcək bizə hər alçaq yağı,
Fərhad kimi çapır ordumuz dağı,
Külüngümüz nərə salır hər yana!
Qızıl Ordu girən kimi meydana.

## ƏSGƏR NƏĞMƏSİ

Çox cəbhələr yarıb igid ordumuz,
Bizimlə qorunmuş gözəl yurdumuz,
Dünyalar coşsa da, yoxdur qorxumuz,
Əməkçi oğluyuq, cəsur əsgərik,
Döyüş zamanında igid ərlərik!

Ölkəmizə qızıl bayraq vurmuşuq,
Sosializmin əsasını qurmuşuq,
Xalqın keşiyində möhkəm durmuşuq,
Əməkçi oğluyuq, cəsur əsgərik,
Döyüş zamanında igid ərlərik!

Durmaz qarşımızda ümmanlar bizim,
Yenməz qüvvəmizi tufanlar bizim,
Bilir gücümüzü duşmanlar bizim,
Əməkçi oğluyuq, cəsur əsgərik,
Döyüş zamanında igid ərlərik!

## SƏRHƏDÇİ NƏĞMƏSİ

Ey Vətən, ey əziz istəkli yurdum,
Sənin qiymətini kimdən ki, sordum
Səni müqəddəs bir ana dedilər,
Bilsən ki, sevirəm səni nə qədər!
Görməz xəyalınla gözlərim yuxu,
Məni düşündürməz bir başqa duyğu.
Bir sənin eşqinlə xoş keçər günüm,

Haqlıyam, mən əgər daim öyünüm.
Vətənin qədrini bilməyən dəni,
Elinin, yurdunun odur düşməni.
Vətəndir insana ən böyük şərəf,
Anasız körpələr tez olar tələf.
Ey ana torpağım, ey Vətən yaşa!
İndi ki çatdırdın məni bu yaşa.
Qorxacaq deyiləm, igid oğlunam,
İgidlər yetirən, ey əziz anam!
Mənim zəhmətimi az çəkməmisən,
Məni cəsarətlə sən bəsləmisən.
Borcluyam, hər zaman qoruyam səni,
Hazıram əzməyə xain düşməni.

## YÜKSƏL

*"Kommunist" qəzetinin 25 illiyinə*

Yüksəl, cavan oğlan, yaş iyirmi beşə çatdı,
Bundan belə düşmənlərinin bayrağı yatdı.

Fikrin, qələmin ox kimi batdı cühəlayə,
Hər bir kəsə təsirin olub payəbapayə,
Ariflərə, rəssamə, ədibə, şüərayə.
Loğman kimi çox xəstəni tədbirin oyatdı,
Yüksəl, cavan oğlan, yaş iyirmi beşə çatdı.

Dünyada nə bir hadisə olsa, biləcəksən,
Bədxahların ağlayacaq, sən güləcəksən.
Düşmənlər əzildikcə baxıb yüksələcəksən.
Tez məhv olacaq, kim sənə xayincə əl atdı,
Yüksəl, cavan oğlan, yaş iyirmi beşə çatdı.

Gənc yaşlı müəllim sanır hər kəs səni gendən,
Çoxdur biliyin, təcrübən hər rindi-kuhəndən.
Yüz yaşlı müəllimlər alır tərbiyə səndən.
Hər ölkədə elmin, hünərin qol-budaq atdı,
Yüksəl, cavan oğlan, yaş iyirmi beşə çatdı.

Sən bir ləkəsiz ayinəsən kütlə gözündə,
Kim baxsa sənə tez görər öz eybin üzündə.
İslahına möhtacdır aləm yer üzündə,
Tənqidlərin min möcüzə aləmdə yaratdı,
Yüksəl, cavan oğlan, yaş iyirmi beşə çatdı.

## OLSUN

Gözəlim, pərişan etmə zülfünü,
Günəştək gül üzün qoy aşkar olsun,
Ellər camalını görməyə gəlsin,
Dost-aşna sevinsin, düşmən xar olsun!

Nəğmələr yüksəlsin kaşanələrdən,
Badələr süzülsün peymanələrdən,
Qalmasın bir əsər biganələrdən,
Elimiz, günümüz bəxtiyar olsun!

Ürəkdən sevirəm, sevgilim, səni,
Tale bizimlədir, əzdik düşməni.
Can kimi qoruyaq əziz vətəni,
Tarixlər boyunca yadigar olsun!

Səadət yolunda biz candan keçdik,
Bu günün eşqinə badələr içdik.
Vətəni istəyən oğullar seçdik,
Onlar yurdumuza havadar olsun!

Yaymalı hər yana bu şad xəbəri,
Seçmişik birinci böyük rəhbəri.
Dönsün gülüstana sovet elləri,
Arzumuz dünyada payidar olsun!

## VƏTƏN

Dumanlı dağların başında durdum,
Dumandan özümə bir xeymə qurdum.
Keçdi xəyalımdan o gözəl yurdum,
Dumanlar başımda duman göründü.

Gəmimiz Suxuma çatan çağında,
Hiddətli dalğalar yatan çağında,
Günəşin üfüqdə batan çağında,
Sahillər qarşımda ümman göründü.

Qara dəniz kimi eşqimlə coşdum,
Xülyalar içində sanki bihuşdum,
Vətən arzusilə nəğmələr qoşdum,
Tufanlar gözümə dastan göründü.

Dünyalar cəzb edən bu xoş mənzərə,
Şövqümü artırdı gözəl Xəzərə,
Çarpdıqca vətənim, elim nəzərə
Təbiət də mənə heyran göründü.

Deyirlər, bülbülə çəmən yaxşıdır,
İnsana laləzar Vətən yaxşıdır.
Vahid! Sorma, Vətən nədən yaxşıdır,
Adı gəlcək könlüm göründü.

## OLUR

*Cəfər Xəndana*

Şairim, xatirin küsməsin məndən,
Dostluq arasında nəzakət olur.
Razıyam, deyiləm, narazı səndən,
Namərdin qəlbində ədavət olur.

Mən də bir şairəm, tanıyır aləm,
Azaddır mətbuat, azaddır qələm,
Həyatdan yazmağa aciz deyiləm,
Şairçün hər yolda məharət olur.

Şerlər yazarkən oxurdum sənə,
Hər nə günahım var, səndədir yenə,
Desəydin səhvimi əzəldən mənə,
Arifə bir kəlmə kifayət olur.

Mən necə ayrılım rəna qəzəldən,
İşvəli dilbərdən, nazlı gözəldən?
İnsan ki, bir şeyə uydu əzəldən,
Ölüncə başında o adət olur.

Məhv olsun dünyada xalqın düşməni,
Mən də çox sevirəm əziz vətəni,
Vətənin qədrini bilməyən dəni,
Özü xəlq içində xəcalət olur.

Elimin zəfəri, qalibiyyəti,
Hər işdə mərdliyi, fəaliyyəti,
Qoymuşdur heyrətdə bəşəriyyəti,
Çox çəkməz, ölkəmiz bir cənnət olur.

Mənə qəzəlçilik, sanma şü, ardır,
Mənim vətənim tək sevgilim vardır.
Mənə ilham verən bu şən diyardır,
Vətəndən kütləyə səadət olur.

Eyni həqiqətdi, sözüm laf deyil.
Vahidəm, məqsədim ixtilaf deyil.
Əlli bir yaşımda bu insaf deyil,
Hər yerdən üstümə məzəmmət olur.

## BU BAYRAMDA

Könüllər şad olan gündür – bu bayramda, bu bayramda,
Vətən azad olan gündür – bu bayramda, bu bayramda.

Vətən gülzarı açmışdır çiçəklər, nazənin güllər,
Qərənfillər budağında gəlir ilhama bülbüllər,
Əsarətdən xilas oldu bütün məhkum olan ellər,
Cahan abad olan gündür – bu bayramda, bu bayramda,
Vətən azad olan gündür – bu bayramda, bu bayramda.

Günəşdən, aydan, ulduzdan xəbər verdik bu qırx ildə,
Azərbaycan səfaləndi, ziyaləndik biz hər dildə,
Maarif, elm çiçəkləndi bizim yurdda, bizim eldə,
Könüllər şad olan gündür – bu bayramda, bu bayramda,
Vətən azad olan gündür – bu bayramda, bu bayramda.

Bu Aprel inqilabilə gərək fəxr etmək aləmdə
Ki, onsuz xalqımız qalmışdı daim möhnətü qəmdə,
Azərbaycanlılar, Vahid, gərək şad olsun hər dəmdə,
Könüllər şad olan gündür – bu bayramda, bu bayramda,
Vətən azad olan gündür – bu bayramda, bu bayramda.

## KÜSMÜSƏN MƏNDƏN

Eşitdim, sevgilim, küsmüsən məndən?
Qaçırma bülbülü öz çəmənindən.
Mənimlə düz dolan, küsərəm səndən,
Məndə dostluq da var, biganəlik də.

Bir sənsən bu məcnun könlümə uyğun,
Sənin camalına olmuşam vurğun,
Hər Leyli eşqinə deyiləm Məcnun,
Məndə kamal da var, divanəlik də.

Bütün bu dünyanı gəzdim, dolandım,
Bir səni özümə vəfalı sandım,
Sən gəzdin özgəylə, od tutub yandım,
Məndə atəş də var, pərvanəlik də.

Əzəldən demişəm səninlə yaram,
Yolunda ölsəm də, bil, bəxtiyaram,
Dediyim sözümdə mən yenə varam,
Məndə kəclik də var, mərdanəlik də.

Vahid, bu bir sözün min lələ dəyər,
Mənə gərək deyil nə sərvət, nə zər!
Təbim xəzinədir, sözlərim gövhər,
Məndə gənclik də var, piranəlik də.

## SEVGİLİM

Sevgilim qaşların çatıb baş-başa,
Hüsnünə etməyə hər gün tamaşa
Üfüqlərdən çıxır hər səhər qoşa
Günəş bir tərəfdən, ay bir tərəfdən.

Çoxdandır kəsmisən məndən nəzərin,
Yanıram eşqinə yoxdur xəbərin,
Çəkibdir qəsdimə cəllad gözlərin,
Kaman bir tərəfdən, yay bir tərəfdən.

Sən yeri arxanca zülfün sürünsün,
Sünbüllər al-yaşıl dona bürünsün,
Günəş camalın aç, aşkar görünsün,
Bahar bir tərəfdən, yay bir tərəfdən.

Həsrətin yandırır pərvanələri,
Qoyma yaxınına biganələri,
Açma zülfündəki divanələri,
Bağla bir tərəfdən, say bir tərəfdən.

Oxunsun elimin zəfər nəğməsi,
Vahidin qəzəli, Xanın[1] xoş səsi,
Yenə də bəzəsin bizim məclisi,
Şərbət bir tərəfdən, çay bir tərəfdən.

---
[1] Müğənni Xan Şuşinski

## GÖZLƏRİN

Sevgilim, el bilir mən əhli-dərdəm,
Səndən başqasını sevsəm namərdəm.
Qüssədən ölürəm, neylim ki, hər dəm,
Məni qoyub baxır yana gözlərin.

Kipriyin xəncərdir, qaşların kaman,
Yıxdığın acizə verməzsən aman.
Dedilər cəlladsan, etməzdim güman,
Salacaqdır məni qana gözlərin.

Sənin əlindədir hər ixtiyarım,
Zalım, öldür məni qəmdən qurtarım,
Bəs kimə söyləyim, kimə yalvarım,
Gətiribdir məni cana gözlərin.

Könlümü salacaq zülfün kəməndə,
Həsrətin qoymayıb can qalsın məndə,
O gözlər var ikən nə qədər səndə,
Alacaq könlümü sona gözlərin.

Vahidəm, sevgilim, mən də qanıram,
Fitnəkar gözəli üzdən tanıram,
Necə deyim sənə, qəmdən yanıram,
Mənim tək od tutub yana gözlərin!

## SEVGİLİM

*Mahnı*

Üzündə təzədir xalın,
Əlində güllü dəsmalın,
Can almaq isə xəyalın,
Ax, tez elə, tez elə, tez elə,

Qaş-göz elə, göz elə, göz elə.
Yolunda candan keçərəm, sevgilim,
Ay əziz canına and içərəm, sevgilim!

Bülbüləm, boş dolanmaram,
Cəh-cəhindən dayanmaram,
Bundan sonra inanmaram
Hər gözələ, gözələ, gözələ,
Qaş-göz elə, göz elə, göz elə.
Yolunda candan keçərəm, sevgilim,
Ay əziz canına and içərəm, sevgilim!

Gül sənintək deyil göyçək,
Eşitmişəm yalan-gerçək;
Aran rəqiblə dəyəcək.
Ax, tez elə, tez elə, tez elə,
Qaş-göz elə, göz elə, göz elə.
Yolunda candan keçərəm, sevgilim,
Ay əziz canına and içərəm, sevgilim!

## DƏLİ CEYRAN

*Mahnı*

Gözəlim, aşiqini salma nəzərdən,
Həsrətindən ölürəm, gəl bizə hərdən.
Sənə çoxdan vurulub bu dəli könlüm,
Neyləyim ki, xəbərin yoxdu xəbərdən.
Gəl mənə naz eləmə, ay dəli ceyran,
O qara gözlərinə olmuşam heyran.

Bir dönüb baxmaq ilə canımı aldın,
Məni Məcnun eləyib çöllərə saldın.
Mən inandım sənə, öz könlümü verdim,
Məni atdın, gedib əğyar ilə qaldın.
Gəl mənə naz eləmə, ay dəli ceyran,
O qara gözlərinə olmuşam heyran.

Sən gəzirsən, gözəlim, qeyrilə mənsiz,
Yuxu getməz gözümə bir gecə sənsiz.
Özün insaf elə, ey sevgili dilbər,
Hansı bülbül yaşayar bağü çəmənsiz?
Gəl mənə naz eləmə, ay dəli ceyran,
O qara gözlərinə olmuşam heyran.

## TƏSDİS

"Yansın dilim ağzımda, desəm, nazüvi az et,
Naz et mənə, ey sevgili canan, mənə naz et".

Əvvəl baxışında məni heyran elədin sən,
Bir incə gülüşlə ürəyim qan elədin sən,
Sonra məni bir lütf ilə xəndan elədin sən,
Kafər qızı, axır məni Sənan elədin sən,
"Yansın dilim ağzımda, desəm, nazüvi az et,
Naz et mənə, ey sevgili canan, mənə naz et".

Xəlq eyləmiş öz keyfi gələndə səni tari,
Öldür, bu bəladan məni qurtar, səni tari!
Rəhm et mənə, biganəyə naz eyləmə bari,
Alqış, elə bir aşiqə, var sən kimi yari,
İnsaf elə öz aşiqini məhrəmi-raz et,
"Naz et mənə, ey sevgili canan, mənə naz et".

Ayinəni heyrətdə qoyub əksi-camalın,
Xurşidi xəcalətdə qoyub arizi-alın.
Aşiqləri həsrətdə qoyub zülf ilə xalın,
Bəlkə, ola qismət bizə gülzari-vüsalın.
Hərdən bu sınıq könlümü bir lütfilə saz et,
"Naz et mənə, ey sevgili canan, mənə naz et".

Gördüm, gözəlim, özgəyə sən naz eləyəndə,
Az qaldı ki, ruhum uça, can qalmadı məndə.
Bu nazü nəzakət var ikən bir belə səndə,
Dərd əhli, inan, düşməyə bilməz bu kəməndə,

Daim bu gözəl xilqətə min razü niyaz et,
“Naz et mənə, ey sevgili canan, mənə naz et”.

Tiflis şəhərin eyləmiş hər kimsə ki icad,
Tari eləsin ruhini aləmdə, görüm, şad.
Cənnət ki, deyirlər, edib icad onu Şəddad,
Burdan aparıb huriyi qılmanü pərizad.
Yarəb, bu pəri çöhrələri bəndənəvaz et,
“Naz et mənə, ey sevgili canan, mənə naz et”.

Dünya üzünə yaxşı gözəllər gəlib hərçənd,
Olmaz sənə bir ölkədə nə misl, nə manənd,
Təbriz, Bakı, Tehran, Şəki, Şirvan, Quba, Dərbənd,
Gəncə, Qarabağ, şəhri-Buxaravü Səmərqənd.
İstərsən əgər, əzmi-rəhi-mülki-Hicaz et,
“Naz et mənə, ey sevgili canan, mənə naz et”.

Olma, gözəlim, surətinə bir belə məğrur!
Mən etmişəm eşqimlə səni aləmə məşhur,
Hicrində məni eyləmə qəm çəkməyə məcbur,
Bir dəm hərəmi-vəslilə et qəlbimi məsrur.
Dərgahə məni qul deyə manəndi-Əyaz et,
“Naz et mənə, ey sevgili canan, mənə naz et”.

Vaiz, elə zənn eyləmə, həqqi danıram mən,
Nə Kəbə, nə bütxanə, nə məscid tanıram mən,
Lakin özümü həqq sevən insan sanıram mən,
Dünyada fəqət bircə məhəbbət qanıram mən!
Sən, get, hələ ölmüşlərə təklifi-nəmaz et,
“Naz et mənə, ey sevgili canan, mənə naz et”.

Vahid, demə, mən daimiyəm zövqü səfadə,
Mənsuri[1] də yad etməliyik dari-fənadə.
Bu misrəyi-nazi o demiş bir belə sadə,
Yarəb, sən ona rəhmətini eylə ziyadə.
Qəbr içrə onun ruhini lütfünlə fəraz et,
“Naz et mənə, ey sevgili canan, mənə naz et”.

[1] Şair Səməd Mənsur Kazımzadə

## FÜZULİDƏN TƏXMİS

Diyari-eşqə sultanəm, bəlalər çox çəkib başım,
Cəlali-şövkətim qəmdir, hücumi-dərd fərraşım,
Ömürlərdir axar kuyində yarın qanlı göz yaşım,
"Degilsən çoxdan, ey gərdun, cahan seyrində yoldaşım,
Nola xəm olsa qəddin, səndən artıqdır mənim yaşım".

Xəyal eylər görən, bir bülbüləm gülzari-eşq içrə,
Yaxar gülzari naləm ahi-atəşzari-eşq içrə,
Məni sevdayi-həsrətdür yıxan azari-eşq içrə,
"Tərazuyi-əyari-möhnətəm bazari-eşq içrə,
Dolub hər dəm gözüm, min daşə hər saat dəyər başım".

Görüb rüsvalığım eşqində yarın, tən edər hər kim,
Bəlalər çəkməyə guya məni çərx eyləmiş təhkim,
Fələkdən başıma daşlar yağır, qılmaq dilər tərkim.
"Sirişkim al, bağrım parə, bir kuhi-bəlayəm kim,
Həmişə laləvü ləl ilə rəngindir içim, taşım".

Həyatı aşiqin eşq olmasa, əfsanə bir röya,
Məhəbbətdir fəqət pəjmürdələr qəlbin edən əhya,
Məni aşiq doğub, qoynunda yalnız bəsləmiş dünya,
"Mənə manənd bir divanəsurət bağlamaz guya,
Qələm sındırdı təsvirim çəkəndən sonra nəqqaşım".

Sevinci könlümün yar etdiyi qəhri-qəzəbdəndir,
Vəfadə sabit olmaq aşiqə əslü nəsəbdəndir,
Cəfayə dözməmək, Vahid, demə, rəsmi-ədəbdəndir.
"Füzuli, xazini-gənci-vəfayəm, ol səbəbdəndir,
Cühərlər tökdü israf ilə bu çeşmi-gühərpaşim".

## BİZİM OLSUN

Sevgilim, bu bağda biz də bağbanıq,
Bu gül, bu laləzar, qoy bizim olsun!

Özümüz zövq alaq güllərimizdən
Bü gülşən, bu bahar, qoy bizim olsun!

Bu ellər bağıdır, indi biz gərək,
Hamımız bir yerdə əkib-becərək.
İzn ver, bu bağdan biz də gül dərək,
Səfalı ruzigar, qoy bizim olsun!

Hamının payı var ana vətəndə,
Tək durma, gəl qoşul bizimlə sən də,
Bülbültək səsləşək bağda, çəməndə,
Təbiətdə nə var, qoy bizim olsun!

Demişlər bu sözü bizdən qocalar,
Elindən ayrılan çox tez qocalar,
Barıyla hər ağac artar, ucalar,
Şad ellər, şən diyar, qoy bizim olsun!

Dünya ellərinin bəxtiyarıyıq,
Sülhün, ədalətin bayraqdarıyıq,
Məzlum insanların tərəfdarıyıq,
Sədaqət, etibar, qoy bizim olsun!

Mən ki ayırmıram eldən özümü,
Dikmişəm xalqıma iki gözümü.
Vahidəm, sevgilim, bu bir sözümü,
Saxlayaq yadigar, qoy bizim olsun!

## BU CEYRAN

Ey əhli-dərdlər, dinləyin məni,
Əqlimi başımdan aldı bu ceyran!
Sağalmaz dərdlərə günahsız yerə,
Neyləmişdim, məni saldı bu ceyran!

Göz-qaşla oynayır özü-özüylə,
Məni gözdən salıb özgə sözüylə,
Bu quzu könlümü sərxoş gözüylə,
Şahmar ilan kimi çaldı bu ceyran!

Aslanlar yurdudur şərəfli yurdum,
Çox ceyran qovlayıb, hürkütdüm, yordum,
Eşqin tələsini hər yanda qurdum,
Kəməndə düşməmiş qaldı bu ceyran!

Bu sözlə eylərəm mən təfaxiri,
Vəfasız gözəlin olmaz axırı,
Vahid, deyirlər ki, aşıq Şakiri
Eşqin bəlasına saldı bu ceyran.

## GƏLDİ “BABAYİ-ƏMİR...”

Gəldi “Babayi-Əmir” işləri samanlasın,
Fürsət ikən hər kişi öz işini anlasın.

Tərk ola bundan belə mehrü məhəbbət gərək,
Saxlayalım dəhri də canı səlamət gərək,
Eyləyəlim cümləmiz tərki-ticarət gərək,
Cəhlə tərəf getməyi eyləyək adət gərək,
Gəldi “Babayi-Əmir” işləri samanlasın,
Fürsət ikən hər kişi öz işini anlasın.

Cümlə verib əl-ələ qeyriyə imdad edək,
Səy qılıb ruzü şəb, dəhrdə bir ad edək,
Məktəbi-şürbü qumar cəhd edib icad edək.
Bəlkə qəmü qüssədən könlümüzü şad edək.
Gəldi “Babayi-Əmir” işləri samanlasın,
Fürsət ikən hər kişi öz işini anlasın.

Məhv ola tezliklə bu hali-pərişanımız,
Himmət edək qalmaya zərrəcə nöqsanımız,
Zillət ilə çıxmaya həsrət ilə canımız,
Qoymayın, əldən gedə şövkətimiz, şanımız,
Gəldi “Babayi-Əmir” işləri samanlasın,
Fürsət ikən hər kişi öz işini anlasın.

Dəmdir, aça uyqudan çeşmini xürdü kübar,
Olmalıyıq cümləmiz millətə xidmət güzar,
Annalara eyləyək eşq ilə canlar nisar.
Məscidi, minbərləri eyləyəlim tarümar,
Gəldi “Babayi-Əmir” işləri samanlasın,
Fürsət ikən hər kişi öz işini anlasın.

Keyf ilə biganələr cümlə olub bəxtəvər,
Səy edərik, heyf, biz hər işə şamü səhər,
Eyləməz əsla bizə naleyi-məzlum əsər,
İstəmirik qeyridən ibrət alaq, müxtəsər,
Gəldi "Babayi-Əmir" işləri samanlasın,
Fürsət ikən hər kişi öz işini anlasın.

*1915*

## RÖYA DEYİL

Tuti[1], yaz bu sözü xalqa elə elan, mən ölüm,
Hamı bilsin, ayılıb daxı müsəlman, mən ölüm!

Cümləsi elm ilə islah eyləyib iradın,
Şövqlə məktəbə qoymuş hamı öz övladın.
Cəhd edirlər, vətənin dəf edələr cəlladın,
Hərə bir növ ilə xidmətdə çıxarmış adın,
Tuti, yaz bu sözü xalqa elə elan, mən ölüm,
Hamı bilsin, ayılıb daxı müsəlman, mən ölüm!

Əhd ediblər, belə ki, olmaya bilmərrə yalan,
Hamı sidq ilə, məhəbbətlə dolansın əyan.
Tərk ola büğzü ədavət, törənə əmnü əman.
Eyləsin elmü sənaət bizi darayi-cahan.
Tuti, yaz bu sözü xalqa elə elan, mən ölüm,
Hamı bilsin, ayılıb daxı müsəlman, mən ölüm!

Görməzsən bir də müsəlmanda dilənsin füqəra,
Hər nə görsən, görəcəksən üqəla və füzəla,
Hamı təsdiq edəcək, hər nə buyursa üləma.
Yeni məktəb vətən övladına etmiş də bina.
Tuti, yaz bu sözü xalqa elə elan, mən ölüm,
Hamı bilsin, ayılıb daxı müsəlman, mən ölüm!

[1] "Tuti" jurnalına işarədir

Tərk ediblər, daxı oynanmayacaq bir də qumar,
Əvəzində gedəcək məktəbə xurd ilə kübar.
Pis əməllərdən hamı eylədilər istiğfar.
Eyləyir xeyr işə iqdam, müsəlman nə ki var.
Tuti, yaz bu sözü xalqa elə elan, mən ölüm,
Hamı bilsin, ayılıb daxı müsəlman, mən ölüm!

Yaxşı məktəblər açıb elm eləyirlər təhsil,
Ruzü şəb cəhd eləyib, öyrənəcəklər hər dil.
Görəcəksən, budu gəldi hələ doktor, uçitel,
Göz qabağında edən cilvə mühəndisdi, vəkil.
Tuti, yaz bu sözü xalqa elə elan, mən ölüm,
Hamı bilsin, ayılıb daxı müsəlman, mən ölüm!

*1915*

## ŞÜCAƏT

(*"Suraxanski" küçə, yuxarı məhəllə,*
*Qoşa hamamın qabağı*)

Yuxarı məhlənin əhlində şücaət görünüb,
Bilməyirsiz, kişilərdə nə əlamət görünüb?!

Bir-iki gün bundan əzəl xəlqlə dolmuşdu dalan,
Nə deyim, gəl görəsən, keyf nə keyfdi, ay aman!
Gürcü dümbək vurub, həm erməni də zurna çalan.
Ən qabaqda Qobu əhlindən idi yaxşı piyan,
Lahıc əhli də valay vurmada ondan da yaman,
Yuxarı məhlənin əhlində şücaət görünüb,
Bilməyirsiz, kişilərdə nə əlamət görünüb?!

Saqi olmuş biri təcil ilə doldurmağa cam,
Biri bədməst olub söylədi: – vurram, basaram.
Gər həqiqət, kişilər eyləsə bu işdə dəvam,
Verəcək həqq bulara həşrdə cənnətdə məqam.
Adəmiyyət rəvişin etdilər əlqissə tamam,
Yuxarı məhlənin əhlində şücaət görünüb,
Bilməyirsiz, kişilərdə nə əlamət görünüb?!

Eyləməkdə bu işi qeyri bir ad eylədilər,
Bir neçə qəmzədənin könlünü şad eylədilər,
Sanma, bihudə yerə dadü bidad eylədilər.
Demək olmaz ki, bular zərrə fəsad eylədilər,
Hər nə oldusa da, etməkdə cəhad eylədilər.
Yuxarı məhlənin əhlində şücaət görünüb,
Bilməyirsiz, kişilərdə nə əlamət görünüb?!

Gecə həm sübhə kimi evdə də oynandı qumar,
Məstü mədhuş hamı, yox arada bir huşyar.
Məsləhət gördülər ki, bilməyə bir kəs zinhar,
Sübh tezdən birisi Məxfiyə[1] etdi izhar;
Yuxarı məhlənin əhlində şücaət görünüb,
Bilməyirsiz, kişilərdə nə əlamət görünüb?!

*1915*

## MOLLANIN

Gəlib orucluğun dəmi, çıxır sədası mollanın,
Bu ayda müstəcəb olar bütün duası mollanın.

Oruc tutub, namaz qılıb, gərək ibadət eyləyək,
Yalan danışmayıb daha gözəl sədaqət eyləyək.
Nə əmr qılsa mollamız, ona itaət eyləyək
Ki, yoxsa od vurar bizə, bilin nəvası mollanın,
Bu ayda müstəcəb olar bütün duası mollanın.

Deyir bu ayda mollalar, o kəs ki, töksə göz yaşı,
Həq ona huri lütf edər üzü günəş, kaman qaşı.
Ayağı səmti-qərbdə, keçibdi Şərqdən başı,
Olar o huridən biri öz aşinası mollanın,
Bu ayda müstəcəb olar bütün duası mollanın.

Dün etdi məclis içrə kim beş-altı molla məsləhət,
Nə molla söyləyim sizə – təmami kani-mərifət!

[1] "Məxfi" Ə.Vahidin gizli imzalarındandır

Qərar qoydular hamı, bu ay nə olsa mənfəət,
Tamam nəfimillətə gəlib səxası mollanın,
Bu ayda müstəcəb olar bütün duası mollanın.

Gər olmasaydı mollalar, yetərdi min bəla bizə,
Nə qəm ki ruzi-həşrdə verilməsə şəfa bizə.
Yoxumdu xovf, gər bular olarsa rəhnüma bizə,
Qəbula həq hüzuruna yetər duası mollanın,
Bu ayda müstəcəb olar bütün duası mollanın.

Bizim bu hacı mollaya əcəl əgər aman verə,
Keçənki il kimi çıxa bu il də fərqi-minbərə.
Məgər ki, molladır Qulam – o zalım oğlu heyvərə,
Deyərsən, afərin buna, budur ağası mollanın,
Bu ayda müstəcəb olar bütün duası mollanın.

*1915*

## NƏ FAİDƏ

Olma vəfalı, əhdü vəfadən nə faidə?
Ol biəda, vəfavü ədadən nə faidə?

Vermə fəqirə, səy elə, yığ bangə pulları,
Əhli-səxavət olma, səxadən nə faidə?

Xalqın malını cəhd elə ye, xoş keçirt günün,
Qədri-həyanı bilmə, həyadan nə faidə?

Aludə olma məktəbə, dil vermə sənətə,
Uyma səfayə, zövqü səfadən nə faidə?

Xəffaş kimi zülmət içində dolan müdam,
Əsla ziyanı sevmə, ziyadən nə faidə?

Məzlumə zülm qılmaq ilə ad qazangilən,
Kim der cəfanı görmə, cəfadən nə faidə?

Təyyarə ilə çıxma göyə, yerdə ol müdam,
Seyri-səmanı qılma, səmadən nə faidə?

Cəhd et, həmişə dəhrdə ahəngər olgilən,
Zərgərlik etmə – simü tiladən nə faidə?

*1915*

## NƏ LƏZZƏTİ

Dünya üzündə olmadın ədna, nə ləzzəti?
Ədnalıq ilə olmadın əla, nə ləzzəti?

Meyxanə içrə aşnalar ilə şərab içib,
Sərməsti-badə olmadın əsla, nə ləzzəti?

Manəndi-Qeys Leyliyə dil vermədi, nə sud,
Kəndinə mənzil olmadı səhra, nə ləzzəti?

Bulvar içində gəştə çıxıb seyd qılmadın,
Nazü nəzakət etmədi Lolya, nə ləzzəti?

Ağlın var isə anlama, bilmə qüsurunu,
Oldun cahanda vaqifi-məna, nə ləzzəti?

Asudəlik nədir? Ölüb öldür zəmanədə,
Mərdin başında olmadı qovğa, nə ləzzəti?

Xalqa nəsihət eylə, özün hər nə bildin et,
Oldun tutaq ki, bir yekə dana, nə ləzzəti?

Hər yanda xani-nemət olan əhli-fəqr üçün,
Leyk olmaya o bəzmdə molla, nə ləzzəti?

Qahir[1] nə sud söyləyəsən xalqa möizə,
Xalq olmadı təmamisi rüsva, nə ləzzəti?

*1915*

[1] "Qahir" Ə.Vahidin gizli imzalarındandır

## YAXŞIDIR

Bavəfa olmaqdan isə bivəfalıq yaxşıdır,
Baədalıqdan nə ləzzət, biədalıq yaxşıdır.

Hakimiyyət rütbəsini sanma İran şahi tək,
İstəmə alilik, əlbəttə, gədalıq yaxşıdır.

Surəti-zahirdə xalqa ol şəriət hakimi,
Batinən salusü təzvirü riyalıq yaxşıdır.

Ölsə də millət acından, məncə, pamal olsa da,
Bir qəpik sərf etmə əsla, kəmsəxalıq yaxşıdır.

Varsa ağlın, gözləmə namusü arü qeyrəti,
Faidə yoxdur həyadan, bihəyalıq yaxşıdır.

Saxla yadında, əzizim, yar ilə biganə ol,
Qeyri millətlərlə etmək aşinalıq yaxşıdır.

Qoyma, sansınlar səni ayineyi-aləmnüma,
Olma düz, cəhd eylə, kəc ol, kəcnümalıq yaxşıdır.

*1915*

## NƏ İMİŞ

Mollalar milləti gümrahə, demə, rəhbər imiş,
Əhsən, əhsən, kişilər naibi-peyğəmbər imiş!

İftira eyləməyin bunların haqqında, yəqin
Demişik bunlar üçün hiyləgəri-ruyi-zəmin.
Ah!.. Biz bilməmişik, bunlar  imiş sərvəri-din,
Bunların haqqını pamal eləyən kafər imiş!

Tapmaz idik, bu qədər şənü şərəf, cahü cəlal,
Olmasaydı üləma sayəsi, əlhəqq məhü sal,
Əhli-islamə yetərdi, bəli, hər gündə zəval,
Doğrudan da üləma millətə taci-sər imiş!

Olmasaydı bizə bunlardan əgər rahi-nicat,
Yoxsa məhv eylər idi bizləri filcümlə məmat,
Mümkün olmazdı, həqiqət, bizə dünyadə həyat,
O həyatın səbəbi aləmi-xoşmənzər imiş!

Olmasaydı bu cahan içrə əgərçi üləma,
Millətin dərdinə bəs kimlər olar idi dəva?!
Bunlar imiş bütün aləmdə bizə rahnüma,
Demək olmaz bulara maili-simü zər imiş!

Bir də min bəd qəzet, jurnala aldanmamalı,
Cəhd edib elmü-ədəb nolduğunu qanmamalı,
Bunlara, molla demişkən, daha tullanmamalı,
Müxtəsər, hər nə yazırlar, hamı dərdü sər imiş!

*1915*

## NƏYƏ LAZIM

*Salus əyyara bənzətmə*

Oldun tutalım, sahibi-vicdan, nəyə lazım?
Ya kani-ədəb, mənbəyi-ürfan, nəyə lazım?

Kəsb eyləmə cəhd ilə cahanda ürəfalıq,
Dünyada kişi olmadı nadan, nəyə lazım?

Murü mələx asa düş ayaq altına daim,
Tut rəsmi-gəda, şəni-Süleyman, nəyə lazım?

Rəncidə elə xalqı, danış acı zəhərtək,
Şirin danışar isə gər insan, nəyə lazım?

Tənqidi-həsüdanəni yaz əhli-kəmalə,
Ağlında əgər olmadı nöqsan, nəyə lazım?

Şairlik elə, anlama əndazeyi-şeri,
Yazdıqların həp olmadı hədyan, nəyə lazım?

Sərf etmə pulun, millət əgər ölsə acından,
Biçarələrə eyləmək ehsan, nəyə lazım?

Küffar kimi vermə həvəs elmü fününə,
Elm əhli olar isə müsəlman, nəyə lazım?

Zahid kimi məxluqi əvam etməyə səy et,
Dünyayə sat imanını, iman, nəyə lazım?

*1915*

## QOCALIQDAN ŞİKAYƏT

Qocalıq saldı ayaqdan məni, ey dad, ölürəm!
Düşməyir indi cavanlıq ələ, fəryad, ölürəm!

Gözümün nuru gedib, dizdə yoxumdur taqət,
Baxıram mən işin əzvayişinə hər saət,
Görürəm hərdəm özümdə bir əcaib halət,
Gecələr sübhə kimi bir yata bilməm rahət,
Qocalıq saldı ayaqdan məni, ey dad, ölürəm!
Düşməyir indi cavanlıq ələ, fəryad, ölürəm!

Bir kəsim qalmamış ərz edəm ona əhvalım,
Dərd çəkməkdən ağarmış bu qara saqqalım,
Qırılır evdə acından gecələr ətfalım,
Bir günü eyləməz imdad mənə iqbalım,
Qocalıq saldı ayaqdan məni, ey dad, ölürəm!
Düşməyir indi cavanlıq ələ, fəryad, ölürəm!

Necə asudə olur dərdü bəladən başım?
Ağlamaqdan coşub ümmanə dönüb göz yaşım.
Himmət etməz mənə əsla nə qohum, qardaşım,
Belə bir gündə ki, həştadı keçibdir yaşım...
Qocalıq saldı ayaqdan məni, ey dad, ölürəm!
Düşməyir indi cavanlıq ələ, fəryad, ölürəm!

Xoş o günlər ki cavanlıqda cəlalım var idi,
Haq bilir kim, nə qədər dövlətü malım var idi,
Nə ki, bir böylə mənim fikrü xəyalım var idi,
Nə də bir böylə mənim dərdü məlalım var idi.
Qocalıq saldı ayaqdan məni, ey dad, ölürəm!
Düşməyir indi cavanlıq ələ, fəryad, ölürəm!

*1915*

## AR QIL!

Kəmalü elmi xoşlama, cavansan, oğlum, ar qıl,
Burax bu rahi-məktəbi, cəhaləti şüar qıl!

Amandır olma naxələf, tutub rəhi-cəhaləti,
Mənim tək ad qazangilən, büruzə ver şücaəti.
Çəkinmə cövrü zülmdən, demə ki, var qəbahəti,
Özünə rağib etgilən hərasdən cəmaəti,
Vurub yıx, öldür aləmi, hünərlər aşikar qıl!

Olurmu elmdən görək zəmanədə səmər, oğul?
Qılıbmı elm bir kəsi cahanda bəxtəvər, oğul?
İnanma, xeyri var sənə, tamamıdır hədər, oğul?
Əbəsdi, vermə kəndinə bu qədr dərdüsər, oğul?
Görəndə elmi, məktəbi, dayanma, tez fərar qıl!

Burax təriqi-məktəbi, yüyürmə rahi-sənətə,
Çalış ki, salma başını bəlavü dərdümöhnətə,
Məcaz ilə dolangilən, baxan hanı həqiqətə?
Həmişə talib olginən cahanda qətlü qarətə,
Əziyyət eylə xalqına, cəfayi-bişümar qıl!

Fəqirə töhmət eyləmək həmişə olsun adətin,
Bir eylə zalım ol, sala cahana lərzə şöhrətin,
Vur, öldür, arta günbəgün xəlaiq içrə hörmətin,
Qəm etmə, olsa da əgər əsir qeyri millətin,
Həmişə məsləkin kimi bu xalqı tarümar qıl!

Hər ol kəs ki dəhrdə xəyalın elmə ram edər,
İşıq günün əbəs yerə özünə misli-şam edər,
Çəkib qəmini millətin təəyyüşün həram edər,
Saqınma, milləti-səfeh ona bir ehtiram edər,
Burax bu rahi-məktəbi, cəhaləti şüar qıl!

*1915*

## OLMAQDAN İSƏ

Xaru xəstək, sədəf içrə gövhər olmaqdan isə,
Nökər ol aləmə kim, taci-sər olmaqdan isə.

Təlx güftarın ilə rəncidə et xalqı müdam,
Xoşdur acı danışıq ləbşəkər olmaqdan isə.

Cəhl ilə eyni səadətdü cahanda yaşamaq,
Çalışıb, elm oxuyub bəxtəvər olmaqdan isə.

Yeydir aləmdə hünərsiz yaşamaq insanə,
Dar dünyada əbəd pürhünər olmaqdan isə.

Milləti-qəmzədənin hali-pərişanından,
Yaxşıdır bixəbər ol, baxəbər olmaqdan isə.

Düşmək ahəntək ayaq altına çox izzətdir,
Dəsti-sərrafdə kim simü zər olmaqdan isə.

Qoymamaq eyni səadətdir, ucalsın fələkə,
Bir dirəxt ki, min il barvər olmaqdan isə.

*1915*

# DAD ÇƏKMƏKDƏN

*Ə.Müznib əfəndiyə nəzirə*

Tükəndi ömrümüz millət yolunda dad çəkməkdən,
Çoxaldı dərdimiz min dad, min fəryad çəkməkdən.

Cavan ikən qocaldıq, getdi, heyfa, ömrümüz badə,
Nə camin nəşəsin gördük, nə olduq maili-badə,
Qəmindən millətin şəbü ruz gəldik dadü fəryadə,
Tükəndi ömrümüz millət yolunda dad çəkməkdən,
Çoxaldı dərdimiz min dad, min fəryad çəkməkdən.

Şərabi-eşqi-millətlə, həzar əfsus, məst olduq,
Görüb əzbəs cəfa daşın sürahi tək şikəst olduq,
Düşüb qəm həbsinə zənciri-cəhlə payibəst olduq,
Yıxıldı ol zaman evmiz ki, biz millətpərəst olduq,
Tükəndi ömrümüz millət yolunda dad çəkməkdən,
Çoxaldı dərdimiz min dad, min fəryad çəkməkdən.

O kəs ki, istəyir, möhnətdən olsun canı asudə,
Gərəkdir, millətinin olmasın fikrinə aludə,
Xəlilüllahı yaxsın atəşi-bidadi-Nəmrudə,
Bizim tək olmasın viranələr küncündə qayqudə,
Tükəndi ömrümüz millət yolunda dad çəkməkdən,
Çoxaldı dərdimiz min dad, min fəryad çəkməkdən.

Qəmi-millət bizi məhrum qıldı eyşü işrətdən,
Yədi-ümmidimiz qət oldu axır malü dövlətdən,
Qurtarmaq əmri-müşküldür, bu qədri dərdü möhnətdən,
Cahanda görmədik bir faidə, əfsus, millətdən,
Tükəndi ömrümüz millət yolunda dad çəkməkdən,
Çoxaldı dərdimiz min dad, min fəryad çəkməkdən.

Kənarə almadıq şövq ilə bir dəm nazlı cananı,
Nə olduq Sonya yarın bir gecə izzətli mehmanı,

Əbəs çəkməkdəyik, dünya üzündə dərdi-bicanı,
Qərəz, bihudə sərf etdik bu ömrü, şanlı dövranı,
Tükəndi ömrümüz millət yolunda dad çəkməkdən,
Çoxaldı dərdimiz min dad, min fəryad çəkməkdən.

*1915*

## ƏHSƏN, ƏHSƏN!

Derlər, düşübdü İran səhmanə, əhsən, əhsən!
Əhsəntü barəkallah İranə, əhsən, əhsən!

İranda mən sanırdım, yox öylə bir cəmaət,
Bir gündə eyləsinlər İranə bir himayət,
İranlılarda olmaz, derdim ki, bir fərasət,
Derdim: düzəlməz İran, etsə qiyam, qiyamət,
Düşmüşdür indi derlər, səhmanə, əhsən, əhsən!
Əhsəntü barəkallah İranə, əhsən, əhsən!

İran cəmaətinə söylərdi xalq qanmaz,
Qəflətlə cümlə yatmış, hərgiz daha oyanmaz.
Kim der ki, millətinin İranə könlü yanmaz,
Bilməm, Baba[1], inanır xalq indi, ya inanmaz,
Derlər, düşübdü İran səhmanə, əhsən, əhsən!
Əhsəntü barəkallah İranə, əhsən, əhsən!

Meydani-rəzmə olmuş amadə cümlə sərbaz,
Çəng etməyə qılırlar şövq ilə bəs ki, ağaz.
Sanki kəbutər üstə eylər hücum şəhbaz.
Alət yerinə almış cümlə ələ xəkəndaz,
Derlər, düşübdü İran səhmanə, əhsən, əhsən!
Əhsəntü barəkallah İranə, əhsən, əhsən!

İranə bir deyən yox, ey binəvayi-müztər,
Get karinin dalınca, yox səndə öylə ləşkər,

[1] "Babayi-Əmir" jurnalı nəzərdə tutulur

Öz dərdinə əlac et, qalma bu qədri bisər,
Çıxma kənarə yoldan, həddin deyil bu işlər,
Məğrur olma deyirlər İranə, əhsən, əhsən!
Yeksər düşübdür İran səhmanə əhsən, əhsən!
Əhsən mən etdiyim bu böhtanə, əhsən, əhsən!

*1915*

## EY GÖZÜM

Çəkmə qəm millət yolunda, şad ikən qıl seyri-bağ,
Lalərüxlər seyrin et, çək sineyi-məzlumə dağ.

Məskən et meyxanə içrə, getmə səmti-məscidə,
Məst ol, hər gün başa çək saqi əlindən bir ayaq.

Yandır öz dindaşını zülm atəşilə öylə kim,
Yandırar pərvaneyi-sərgəştəni hər şəb çıraq.

Tutiasa qılma şəhdü şəkkərə hərgiz həvəs,
Fəzləxari-nikbət ol səhralar içrə misli zağ.

Bir könül şad etmək üçün min könül qəmxanə qıl,
Ağlasın çeşmani-mərdüm, öz dəmağın eylə çağ.

Eşqi-Şirin ilə çal başa səfahət tişəsin,
Qoy səni Fərhad sansınlar, məkanın eylə dağ.

Bağla könlün eşqi-tərsayə, əlin çək tiğidən,
Qıl səlibi həzrəti-Sənan kimi daim soraq.

Zahidasa sənəti, elmü fünuni et kənar,
Seyd qılmaqçün əvamı ovçu tək çək bəhrə ağ.

*1915*

## FƏRMAN

Məsciddə bu il hökm elədi Molla Süleyman,
Bir gündə gərəkdir kəsilə Bakıda qurban.

Vəz eylədi minbərdə bu növ ilə o, mövla,
Cəm idi başında o zaman bir neçə molla.
Bəsdir, dedi kim, eylədilər millәti rüsva,
Hər ildəkitək verməyiniz bir cürə fitva.
Məsciddə bu il hökm elədi Molla Süleyman,
Bir gündə gərəkdir kəsilə Bakıda qurban.

Bir yerdə edək cümlə sədaqət ilə bayram,
Hər məclisi-ixvanə edək şövqlə iqdam.
Fəqr əhlinə ehsan edək, ey milləti-bədnam!
Bəlkə, sanalar bizləri də sərvəri-əyyam.
Məsciddə bu il hökm elədi Molla Süleyman,
Bir gündə gərəkdir kəsilə Bakıda qurban.

Mehr ilə edək bir-birinə ərzi-üxüvvət,
Heç olmaya ortada qərəz, kin ilə bidət.
Bilmərrə yoxalsın aradan kibrü məniyyət,
Əğyar baxıb bizlərə ta ki ala ibrət.
Məsciddə bu il hökm elədi Molla Süleyman,
Bir gündə gərəkdir kəsilə Bakıda qurban.

Tiri-qəmə istərsək əgər, olmayaq amac,
Əl tutmalıyıq şəhrdə varsa nə qədər ac.
Qeyrət günüdür, olmayalar özgəyə möhtac,
Kim qatsa xələl şərə, edin ortadan ixrac.
Məsciddə bu il hökm elədi Molla Süleyman,
Bir gündə gərəkdir kəsilə Bakıda qurban.

Hər kəs belə molla sözünü eyləsə inkar,
Bişübhəvü şəkk aqibət, əlbəttə, olur xar.
Hər kəs ki, bu şeyxə ola dünyada tərəfdar,
Azadə gedər cənnətə, olmaz o günahkar.
Məsciddə bu il hökm elədi Molla Süleyman,
Bir gündə gərəkdir kəsilə Bakıda qurban.

*1915*

## ZƏNN EDƏR

İnsan müdam aqili divanə zənn edər,
Öz dost, aşinasını biganə zənn edər.

Eylər sicudi-meykədə, məscid hesab edər,
Öz məscidi-şərifini meyxanə zənn edər.

Əfsanə olsa da, inanar cahil əmrinə,
Arif sözünü doğrusa, əfsanə zənn edər.

Dünya içində bir evi abad istəməz,
Bayquşmisal hər yeri viranə zənn edər.

Arif həmişə badeyi-qəflətlə məst olub,
Hüşyar əhli-aləmi məstanə zənn edər.

Zahidmisal məkrü riya damini qurub,
Mərdüm üzündə göz yaşını danə zənn edər.

Bəziləri tək arifə divanə söyləyib,
Amma özünü aqilü fərzanə zənn edər!

*1915*

## OLMASIN

Arif odur ki, dəhrdə əhli-ədalət olmasın,
Sahibi-əğlü mərifət, kani-səxavət olmasın!

Adəm odur ki, tərk edə büsbütün arü qeyrəti,
Mali-yetimi udmağa ruzü şəb ola niyyəti.
Zövqü səfayə dil verib çəkməyə dərdi-milləti,
Necə ki mollalar demiş: beylə bir adət olmasın!

İnteligent olan gərək müdami meypərəst ola,
Ayıq zamanı olmayıb, həmişəliklə məst ola.
Zülfi-nigarə dil verib, əsirü payibəst ola,
Ol deyil, aqil, onda kim boylə əlamət olmasın!

Tutaq ki, sandılar səni bir yekə əhli-mərifət,
İnanma ki, olar sənə bu işdə zərrə mənfəət.
Rəisi-şəhr olan, bəli, edər bu növi məşvərət,
Həzar dəfə bədəzin daha səadət olmasın!

Daim əziyyət eyləmək hər kəsə olsun adətin,
Şöhreyi-şəhr ola gərək zillət ilə səfahətin.
Eylə xəyanət, olsa gər hər kəs ilə şərakətin,
Həzzi nə ol şərikliyin onda xəyanət olmasın?!

*1915*

## BABA ÖYÜDÜ

*Mehtər Nəim[1] əfəndiyə oxşatma*

Əzizim, aqil olma, cəhd qıl tut rəsmi-nadanlıq.
Fəqət nadanlıq ilə dəf olar hər bir pərişanlıq.

Dəm ur[2] zahid kimi bihudə daim adəmiyyətdən,
Düşünmə, anlama, bilmə, nədir dünyadə insanlıq.

Salıb nari-fəraqə, Adəmi cənnətdən ixrac et,
Elə zahirdə möminlik, vəli batində şeytanlıq.

Cavansan, ömrünü sərf etmə elmə, keyfə məşğul ol,
Çəkərsən aqibət, oğlum, qocalsan çox peşimanlıq.

Olub sailbəkəf daim dolan, bilmə həya qədrin,
Gədalıq rütbəsin kəsb et, budur aləmdə sultanlıq.

Müsəlmansan nə eybi, vur, yıx, öz dindaşını öldür,
Budur, qanuni-milliyyət, budur rəsmi-müsəlmanlıq.

İnanma elmdən bir faidə var, derlər insanə,
Qulaq vermə bu mövhum sözə, odur məhz heyvanlıq.

Meyü məşuqə ilə gündə məst ol, hüşyar olma.
Əgər kəsb etmək istərsən cahanda elmü ürfanlıq.

Görüb bir əcnəbi, tülkü kimi tez gəl ona yalvar,
Vəli həmcinsinə qəhr eylə daim, eylə aslanlıq.

*1915*

---

[1] Şair Seyid Zərgərin gizli imzasıdır
[2] Vur

## ARİF ODUR Kİ...

Arif odur ki, gözləməyə ehtiramını,
Rüsvayi-aləm eyləyə öz nəngü namını.

Gəldi-gedərlə sabiti-təşxis qılmaya,
Fərq etməyə rəqib ilə yarın məqamını.

Yüz il birilə həmdəm olub duz-çörək yeyə,
Bir gündə yüz ilin poza həqqi-səlamını.

Xalqa nişan verə özünü xadimi-vətən,
Əmma düşünməyə vətənin ehtişamını.

Hal əhli zənn edə özünü ruzü şəb, vəli
Qal ilə müttəsil keçirə sübhü şamını.

Hər kəc nigəhlə həmdəm olub, düz hesab edə,
Ney kimi suzi-dil edə Rüstəmlə Samını.

Bəhsi-kəmalü əql edə naqis ikən özü,
Çərxin hilal zənn edə mahi-təmamını.

Xud kasəlis ola, sana əhbabi kasəlis,
Könlüm kimi şikəst edə Cəmşid camını.

Varlı görəndə səcdə edə bütpərəst kimi,
Yoxsul görəndə döndərə həcvə kəlamını.

*1916*

## DEMƏDİM?

*Qəyyur əfəndiyə[1] oxşatma*

Ay Baba, mən sənə bu mətləbi pünhan demədim?!
Yazma nahaq yerə “ariflərə” böhtan, demədim?!

---

[1] Cəfər Cabbarlının gizli imzalarından biridir

Sənə layiqmidir, hər aqilə irad edəsən?
Göstərib səhvini iradını tedad edəsən?
Sən gərək badə içib, xatirini şad edəsən,
Könlünü badəpərəst olmağa mötad edəsən,
Eybcu olma, əfəndim, sənə hər an demədim?!

Yeri vardır, səni təqbih edə bir pakinəjad,
Haqlıdır, gər sənə yazsa da o, min dürlü irad,
Çünki ustadır o, görmüşdü əzəldən "ustad",
Ey qatan bir-birinə aləmi, ey kani-fəsad,
Bikəmal olma, yetər ağlına nöqsan, demədim?!

Tutalım, möcüzə var səndə yədi-beyza tək,
Nə gərəkdir sənə, Firon boğasan Musa tək?
Saçdığın nuru görür xalq şəbi-yelda tək,
Sən əgər mürdələr əhya edəsən İsa tək,
Yenə bu xalq gətirməz sənə iman, demədim?!

Nə işin tacir əfəndi uduzub var-yoxun,
Satıb əmlakını, hərgiz verə bilməz naloqun,
Şəhrin incitmədəsən büsbütün ac ilə toxun,
Adil ol, ay Baba, düş barı, bir insafə yaxın,
Aşayıb şorbanı, çək başına yorğan, demədim?!

Nə yerin sahibisən, arifisən, şairisən?
Alimi, rindü müdiri, vələdi-mahirisən.
Hansı bir el-obanın rahimisən, qahirisən,
Qoyma övladi-nəcibə dolaşa bakiri sən
Ki, qopar Nuh kimi başına tufan, demədim?!

*1916*

## GÖRÜRƏM

*Tazə şəhərdən Qəyyur əyyar*
*əfəndiyə oxşatma*

Arifin hər işi dünyada fənadır, görürəm,
Arif olmaq özü bir başa bəladır, görürəm.

Qədrü qiymət hanı ol rind qoya ürfanə?
Ya ki, əql əhlini zənn eyləməyə divanə?
Arifin haqq sözünə söyləməyə əfsanə,
Can deyilmi, olasan məsti-meyü meyxanə!
Xalq hamı maili-mey, zövqü səfadır, görürəm.

Nə gərəkdir mənə, fəryad qılam millət üçün,
Ya ki, sərf eyləyəm övqatımı milliyyət üçün?
Ya verim badi-fənaya özümü qeyrət üçün,
Nolur hasil mənə, aya, bu qədər zəhmət üçün?
Mənim haqqımda həqiqət, bu cəfadır, görürəm.

Millətin möhnətinə yandım əbəs sübhü məsa;
Etmədim kamimcə dəhrdə bir seyrü səfa,
Der idim, xalq məni zənn eləsin, həm ürəfa,
Tutalım, oldum əfəndi, ürəfa ya üdəba,
Baxıram halinə, ölkə ürəfadır, görürəm.

Sevirəm mən bunu, əlhəqq, bu imiş ünsiyyət,
Qoyasan adını dünyada fəqət intiligent,
Lakin heç bilməyəsən kim, nə imiş milliyyət,
Olasan sübhü məsa maili-eyşü işrət,
Mey içib söyləyəsən, ruhə qəzadır, görürəm.

Arif olmaq yaraşır boynuyoğun, şişpapağa,
Xəlq gördükdə onu bəzmdə dursun ayağa.
Xoş gəlibsiz, – hamı bir yerdə desinlər: – ay ağa!
Hörmətin tutmasalar “movzeri” çəksin ayağa,
Dəhrin övzayi-əzəldən bu binadır, görürəm.

Tazəşəhr içrə nə qədri görürəm, vardır ədib,
Elmü tarixə bələd, cümləsi hər dərdə təbib,
Gəlməmiş əsrə nə bunlar kimi bir “mərdi-nəcib”,
Aşina zənn eləyirlər kimi gördükdə rəqib,
Bu əda məndən həqiqətdə cidadır, görürəm.
Arif olmaq özü bir başa bəladır, görürəm.

*1916*

## XALİ

Mehri-ünqasını qıl, kuhi-vəfadən xali,
Kəbəyi-məqsədin et, səyü səfadən xali.

Talib ol zülmətə, xurşididən ikrah eylə,
Kəndini şəbpərə tək eylə ziyadən xali.

Hər bina eyləsən icad cahan mülkündə,
Qılma məkkarəliyi heç o binadən xali.

Sərf qıl ömrünü zillətlərə rahət yaşama,
Olmasın mərd gərək dərdü bəladən xali.
Elmi gər Çində də vacib buyurub peyğəmbər,
Getmə ardınca, deyil elm xətadən xali.

Çeşmi-suzəndən əgər naqəyə yol mümkündür,
Kim deyər, olmaya zöhd əhli riyadən xali.

*1916*

## NƏDARƏM

Asudə mənəm ki, xər nədarəm,
Əz abü ələf xəbər nədarəm.

Dünya dəyə bir-birə sərapa,
Min həşr ola şuriş ilə bərpa,
Sərtasər əgər dağılsa dünya,
Təsir eləməz mənə heç əsla.
Asudə mənəm ki, xər nədarəm,
Əz abü ələf xəbər nədarəm.

Millət bata yüz qəmü məlalə,
Ney tək edələr fəqanü nalə.
Hər gün yetə gər vətən zəvalə,
Bir zərrəcə düşmərəm xəyalə,
Asudə mənəm ki, xər nədarəm,
Əz abü ələf xəbər nədarəm.

Yoxsul ola gər bütün cəmaət,
Gər ölsə də qılmaram himayət.
Millət qəmi, biqəmə nə hacət?
Bir kəs mənə eyləməz məlamət,
Asudə mənəm ki, xər nədarəm,
Əz abü ələf xəbər nədarəm.

Nə əhli-diləm ki, anlayam dil.
Nə arifəm, elm edəm də təhsil.
Nə öyləcə naqisəm, nə təkmil,
Nə xahiş edərsəm, olar hasil,
Asudə mənəm ki, xər nədarəm,
Əz abü ələf xəbər nədarəm.

*1916*

## QUBA MEYDANI

Çıxdı səd heyf, əlimizdən ol ədalət kani,
O juliklər yatağı, köhnə Quba meydani.

Var idik bir neçə dəllal hamı pakizənəjad,
Müxtəsər kim, bizim əlmizdə idi hər bir zad,
Xalq gər hiylədə şeytanı sanır kani-fəsad,
Bizə şagird olamazdı, hələ qalsın ustad,
Hiyləvü məkr ilə fəsx etmiş idik şeytani.

Karimiz sübhü məsa aləmi aldatmaq idi,
Birə beş xalqa baha qiymətə şey satmaq idi,
Qərəz, adət bizə asudə yeyib yatmaq idi,
Göz görə xalqı bütün karimiz aldatmaq idi,
Bizə, yarəb, yenə qismət elə o dövrani.

Bundan əqdəm, Baba, biz keyf çəkərdik məqul,
Eləmişdik hamı arsızlığı şövq ilə qəbul,
Söysün aləm məni, ta ki mənə pul olsun hüsul,
Kişinin qeyrəti, namusu fəqət puldur, pul,
Satmasam mən pula, kafirəm əgər imani.

Kim ki, meydanə tərəf eyləsə idi iqdam,
Vay onun halına olsun, o da ki, onda əvam,
Çəkər idik o fəqirin işinə biz əncam,
Var-yoxun ol dəm əlindən alar idik itmam,
Becəhənnəm ki, acından çıxa onun cani.

Bizə bu sənət o vaxt ki, Baba, bir adət idi,
Ruzü şəb satdığımız köhnə, çürük saət idi.
Canımız bunca əziyyətdən əcəb rahət idi,
Tez bu meydanə gələrdi kimə nə hacət idi,
Məkr ilə almağa məcbur edərdik ani.

Bir də satdırmağa saldata verərdik şalvar,
O dəm ətrafın alırdı bütün əhli-bazar,
Xeyli təriflər idik, görsə idik müştəri var,
Xalqdan tez onu eylərdik o saətdə kənar,
Mağazin malıdı, söylərdik ona pünhani.

Aldanardı, biz ona hər nə deyərdik o zaman,
Neyləsin ol, bizi ancaq kişi eylərdi güman,
Tez ikən malı alıb göz görə çəkdikdə ziyan;
Bu sözü suz ilə söylərdi, edib ahü fəğan,
Biz müsəlmanda da insafü mürüvvət, de, hani?

*1916*

## İNSAN OLURAM

Şüəralıq rəvişin tərk edib insan oluram,
Nola, divanə isəm, aqili-dövran oluram.

Büsbütün xalq adam öldürmək ilə ad qılır,
Yox bir irad qılan onlara, hər zad qılır,
Şüəra millətin iradını irşad qılır,
İndi ki, bəzi "mühərrir" mənə irad qılır,
Mən də onlar kimi bir mənbəyi-ürfan oluram.

Vurmaram bir də daha mən şüəralıqdan dəm,
Niyə dəysin mənə bu barədə min səngi-sitəm,

Haqlıdır gər məni zənn etməsə el əhli-qələm,
Şairəm, çünki budur vəchi mühərrir deyiləm,
Xud əgər kafir isəm, indi müsəlman oluram.

Şer yazmaqlığı dünyada sanırdım hikmət,
Şeri həm öylə bilirdim ki, düri-pürqiymət,
Demə, şairdən edərmiş hamı aləm nifrət,
Çəkmişəm boş yerə şairlik üçün mən zəhmət,
Şair olmaqlığıma indi peşiman oluram.

Şair imiş eləyən milləti aləmdə zəlil,
Şairin yoxdur o qədri, ola doktor, uçitel,
Bizə çox görmə mühərrirləri, ey rəbbi-cəlil,
Bunlar imiş edən icad balon, avtomobil,
Bunlar icad qılan işlərə heyran oluram.

Deyiləm öylə mühərrir ki, qanım həqqü hesab,
Nə də kim, öylə ədibəm, düşünəm rəsmi-hicab,
Arif olsaydım, oğurlarmıdım hər yerdə kitab,
Şair olmaq məni axır edəcək xanə-xərab,
Öz əlimlə niyə mən xanəsi viran oluram?
Şüəralıq rəvişin tərk edib insan oluram.

*1916*

## YATIRAM

Mən də, ay can, nə qədər yatsa müsəlman, yatıram,
Məni dindirmə, qoy asudə, ay oğlan, yatıram.

Adət olmuş bizə çün ruzi-əzəldən yatmaq,
O səbəb sübhü məsa mən dəxi hər an yatıram.

Xızrtək rahinuma olmaram hər gümrahə,
Nuh isəm, aləm ara qopsa da tufan, yatıram.

Qabil övladıyam, Adəm babamın vəchi budur,
Olaram, yatmasam, axırda peşiman, yatıram.

Həşr gər qopsa ayılmam, elə bədxabəm kim,
Hər zaman şamü səhər, vəxt obaşdan yatıram.

Ruzü şəb ağlasa övladi-vətən qəm yemərəm,
Mərdi-xoşbəxtəm özüm xürrəmi-xəndan yatıram.

Etmərəm sakit əgər bir-birin öldürsə əvam,
Çünki yox məndə o qeyrət ki gedim, qan, yatıram.

Qırılıb yoxsul acından yata bilməzsə, nə qəm,
Mən yeyib hər gecə keyf ilə fisincan, yatıram.

Mən haman Qahir idim, xalq mənə tabe idi,
İndi bir kimsə məni bilməyir insan, yatıram.

*1916*

## QOÇU

Bir qoçuydum, çoxdu qabaq hörmətim,
Xalqı döyüb, söymək idi sənətim,
İndi qalıb ürəyimdə həsrətim,
Öldürə bilmirəm, döyə bilmirəm,
Heç kəsi incidib, söyə bilmirəm.

İncidirdim qabaq bənnə, fəhləni,
Gətirmişdim təngə bütün məhləni,
İndi döyüb, söyür hər yetən məni,
Öldürə bilmirəm, döyə bilmirəm,
Heç kəsi incidib, söyə bilmirəm.

O gündən ki, şəhrə düşüb inqilab,
Bu qüssədən bağrım olubdur kabab,
Körpələr də mənə qaytarır cavab,
Öldürə bilmirəm, döyə bilmirəm,
Heç kəsi incidib, söyə bilmirəm.

Əsirdi qonşular gələntək adım,
Bir kişidən yox idi qorxum, zadım,
İndi bəyənmir məni öz arvadım,
Öldürə bilmirəm, döyə bilmirəm,
Heç kəsi incidib, söyə bilmirəm.

Bundan əzəl qoçaqdım Fərhad kimi,
Kəsdirərdim tinləri cəllad kimi.
Girmişəm indi evə arvad kimi.
Öldürə bilmirəm, döyə bilmirəm,
Heç kəsi incidib, söyə bilmirəm.

*1921*

## DÖVRAN BİZİM OLDU

Mahi-rəmazandır, yenə dövran bizim oldu,
Yüz yerdə yenə vədeyi-ehsan bizim oldu.

Bu ayda olur mollaların keyf zamanı,
Aylarda mübarək eləyib həqq rəmazanı.
Qoy biz yeyək, acların acından çıxa canı,
İndi ki müsəmma və fisincan bizim oldu.
Yüz yerdə yenə vədeyi-ehsan bizim oldu.

Gəldi rəmazan, ruhumuzu eylədi tazə,
Bu vəchlə məşğul idik hər gündə namazə,
Bu on bir ayı həsrət idik nemətü nazə,
Səd şükr, yenə neməti-sübhan bizim oldu,
Yüz yerdə yenə vədeyi-ehsan bizim oldu.

Fikri bizi təhqir eləməkdən ürəfanın,
Yəni ki, qalaq qeydinə biz də füqəranın.
Ölsün füqəra, borcu deyildir üləmanın,
Hardan gəlib ol firqeyi-neyran bizim oldu?
Yüz yerdə yenə vədeyi-ehsan bizim oldu.

İslamidə var gərçi min illərlə bu adət,
İndi ki bilən yox, nədən olduğu ibarət.
Jurnalçı min il yazsa, ayılmaz bu cəmaət,
Sür, Molla Zaman, atını, meydan bizim oldu,
Yüz yerdə yenə vədeyi-ehsan bizim oldu.

Hər tövr onu biz quraraq püxtəvü xamə,
Şeytan da bizimtək sala bilməz onu damə,
Təfsir eləmək sureyi-Quranı əvamə.
Hiylə toru qurmaq ona əlan bizim oldu,
Yüz yerdə yenə vədeyi-ehsan bizim oldu.

*1924*

## ACI GÜLÜŞLƏR

Bu mollanın qəribə təqvası var,
Hansı güruhun belə mollası var?!

Bu molla bir mömünü dindardır,
Şöhrəti var, falçıdır, cindardır,
Təbabət elmində də huşyardır,
Bunda, həqiqət, elm dəryası var,
Hansı güruhun belə mollası var?!

Falçılığı qalsın hələ bir yana,
Elmi-təbabətdə yetib Loğmana.
Gündə naxoşlar düzülür yan-yana,
Xəstəyə əntiqə müdərası var,
Hansı güruhun belə mollası var?!

İstəməz heç kimsənənin bir zadın,
Əgərçi rüsvay eləyibdir adın.
Gündə gəlir yanına yüz cür qadın,
Nə “minnəti”, nə də “təmənnası” var,
Hansı güruhun belə mollası var?!

Molla ki, var adi bir insan deyil,
Həm də nə iş tutsa ona man deyil.
Mollaya eyb eyləmək asan deyil,
Bilən bilər, bunun nə mənası var!
Hansı güruhun belə mollası var?!

Bir də odur əsli müsəlmani-pak,
Əlləşə gündüz-gecəni hövlnak.
İşlədiyin mollaya versə nə bak.
Onun bu dünyası, həm üqbası var,
Hansı güruhun belə mollası var?!

*1924*

## DƏLLALLARIN HİYLƏSİ

Dəllallar ilə hiylədə şeytan da bacarmaz!
Şeytan nəçidir, cin nədi, xortdan da bacarmaz!

Bir kəndçi ola xam, gələ at almağa nagah,
Vay halına, dəllallar işindən ola agah,
Bir növi soyarlar onu, göstərməsin Allah!..
Qəssablığı bunlar kimi şeytan da bacarmaz,
Şeytan nəçidir, cin nədi, xortdan da bacarmaz!

Aldatmaq olur kəndlini təriflə xəyalı!
“Bax gör necə xoş kakili vardır, necə yalı.
Hərçənd ki, bu, atdı, vəli yoxdu misalı,
Var bir yerişi ki, onu ceyran da bacarmaz,
Şeytan nəçidir, cin nədi, xortdan da bacarmaz!”

Min hiylə ilə ata onu raqib edərlər,
Axır ki, neçə işvə ilə talib edərlər,
Biçarəni bir kəmli ata sahib edərlər,
Bir çarə o biçarəyə Loğman da bacarmaz,
Şeytan nəçidir, cin nədi, xortdan da bacarmaz!

Var bir çoxu qalmaz orucundan, namazından,
Baxsan neçə yüz ev yıxıb ömründə azından,
Tərk etməyəcək canı çıxınca boğazından,
Quldurluğu dəllal kimi aslan da bacarmaz,
Şeytan nəçidir, cin nədi, xortdan da bacarmaz!

*1924*

## SÜR DƏRƏYƏ

Molla göstərdiyi yolla yeri, dönmə geriyə,
Ağa ki, əmr elədi: sür dərəyə, sür dərəyə!

Desə ərbabi-qələm, cəhd qıl, elm eylə hüsul,
Yəni bielm olan əbnayi-bəşərdən nə vüsul?
Baxma onlar nə desə, molla sözün eylə qəbul,
Hər zaman olsa, gərək mollanın əmri yeriyə,
Ağa ki, əmr elədi: sür dərəyə, sür dərəyə!

Bu gün asayişinə baxsan əgər İranın,
Eylə bir iş tapa bilməzsən ola biqanun.
Çünki hökmü o məkanda yeriyir mollanın,
Bir nəfər molla böyükdür neçə min həmşəriyə,
Ağa ki, əmr elədi: sür dərəyə, sür dərəyə!

Görünür çünki məhərrəm ayının asarı,
İndidən biz para cəm etməliyik elcarı.
Müftəxor mollaların açılacaq bazarı,
Hərə bir növi mətahin satacaq müştəriyə,
Ağa ki, əmr elədi: sür dərəyə, sür dərəyə!

Gərçi İran şəbikərdanlarının hörməti var,
Şəbixanlıqda bizim kor Həbibin şöhrəti var,
Hansı üzlə bu cənabə oların nisbəti var?
İsmü rəsmi yetişib Gərməriyə, Həştəriyə,
Ağa ki, əmr elədi: sür dərəyə, sür dərəyə!

*1924*

## MƏNASINA BAX!

Aman, ay Molla[1], bu şeri oxu, mənasına bax!
Sərfinə, nəhvinə, imlasına, inşasına bax!

Şer yazmaqlığa, hərçənd ki, yoxdur həvəsim,
Demirəm şair olum, çulğasın ətrafı səsim,
Leyk var bir neçə söz yazmağa öz interesim,
Oxu başdan-başa sən, gizli müəmmasına bax!
Aman, ay Molla, bu şeri oxu, mənasına bax!

Düşməmişdir parapet səmtinə bir yol güzərin,
Yetməmiş ordakı maklerlərə bir dəm nəzərin.
Bir çoxu dəllal olubdu, niyə yoxdur xəbərin?
Bircə gəl onların etdikləri sövdasına bax!
Aman, ay Molla, bu şeri oxu, mənasına bax!

Yorulur, işləyir axşama kimi bir əmələ,
Dincin almaqlığa bir dəm ki salır fürsət ələ,
Görəcək əyləşən skamyada dəllaldır hələ.
İşçinin bir yer üçün boş, quru xülyasına bax!
Aman, ay Molla, bu şeri oxu, mənasına bax!

Hələ vardır neçəsi dinçi qoyubdur adını,
Başlı-başına buraxıb evdəki öz arvadını,
Şübhəsizdir, deyəcək, görsə gözəl yad qadını:
– Bircə bu madmazelin surətü simasına bax! –
Aman, ay Molla, bu şeri oxu, mənasına bax!

*1925*

## DƏRVİŞ

Ay Molla, bizə mərhəmətinlə nəzər eylə,
Yaz jurnala elanımı, xalqa xəbər eylə.

[1] "Molla Nəsrəddin" jurnalı nəzərdə tutulur

Dərvişlərimiz keçmişə nisbət azalıbdır,
Tən yarı gedib rəhmətə, indi nə qalıbdır?
Lakin bu qalanlar da, görürsən, qocalıbdır,
Lütfünlə yenə ölkəmizi bəxtəvər eylə,
Yaz jurnala elanımı, xalqa xəbər eylə.

İstərsən əgər, el eləsin mollaya rəğbət,
Biz onlara, onlar da bizə etməyə lənət,
Lazımdır edək onları dərvişliyə dəvət.
Qurbanın olum, tez bu işi birtəhər eylə,
Yaz jurnala elanımı, xalqa xəbər eylə.

Dərvişsiz olan məmləkətin ləzzəti olmaz,
Hərgiz mədəniləşməz, onun qiyməti olmaz.
Elmi, ədəbi, məktəbi, ünsiyyəti olmaz,
Bu yolda çalış, Molla dayı, bir hünər eylə.
Yaz jurnala elanımı, xalqa xəbər eylə.

Dönnəm başına, durma di, min əyriplanə,
Əvvəlcə gəzib Qafqazı, get sonra İranə,
Bu məsələni söylə cəmi mərsiyəxanə,
Səlyanə də, qurban sənə, dön bir güzər eylə,
Yaz jurnala elanımı, xalqa xəbər eylə.

*1925*

## ŞEYXƏ BİR İMDAD

Əfsus ki, yoxdur yetişən dadına şeyxin,
Get məscidə, bax naləvü fəryadına şeyxin.

Vardır bu mərəz şeyxidə, derlər ki, yaşından,
Hər yerdə yeyib doymasa gər ehsan aşından,
Hər il rəmazan ayı çıxır əqli başından,
Allah özü rəhm eyləsin övladına şeyxin,
Əfsus ki, yoxdur yetişən dadına şeyxin.

Hətta belə derlər ki, bu il keçmişə nisbət,
Şeyxin mərəzi etmədədir get-gedə şiddət,
Gər böylə qalıb olmasa biçarəyə səhhət,
Bu xəstəlik eylər əsər əhvalına şeyxin,
Əfsus ki, yoxdur yetişən dadına şeyxin.

Verməz sözə minbərdə nəhayət, yerə düşməz,
Ta yatmasa məsciddə cəmaət, yerə düşməz,
Ağzından onun qüslü təharət yerə düşməz,
Hərdəm elə xoş löğmə düşür yadına şeyxin,
Əfsus ki, yoxdur yetişən dadına şeyxin.

Heç molla bunun kimi deyil hər işə zirək,
Çoxlar həsəd eylər ki, nədən şeyx özü bir tək,
Guya götürüb şəhridə məscidləri podrək,
Xalis quru böhtan yaşayır adına şeyxin,
Əfsus ki, yoxdur yetişən dadına şeyxin.

Mahi-rəmazan şeyxə edib xeylicə təsir,
Bilmir özünü, bəs ki, tapır haləti təğyir.
Bazarda etmiş neçəsin boş yerə təhqir,
Onlar da söyüb axırı hər zadına şeyxin,
Get məscidə, bax naləvü fəryadına şeyxin.

*1925*

## TƏXMİS-MƏZHƏKƏ

Ey sənəmi-türreyi-pürpiç tab,
Kimsədə yox zərrəcə hicrində tab.
Həsrəti-didarınadır şeyxü şab,
“Sübh salıb mahi-ruxindən niqab,
Çıx ki tamaşaya, çıxa afitab”.

Mən kimi min tüklüqulaq, heyvərə
Sahib ikən dövlətü simü zərə,
Talibdir sən kimi siminbərə,

"Rişteyi-canım yetər, et bir kərə,
Salma səri-zülfi-səmənsayə tab".

Aşiqini qoyma qəmindən yana,
Döndü fəraqında könül büryana.
Qanmaz inanma, gözəlim, söz qana,
"Məst çıxıb, salma nəzər hər yana,
Görmə rəva kim, ola aləm xərab".

Eyləmə nifrət məni-müştaqidən,
Keçmişəm eşqində oğul-şaqidən.
Rəhm elə, qaldır məni torpaqidən,
"Kəsmə nəzər canibi-üşşaqidən,
Naleyi-dilsuzidən et ictinab".

Dövr eləsə min sənə çərxi-fələk,
Məh görəməz sən kimi biribüşəkk.
Hanı bəşərdə sənə bənzər mələk?
"Gecələr əncüm sayıram sübhədək,
Ey şəbi-hicrin mənə yovməl-hesab".

Rövzeyi-kuyində sənin hər zaman,
Bülbüli-şeyda kimi qıllam fəğan.
Xoşdu ki, eşqində olam bağrıqan,
"Duzəxə girməz sitəmindən yanan,
Qabili-cənnət deyil əhli-əzab".

Tut nəzərində, nola, bir dəm məni,
Lütflə qıl vəslinə məhrəm məni,
Zənn eləmə Əhmədi-biqəm məni,
"Saldı damaqdan, qəmi-aləm məni,
Ver mənə qəm dəfinə, saqi, şərab".

Baxma bu kaftar əməlin yalinə,
Düşsə sənintək xanımın dalinə.
Gəl evə, bax dövlətinə, malinə,
"Rəhm qıl üftadələrin halinə,
Hiç gərəkməzmi sənə bir səvab?!"

Xahişin pul isə, məlalın nədir?
Bir neçə dəqiqə vüsalın nədir?
Mənə də tez söylə, xəyalın nədir?
“Yar sual etsə ki, halın nədir?
Xəstə Füzuli, nə verərsən cavab?!”

*1925*

## MİNACAT

Ey mollaların sərvətü samanı orucluq,
Fəxri, şərəfi, mənbəyi-ehsanı orucluq!

Tez gəl, yetiş, öldürdü bizi həsrətin, ey mah,
Bir bizdən ötrü həq səni xəlq eylədi, billah.
Bilməz də sənin qədrini bu ümməti-gümrah,
Qurban sənə bu şeyx əminin canı, orucluq.

Hümmət yağıyor Maştağaya indi sərasər,
Qalmaz toz içində dəxi mehrab ilə minbər,
Quldur qoçu, cibgir, beçəbaz, dinçi iyidlər
Təmir qılır məscidi-viranı, orucluq.

Çıx parla, yetər, aç üzünü, ey məhi-taban,
Əmmaməli, üryan lotular açmağa meydan.
Dikmiş sənə həsrət gözünü silsiləcünban,
Ta xalqı soyub doldura həmyanı, orucluq.

Verrəm qəsəm öz şəninə xəllaqi-cahanı,
Alsın nəzərə mollaları, mərsiyəxanı,
Bir il eləsin, kaş bu bir ay rəmazanı,
Tutsun bütün hər ölkəni, hər yanı orucluq!

*1925*

## GÖZÜN AYDIN

Qəflətdən ayıl, Molla Süleyman, gözün aydın,
Çatmış ramazan, yatma, ay oğlan, gözün aydın!

Dur xəncərini sazla, yetər, eyləmə qəflət,
Qarət ayı gəldi, bizə çatdı yenə növbət.
Məscid döşənib, hazır olub məclisi-işrət,
Tufan qoparır dudeyi-qəlyan, gözün aydın!

Əmmaməni qoy başına, gey tirməvü şali,
Çiynində əba, əldə əsayi-mütəali,
Yax rəngi-həna, "çornı" elə saqqalı, yali,
Sür atını, çatdı sənə meydan, gözün aydın!

Bu ayda bütün yallanacaq köhnə köpəklər,
Baqqal, qoçu, həp xalqı soyanlar – bığıbəylər.
Ehsan edəcəklər sənə min dürlü yeməklər,
Qarnın dolacaq dolma, fisincan, gözün aydın!

Gündüzləri düş meydana, hambalları yanla,
İftarə çağır məscidə, et möizə, danla,
Çıx çərxi-xoruztək gecələr damlara, banla,
Bidar elə xalqı hər obaşdan, gözün aydın!

*1925*

## ŞURADAN ƏLİM ÇIXDI...

Şuradan əlim çıxdı, lap oldum evi bərbad,
Faş etdi bütün sirrimi mürtəd qızı arvad.

Sədr olmağıma razı idi, məncə, xəlayiq,
Məndən bu sayaq yox idi qəti-əlayiq.
Ancaq məni arvad bu işə görmədi layiq,
Nöqsanımı bir-bir üzümə eylədi tedad,
Faş etdi bütün sirrimi mürtəd qızı arvad.

Alçaq bir adam olduğumu anladı hər kəs,
İş başına keçməkliyimə vermədilər səs.
Birdən-birə tapdandı "hüququm", nə edim bəs?
Yüz dadü fəğan eyləsəm, olmaz mənə imdad,
Faş etdi bütün sirrimi mürtəd qızı arvad.

Arvaddan əgər etməsə hər bir kişi nifrət,
Hərgiz deyil o həzrəti peyğəmbərə ümmət.
Arvaddan həmişə həzər etmiş özü həzrət,
Var naqisi-əql olmağına ayələr inşad,
Faş etdi bütün sirrimi mürtəd qızı arvad.

Gəldim evə ondan sora seçgi qurtarandək,
Aldım əlimə saçlarını əfi ilantək.
Vurdum o qədər baş-gözünə qıllı qabantək,
Fəryadına kənd əhli gəlib eylədi imdad,
Faş etdi bütün sirrimi mürtəd qızı arvad.

*1925*

## GƏLİB

Dinçilər, hazır olun, bir qoca ovbaş gəlib,
Bütün əmmaməli meymunlara yoldaş gəlib.

Eyləmiş Culfa yoluyla neçə min hüri baqac,
Rövzə yarmarkasına verməyə onlarla rəvac.
Çox ucuz qiymət ilə eyləyəcəkdir hərrac,
Bol görüb müştərisin etməyə daşbaş gəlib,
Dinçilər, hazır olun, bir qoca ovbaş gəlib.

Olmuş "ənkəhtü vəzəvvəctü" dilində əzbər,
Qız verir, siğə oxur, falə baxır şamü səhər.
Oxuyur minbərin üstündə "Rəhab"ü "Şüştər",
"Şur" ilə etməyə arvadlara göz-qaş gəlib,
Dinçilər, hazır olun, bir qoca ovbaş gəlib.

Açmış ol həzrəti şəhvət yenicə siğəxana,
Mərhəba, böylə vücuda, beləcə rövzəxana.
Çaşmayın müştərilər, getməyəsiz başqa yana,
Adresin yaxşı bilin ki, təzə əyyaş gəlib,
Dinçilər, hazır olun, bir qoca ovbaş gəlib.

Yaxşı huriləri var, qönçədəhən, qıssa tuman,
Dikdaban tufli ayağında, üzündə kirşan.
Hamı əntiqəfiruşdur, hamısı yaşda cavan,
Eləsi var ki, hələ olmayıb on yaş, gəlib,
Dinçilər, hazır olun, bir qoca ovbaş gəlib.

*1925*

## HÜRİYYƏTİ-NİSVAN

Keçməz işə bu əsrdə hürriyyəti-nisvan,
Qan bir kərə, söz müxtəsər: arvad deyil insan!

Arvad gərək heyvan kimi çöldə otarılsın,
Gördükdə ərin vahimədən bağrı yarılsın.
Hər gün döyülüb baş-gözü dəsmalla sarılsın,
Tədbirinə doktor da qala acizü heyran.
Qan bir kərə, söz müxtəsər: arvad deyil insan!

Var bir neçə dinsiz kişi, bilməz nədi qeyrət,
Arvadlar edir bağçada, bulvarda səyahət.
Amma bizə çatmış belə bir hökmi-şəriət,
Arvad gərək evdə otura hali pərişan,
Qan bir kərə, söz müxtəsər: arvad deyil insan!

Arvad nədir öz həqqını dünyada düşünsün,
Yox, bir də gəlib öz ərinin boynuna minsin.
Əz qol-qıçını, həddi nədir, bir kərə dinsin,
Bu bidəti tərk eyləməz heç pak müsəlman,
Qan bir kərə, söz müxtəsər: arvad deyil insan!

Hər yerdə qadın zəhmətinin həqqi kötəkdir,
Sınmaz dəyənək, arvad üçün şanlı bəzəkdir.
Düz söz də desə, baxma, işi məkrü kələkdir,
Yar baş-gözünü, eylə onu qanına qəltan,
Qan bir kərə, söz müxtəsər: arvad deyil insan!

## PƏH-PƏH

Pəh-pəh, Bakı dönmüş necə gör, xuldi-bərinə,
çıx eylə səyahət.
Ac gözlərini, eylə nəzər dövri-bərinə,
canın ola rahət.

Hər kuçədə bir məclisi-meyxanə açılmış,
əhsən, bu məkanə!
Ovbaşların şöhrəti dünyaya saçılmış,
gəldim dəxi canə.

Hər tində görürsən ki, valaylar xuliqanlar,
əxlaqı yamanlar,
Növrəstə xanım qızlara daim dolaşanlar,
nahəq dalaşanlar.

Bəzi siyirib tutmuş ələ qanlı bıçağı,
vurmaq dilər adəm.
Bəzi o qədər içmiş aşıb başdan ayağı,
nifrət qılır aləm.

Hər yanda təzə yaxşı qumarxanə olub saz,
qarətgah ocağı.
Onlar hamısı dopdolu quşbazla qumarbaz
vəhşilər otağı.

Hər ləhzə görürsən ki, olur mərəkə peyda,
başlandı dalaşma.
Bəzi söyüşür, bəzi edir yox yerə dəva,
onlara yanaşma.

Vardır aşağı hissədə çox nazlı madamlar,
min işvəli canan.
Kastumlu, kraxmallı, bığıburma adamlar,
paltarları əlvan.

Bu hissəyə hər ləhzə “Kommunxoz” edir imdad,
onlar ola rahət.
Onlar da gəzib seyr eləyir bulvarı dilşad,
çəkməzlər əziyyət.

Şəhrin yuxarı çastına var, eylə tamaşa,
diqqət yetir hər an,
Cəmdək qoxusu, mal başı hər tində mühəyya,
nifrət qılır insan.

At dırnağı, tazı ölüsü palçığa batmış,
həm yolları bərbad.
Bilmərrə “Kommunxoz” oranın daşını atmış,
etməz nə səbəb yad?

Çünki orada ömr sürür işçi, əkinçi,
paltarları yırtıq.
Kankənçi, dəmirçi, pinəçi, köylü, dilənçi:
üz-gözləri palçıq.

İşlərsə tramvay yerinə bir neçə furqon,
qəm çəkmə dayan, dur.
Orda yaşayanlar gərək olsun da cigərxun,
dillənmə amandır,
Bu sirri-nihandır.
Yazma bunu, Mülhid,[1]
Kəndinə ziyandır!

*1925*

## İNŞAALLAH

Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah,
Oxuyub xalqımız insan olar, inşaallah!

[1] “Mülhid” Həsən Səyyarın gizli imzasıdır

Yenə var köhnə üsul ilə bu gün dərs oxudan,
Doymamış xəlfələri gör bu min illik yuxudan,
Bu işə yaxşı deyən var Qarabağdan, Nuxudan,
Köhnə məktəbləri dükkan olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

Çox da hər yerdə qumarxanələr olmuş icad,
Xalq içində törədir min cürə hər gündə fəsad.
Ayıl, ay bəxtəvər oğlu, bu deyildir irad,
Aqibət bu işə saman olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

Necə qanmaz kişilər var, aparıb zəhləmizi
Ki, nə var oğru, siqan qarət edir məhləmizi.
Oğruyurlar gecə lampoçkamızı, vedrəmizi,
Hələ onsuz da çırağban olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

Qalmışam matü məəttəl o raboçi Həsənə,
Poçtu soymaq sözünü söyləyir hər gündə mənə.
Bir deyən yox buna, axmaq kişi, axır sənə nə,
Qeybdən dərdinə dərman olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

Tutular dəhnəsi, axmaz yerə yeksan suların,
Xeyr olar aqibəti fikrlərin, duyğuların.
İşi bir yanə yetər mirzələrin, mollaların,
Sarığı başına qalxan olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

Mollalar gərçi edir işçini daim isfal,
Haqqı öz nəfi üçün eyləyir hər yan pamal.
Boğazından yapışar bir gün onun işçi Cəlal.
Özü axırda peşiman olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

Yazıb hər gündə qumarbazı, sataşsaq qoçuyə,
Qorxusundan oların çıxmaq olarmı küçəyə?

Çizkarlar bizi öldürtdürəcək heç neçəyə.
Yerimiz rövzeyi-rizvan olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

Gəldi gül fəsli, tükəndi dəxi əyyami-xəzan,
Çıxacaq bulvara seyr etməyə həp yaxşı-yaman.
Üzü kirşanlı madamlar dolacaqdır hər yan,
Hər tərəf büsbütün əlvan olar, inşaallah,
Ölkəmiz mərkəzi-ürfan olar, inşaallah!

*1925*

## ÇADRA

Ey mənim munisi-qəlbi-nigaranım, çadra!
Səni tərk eyləmərəm, çıxsa da canım, çadra!

Qanmıram heç, nədi hürriyyəti-nisvan, nə demək,
Başaçıq, qıssa tuman, zülfü pərişan, nə demək!
Kurs, klub, əl işi, zəhmət nə demək, can nə demək?
On beş arşın güllü çitdəndi tumanım, çadra!

Mən gərək evdə belə çadralanıb, lap bürünüm,
Bu nə sözdür, neçə naməhrəmə birdən görünüm.
Nə qədər var nəfəsim, sənlə gərəkdir sürünüm,
Qalmaya çöldə gərək kirli dabanım, çadra!

Səni hər dinsiz, imansız atacaq, qoy atsın,
Ar, namusunu əsrə satacaq, qoy satsın.
Gedərək kursa günaha batacaq, qoy batsın,
Olmasın tək mənim üqbada ziyanım, çadra!

Şeyx edibdir mənə təfsir hicab ayəsini,
Cameyi-şəridəki rəncü əzab ayəsini.
Tanrı kəm etməsin üstündən onun sayəsini,
Ona qurban ola min çadralı xanım, çadra!

*1929*

## RÖYASI AXUNDUN

Təsir eləyib millətə röyası axundun,
Xülyası, müəmması, təmannası axundun.

Molla dayı, təbirini yaz, gör neçə röya,
Söylə nə gözəl şənü şərəf rütbeyi-ülya.
Düzlükdə inan, şəkk eləmə bu işə əsla,
Bu möcüzəsi, bu yədi-beyzası axundun,
Lap cilvələnir nur ilə siması axundun.

Bir həftə qabaq məscidə verdikdə səliqə,
Saət ikiyə qalmış ikən yeddi dəqiqə.
Biçarə namaz üstə gedir qəşşi-əmiqə,
Bu növ keçir dövreyi-sutkası axundun,
Bihuş düşür peykəri-rənası axundun.

Guya ki, görünmüş gözünə özgə bir aləm,
Keçmiş üləmalar hamısı orda müəmməm.
İclas açılır, məsələsi mahi-məhərrəm,
Olmuş orası məscidül-Əqzası axundun,
Mövlasına var, gör necə ixlası axundun.

Gördükcə axundu çağırır Həzrəti Fazil,
Mandatın alıb izni-duxuli olur hasil.
İclasda təhlil olunur xeyli məsail,
Axırda çıxır bir belə fitvası axundun,
Olsun bu ili yerdə komandası axundun.

Hər nəf olur-olsun, verə bu il işə rövnəq,
Zahirdəmi, batində çıxa minbərə bilhəq.
Bu növi ola məqsədinə, bəlkə, müvəffəq,
Yəni dola bu fənd ilə torbası axundun,
Yoxdandı ki, naziklənib ortası axundun!

Molla dayı, sən də oxu bu möcüzə səlvat,
Qarelərimiz eyləsin hər yerdə minacat.

Düşsün başa bu məsələni hər kişi, arvad,
Dolması, çığırtması, bozartması axundun,
Vodkası, zakuskası, mürabbası axundun.

*1929*

## AĞAM CANİ

Üzümdə zahir etsəm nuri-imani, ağam cani,
Düşürrəm ərşi-əladən Məsihani, ağam cani.

Əyər nifrin edərsəm sidq ilə künci-ibadətdə,
Edərsəm vird əsmai-üzami bircə saətdə.
Yıxıb birdəfəlik heç qoymaram, dəyyar bu kənddə,
Nə bir mürtəd qalar, nə babi, nə dəhri, nə nəsrani,
Hamısın eylərəm bir anda mən fani, ağam cani.

Bu təsiri-nəfəs kim, məndə vardır, yoxdu İsadə,
Nə Davudü Şüeyb, Xızr, İbrahim, Musadə,
Çatıbdır qırxa istajım ibadət xarüqüladə,
Fəzilət mədəni Səlmani-əsrəm, hüccəti-sani,
Bəha məndən alıbdır dərsi-ruhani, ağam cani.

Yəqin olmaz işə ol söyləsəm, filfövr oldurram,
Təmamən yer üzün bir anda cin ilə doldurram.
"Cəhadi-əkbər"ə fitva verib, məxluqi qırdırram.
Xüsusən çadrasın tərk eyləyən əfradi-nisvani,
Çevirrəm başlarına tərs dəyirmani, ağam cani.

Əyər bir ayətəl-kürsi düasın istiqamətlə
Çıxartsam qalibindən hərfi-həlq ilə, qəraətlə.
Üfürsəm dalbadal kafirlərə böqzi-ədavətlə,
Amandır, Molla dayı, ip gətir bağla bu heyvani
Kəramət sahibi, boynuyoğun quli-biyabani, ağam cani.

*1929*

## HACI NEMƏT KİŞİ

Gözlərin aydın olsun, ay Hacı Nemət kişi!
Sən daha bundan belə eyləmə xiffət, kişi!

Düşməyəcəksən, inan, bir daha yoxsulluğa,
Çıxardı tale səni dar günündə bolluğa.
Eşitdim oğlun girib koprativdə qulluğa,
Aç cibinin ağzını, eyləmə qəflət, kişi!
Gözlərin aydın olsun, ay Hacı Nemət kişi!

Getdiyin Məkkə haqqı, gen-bol olar daşbaşın,
Müftədi bundan belə evdə aşın, bozbaşın.
Həm sən özün yeyərsən, həm də qohum-qardaşın.
Ölüncə heç bir şeyə qalmazsan həsrət, kişi!
Gözlərin aydın olsun, ay Hacı Nemət kişi!

Köhnə bir alverçisən, girmisən dondan-dona,
Oğurluğun, bicliyin fəndini öyrət ona,
Fürsəti fövt eyləmə, qoyma bu gündən sona,
Gərçi qəbul etməsə döy, elə töhmət, kişi!
Gözlərin aydın olsun, ay Hacı Nemət kişi!

Bax, səni aldatmasın bu küçə baqqalları,
Yığ Quba meydanından bir yerə dəllalları,
Sat birə-beş qiymətə gizlədiyin malları.
Boş yerə öz ruhuna vermə əziyyət, kişi!
Gözlərin aydın olsun, ay Hacı Nemət kişi!

Bu sirri xalq içində salma, amandır, səsə,
Şayəd üstü açılsa, bəlli olsa bir kəsə;
Fikr eləmə, salınsa beş-altı il məhbəsə,
Bir az da bu işdə ver sən ona cürət, kişi!
Xalq oxuyar namına öləndə rəhmət, kişi!
Saqqalı qıpqırmızı, baməzə söhbət kişi!

Ay Hacı Nemət kişi,
Eyləmə qəflət kişi!
Arifə bir işarə
Edər kifayət, kişi!

*1929*

## İKİ MOLLA

Molla Həsən, niyyətinə mərhəba,
İş düzələr, deyirdin bu gün, sabah.
Qoy yenə əmmamə, geyin bir əba,
Hər yerə çatdıqda elə lovğalıq,
Mindi qədim şöhrətinə mollalıq.

Əyri otur, doğru cavab ver mənə,
Tutaq ki, əmmaməni qoydun yenə.
Kim baxacaq indi, ay əbləh, sənə?
Molladan aləmin gedir zəhləsi,
Onda da əsrin gözaçıq fəhləsi.

Məsələ aydındı bu gün hər kəsə,
Biz gərək hər yerdə verək səs-səsə.
Qaldı öz əlmizdə məsçid, mədrəsə,
İzn verib bizə konstitutsiyə,
Batmayacaq molla qəmə, qüssəyə.

Gördüyümüz kəndli, fəhlə oyandı,
Bizdə olan fəndi, hiyləni qandı.
Allahı da bunlar axırda dandı,
Dini kökündən qoparıb atdılar,
Məscidi minbərnə vurub qatdılar.

Mollanı yoxdursa görən gözləri,
İndi neçin dəvət edir özləri.
Xalq içinə yayma bu cür sözləri,
Tutmadılar, qəm yemə, hörmətmizi,
Özləri çəkdi yenə minnətmizi.

Korsan, həqiqəti görürsən məyər?
Kolxozu insafla düşünsək əyər,
Tərifinə onda bilərsən, dəyər.
Kütlə gözündən utanıb salmasan,
Zurnanı hər yerdə gedib çalmasan.

Kolxoza sədrdir əmoğlum Bəşir,
Mənimlə xəlvətdə o da əlləşir.
Hər yerə çatdıqda salır vay, həşir,
Evimizi, axır ki, bu kolxoz yıxıb,
Var-yoxumuz səlt əlimizdən çıxıb.

A kişi, yanaşma xalqa düşmən kimi,
Asarlar əmmaməni örkən kimi.
Qol-qabırğan sınar kərgədən kimi,
Keçmişə adlanma, o başqa gündü,
Kolxozçular qazdan ayıqdı indi.

Heç insafdı cındırı çıxmış Rza,
Ömründə bir çarıq geyməyib taza.
Bir ay deyil, üzv keçib kolxoza,
İndi navıkat geyinir, boyna bax,
Mollanı da bəyənməyir, oyna bax!

Gör necə erkəksən, ay əclaf kişi,
Mən deyən! Ay pərdələyən keçmişi,
Kim pozacaq bular düzəldən işi?
Zırramasan, çox da keçibdir yaşın,
Siyasət elmindən çıxmayır başın.

Başımda var beş-on nəfər öz tayım,
Yaxın qohumlarım, biboğlum, dayım.
Qırılmışlar az deyil, hansın sayım?
Seçkiyə, hətta seçəcəklər məni,
İndidən eyləyim xətircəm səni.

Düşmə bu xülyaya bu gündən bəri,
Unut o xalqı soyduğun günləri.
Sən kimi sarsaq xərəmöminləri
Tövləyə də qoymayacaqlar, inan,
Get bir iş axtar, özünə gün qazan.

*1937*

## QURBAN BAYRAMI

Bir də görsəydim səni röyadə, qurban bayramı,
Həsrətim qalmazdı bu dünyadə, qurban bayramı!

Həzrəti İbrahimin sənsən ucaldan şöhrətin,
Sən onun artırdın aləmdə cəlalın, dövlətin,
Bir sənə tapşırfdı, getdi, biz müsəlman ümmətin,
Olmuşuq irsən sənə dildadə, qurban bayramı!

Göz önündə keçmişim sınmış təkər tək fırlanır,
Sanki əmrimlə yenə kef məclisim hazırlanır,
Tüstü qalxır, dalbadal, şişlik gəlir, manqal yanır,
Gəzdirir məşuqəm əldə badə, qurban bayramı!

İndi də fikrimdədir, bərk içmişəm, kəlləm dolu,
Məclisimdən qovladım bayram günü bir yoxsulu,
Nə kəbab verdim, nə verdim bir qəpik bayram pulu,
Aclığından başladı fəryadə, qurban bayramı!

Məclisimdə curlarım varlıydı, bəy, xan, büsbütün,
Layiqi yoxdu bizə hər yoxsulun, hər bir lütün,
Yüksəlirdik göylərə çıxdıqca manqaldan tütün,
Fəxr edirdim mən səninlə, adə, qurban bayramı!

İndi neylim çevrilib, dünya dəyişmiş sərbəsər,
Var nə qurbandan, nə şişlikdən, nə manqaldan əsər,
Köhnə adətlər pozuldu, mən qocaldım, müxtəsər,
Düşməyir illərcə əsla yadə, qurban bayramı!

*1938*

## VAY DƏDƏ

Dağıldı getdi, vay, dədə, əcəb, cəlalı mollanın,
Hanı o köhnə hörməti, hanı o halı mollanın?

Alardı dolmanın canın, hücum edərdi ehsana,
Əyərdi dizlərin yerə, vurardı od fisincana,
Şişib dönərdi peysəri yonulmamış dəyirmana,
Bilərdi onda qiymətin bütün əhali mollanın,
Hanı o köhnə hörməti, hanı o halı mollanın?

Görəndə əsrin indiki uşaqların canım yanır,
Böyüklər heç, cəhənnəmə, olarla kim maraqlanır?
Nə bir ədəb bilir bular, nə də böyük-kiçik qanır.
Ağarmasın da, neyləsin, yalı, kübalı mollanın,
Hanı o köhnə hörməti, hanı o halı mollanın?

Hanı o kənddə sürdüyüm zamanlarım, gözəl çağım,
Dükanlarım, dəyirmanım, evim, yerim, beş-on bağım?
Alındı var-yoxum bütün, bilindi hər fırıldağım,
Tamam verildi kolxoza halalca malı mollanın,
Hanı o köhnə hörməti, hanı o halı mollanın?

Azından əlli kolxoza bu illəri soxulmuşam,
Birində bircə yol gedib, bir ay müəllim olmuşam,
Qərəz ki, hansı kolxoza yan almışam, qovulmuşam,
Bəlası bir qutarmadı başı bəlalı mollanın,
Hanı o köhnə hörməti, hanı o halı mollanın?

*1938*

## ATA NƏSİHƏTİ

Oğlum, atanın çıxma sözündən, kor olarsan,
Alverdən uzaqlaşma, inan, dilxor olarsan;
Yüngülcə dolan, bərk işə girmə, yorularsan,
Papros satan oğlum!
Sərxoş yatan oğlum!

Bir yerdə gedib işləməyin indi əbəsdir,
Paprosdan, oçerdən nə qazansan bizə bəsdir.
Min müftə tramvaylara, get tinləri kəsdir;
Papros satan oğlum!
Sərxoş yatan oğlum!

Bildirləri alverlə böyük dövlətə çatdın,
Üç ay qışı hey qənd-çay alıb, xəlvəti satdın.
Hərçənd bir az, cüzi gedib həbsdə yatdın,
Papros satan oğlum!
Sərxoş yatan oğlum!

İndi, a balam, az qalıb on beş yaşın olsun,
Bir min gərək hər gündə sənin daşbaşın olsun,
Alverçi gərək əldən, ayaqdan maşın olsun,
Papros satan oğlum!
Sərxoş yatan oğlum!

Şükr allaha, sandıq dolusu qənd, çayın var,
Arşınmalıdan gündə pasajlarda payın var,
Qəm çəkmə, tutulsan, nədi ki, altı ayın var,
Papros satan oğlum!
Sərxoş yatan oğlum!

Get çayxanaya, iç çayı, çək nəşəni hallan,
Dinc durma, sataş xalqa, tramvaylara sallan,
Tez gir cibə, gördün ki, milis var, yerə tullan.
Papros satan oğlum!
Sərxoş yatan oğlum!

Sən keçmişə baxma, atan onda xozeyindi,
Qalsaydı o mal-dövlətim hərgah, birə-mindi,
Dövlət də gedib, mal da gedib, neynəyim indi?
Papros satan oğlum!
Sərxoş yatan oğlum!
İbrət al atandan,
Mamlımatan oğlum!
Ölsün atan, oğlum!
Sərxoş yatan oğlum!

*1940*

## OĞULUN CAVABI

Məni təhrik eləmə alverə, vicdansız ata!
Qəlbsiz, duyğusuz, anlaqsız ata, şansız ata!

Bir mələkdim mən uşağlıqda sən etdin yaramaz,
Tərbiyən oldu mənə təkcə söyüş, şillə, qapaz!
Acımaq bilməzdin əsla halıma bari bir az,
Küçəyə atdın ədalətsiz ata, qansız ata!
Məni təhrik eləmə alverə, vicdansız ata!

Həyanı, üz suyunu – çünki gərəksizdir – at!
Sən, ölüncə bunu tərk etmə, ucuz al, baha sat!
Adətindir... tutularsansa, gedib həbsdə yat!
İşini tut öz əlində yenə "nöqsansız" ata!
Məni təhrik eləmə alverə, vicdansız ata!

Sən də gir bir işə, əlləş, namusun varsa əyə!
Ölkədə işsiz adam söylə, dəyər indi nəyə?
Düşəcəksən, bunu bil, ən sonu bir gün tələyə!
Onda dərdin olacaq, anla ki, dərmansız, ata!
Məni təhrik eləmə alverə, vicdansız ata!

"Var-yoxum getdi" deyirsən, bu hərisliksə yetər!
Bir məsəldir bu ki, "El ilə gələn, sellə gedər!"
Qəsdin etməksə məni indi özündən də betər –
Başarar, sanma bunu hər qoca, hər cansız ata!
Məni təhrik eləmə alverə, vicdansız ata!

Mən bugündən gedirəm məktəbə, atdım küçəni –
Gəl daha paprosu, qəndi, çiti də, boşla məni!
Milisə tapşıraram öz əlim, ağzımla səni!
Yetişər – etmə imansız məni, imansız ata!
Qəlbsiz, duyğusuz, anlaqsız ata, şansız ata!
Məni təhrik eləmə alverə, vicdansız ata!

*1940*

## SƏNƏ NƏ?!

– Gecə-gündüz içirəm əhli-mazağam, sənə nə?
Mərifətdən, mədəniyyətdən uzağam, sənə nə!

N ə s i h ə t ç i

– A kül olsun gözünə! Oxşama fərsiz dayına,
Baxsana qonşunun oğlu Kərimə – həmtayına!
Sən də get, dərs oxu, düşsün iki min hər ayına,
Xalqımız elmlə, ürfanla gedir çox irəli!
Çünki xulqanlığın heç bir kəsə yoxdur səməri.

A v a r a

– Nə kitab bilirəm ömrümdə, nə dəftər, nə qələm;
Sərf edəm ömrümü boş bir şeyə, əbləh deyiləm,
Ağlın olsun, yeri get xəftədamağam, sənə nə!
Mərifətdən, mədəniyyətdən uzağam, sənə nə!

N ə s i h ə t ç i

– İndi namuslu oğullar çəkilir iş başına,
Hamı kolxozda, zavodlarda dönübdür maşına,
Tarlamız, pambığımız çölləri almış başına;
İşçi, kolxozçu coşur, səyü hünərlə çalışır;
Bunu gördükdə yanır, düşmən içərdən alışır.

A v a r a

– Hansı mey məclisidir, olmayım orda tamada?
İclasa getdiyim heç gəlməyir ömrümdə yada.
Şayəd, işdirsə, çaşıb bir dəfə getsəm arada,
Onda da qaçmağa tez yüngülayağam, sənə nə?
Mərifətdən, mədəniyyətdən uzağam, sənə nə!

N ə s i h ə t ç i

– Bir özün fikr elə, gör, tənbəl adamdan nə çıxar,
Boşla xulqanlığı, axırda bu iş evini yıxar.
Bu bəladan özünü cəhd elə birdibli qutar.
Sən də namusla, şərəflə vətənə xidmət elə,
Aciz olma, bax igid xalqımıza, ibrət elə!

A v a r a

– Çox da aciz deyiləm, parka tərəf bir gecə gəl!
Sən mənim orda igidliyimə qalarsan mətəl.
Piyvə gec gəlsə bizim stola, sallam cəncəl.
"İnturist"də gecələr müftə qonağam, sənə nə!
Mərifətdən, mədəniyyətdən uzağam, sənə nə!

N ə s i h ə t ç i

– Nə nəsihətdən arın var, nə də yalvarmaqdan,
Tövbə et sən mal alıb-satmağı unvermaqdan;
Yorulur gündə milislər səni axtarmaqdan,
İnsan ol, tərk elə bundan sora bu axmaq işi,
Bir qədər də sənə lazımdı sovet pərvərişi.

*1940*

## DƏDƏ, VAY!

Dədə, vay, hey yatıram, bir yuxudan doyammıram,
Bu ağır yatmağımın sirri nədir, duyammıram?

Sanki qızdırmalıyam, baxsan əgər rəngü ruxuma,
Bir putovka götürüb getməli oldum Suxuma,
Gecə olmaz ki, gəlib girməyə Sabir yuxuma,
Çağırır tənəli sözlərlə məni, oyanmıram,
Bu ağır yatmağımın sirri nədir, duyammıram!?

Deyirəm, ey böyük usta, məni salma yadına!
Şuşa şəhrində deyirlər ki, klub var adına,
Belə məlum ki, o layiq deyil istedadına.
Hələ də mən özümə xırda bir ad qoyammıram;
Bu ağır yatmağımın sirri nədir, duyammıram!?

Bu klub bənzəyir, hərçənd, uçulmuş otağa,
Çevrilib qışda inək, yazda qoyun saxlamağa;

Atılıb musiqi alətləri bir künc-bucağa,
Mənə nə, mən ki bu toz-torpağa heç boyanmıram,
Bu ağır yatmağımın sirri nədir, duyammıram!?

Çox adamlar bu klubdan birə-min xeyrə çatır,
Dörd nəfər işçisi var, müftə yeyir, müftə yatır,
Boş adamlar da gəlir axşamacan şeş-beş atır,
Üz ki vardır utanır, heç kəsi qovammıram;
Bu ağır yatmağımın sirri nədir, duyammıram!?

Bilməyirmi bu klub söhbətini raykom özü?
Görməyir səncə, maarifçilərin yoxsa gözü?
Bir də təkrar eləmə, hər yerə çatdın bu sözü.
Danlayıb onların hər gün üzünü yuyammıram!?
Dədə, vay, hey yatıram, bir yuxudan doyammıram!?

*1940*

## HEÇ YOX İMİŞ

Faşistlərin burnun əcəb ovdular,
Qoşunların Moskvadan qovdular.
Şaxtada on minlər ilə dondular,
Çıxdı boşa niyyəti germanların.
Heç yox imiş qeyrəti germanların.

Köhnə şinelçin on adam vururlar,
Kəsdirirlər palanları, dururlar.
Camaatı zorla soyundururlar,
Üryan gəzir milləti germanların,
Heç yox imiş qeyrəti germanların.

Saldatı qorxudan çıxarmır səsin,
Əsir soyuqdan, itirir qüvvəsin.
Əfsərləri geyir qadın yubkasın,
Bəlli oldu qeyrəti germanların,
Çıxdı boşa niyyəti germanların.

Nemeslər cəbhəyə hamı lüt gedir,
Çoxu acından yıxılır, küt gedir...
Paltarından qoşun kimi bit gedir!
Çıxdı boşa niyyəti germanların,
Heç yox imiş qeyrəti germanların.

*1942*

## DƏDƏM VAY!

*Hitlerin dedikləri*

Olmaz mənə bir çarə, işim yaşdı, dədəm vay!
Düşdüm nə yaman dərdə, dilim çaşdı, dədəm vay!

Zənnim bu idi, hərbi cəsarətlə aparram,
Düşmənləri hər yerdə əzib, bağrını yarram,
Rusiyyəni başdan-başa on gündə qutarram,
Məhv oldum özüm, il də yavuqlaşdı, dədəm vay!
Olmaz mənə bir çarə, işim yaşdı, dədəm vay!

Xalqımda dəxi qalmayıb hərb etməyə taqət,
Məngirləyir hər gün məni minlərcə fəlakət.
İndi yığılıb, saziş edib üç iri dövlət,
Dərdim yenə tüğyan elədi, daşdı, dədəm vay!
Olmaz mənə bir çarə, işim yaşdı, dədəm vay!

Dünyada tapılmaz mənə bənzər qanacaqsız,
Bildir qoşunum batdı, qırıldı yanacaqsız.
Sarsaqlığım, bəs nə zaman siz qanacaqsız?
Beynimdə ölüm qurdları oynaşdı, dədəm vay!
Birdən qulağım batdı, yuxum qaçdı, dədəm vay!
Olmaz mənə bir çarə, işim yaşdı, dədəm vay!

*1942*

## QANMADI HİTLER

Heç yerdə bir insan kimi davranmadı Hitler,
Öz səhvini bir anlamadı, qanmadı Hitler.

Ovsarladı, ən xırda hökumətləri mindi,
Onlar da susub qaldı, nə tərpəndi, nə dindi.
Üç dövlətə qarşı niyə aciz qalıb indi?
Dünyada özündən yekəni sanmadı Hitler,
Öz səhvini bir anlamadı, qanmadı Hitler.

Əvvəlcə, coşub loğalanıb, hürdü bu sərsəm,
Rusiyyəni bir ayda plan çəkdi götürrəm.
İndi tüpürür cəmdəyinə büsbütün aləm,
Bir ildə bütün batdı, yenə qanmadı Hitler,
Heç yerdə bir insan kimi davranmadı Hitler.

Üç güclü hökumət salacaqdır səni girdən;
İngiltərə əvvəl sənə bir çəkdi böyürdən.
Şahinləri üstündə süzürlər mini birdən,
Öz nəslini məhv etdi, yenə qanmadı Hitler,
Heç yerdə bir insan kimi davranmadı Hitler.

Sarsaq keçi tək atdı bir az çör-çöpə buynuz,
Saldı hərəkətdən onu üç düyməli toppuz.
Vardır bu məsəl: "Ölməz ilan, görməsə ulduz".
Bir yol bu fəlakət gününə yanmadı Hitler,
Heç yerdə bir insan kimi davranmadı Hitler

*1942*

## NATAMAM OLDU

Kam almadı Hitler, nə yaman təlxkam oldu.
Minlərcə fırıldaq elədi, natamam oldu.

Keçmişdə əgər vardısa Firon ilə Şəddad,
Rəhmət olara, olmamış onlar belə cəllad,
Dünyanı bu əclaf uşağı eylədi bərbad,
İnsanlara hər yerdə məişət həram oldu,
Kam almadı Hitler, nə yaman təlxkam oldu.

Üç dövlət inan sazişə girdikləri gündən
Bir bomba kimi Hitlerə dəymiş ürəyindən;
Zülmün kəsilər şaxəsi tezliklə kökündən,
Bir gün də bu zalım görəcək, sübhü şam oldu,
Kam almadı Hitler, nə yaman təlxkam oldu.

Hər gün döyülür, loğalığından da dayanmır,
Çox yaxşı bilir, sursatı yoxdur, necə qanmır?
Saldat yorulub, güllə çatışmır, heç utanmır,
Əmlakı dağıldı, nə yaman təlxkam oldu...
Minlərcə fırıldaq elədi natamam oldu!

*1942*

## QUDUZ HİTLERƏ

Ey faşist köpəyi, yırtıcı heyvan,
Sənə xalq ordusu udduracaq qan!
Qudurmuş başını saldın kələyə,
Düşəcək quyruğun bizim tələyə.
Ömrünün sonudur, əcəlin çatıb,
Üz üstə çevrilib taleyin yatıb,
İnsan da həddini bu qədər azar?
Qazdın öz əlinlə özünə məzar.
Kiminlə gəlirsən, gör bir üz-üzə?
Ey zülmət köpəyi, hürmə gündüzə!
Sovetlər yurdudur bizim yurdumuz,
Külünü sovurur Qızıl Ordumuz!
Topundan, tankından qorxumuz yoxdur,
O topdan, tüfəngdən bizdə də çoxdur.
Bizim dinc ölkəni çəkərkən hərbə,
Bir zərbənə qarşı etdik min zərbə.
Qudurub hər yerə alovlar saçdın,
Özün öz başına fəlakət açdın.
Hələ harasıdır, ey qarı düşmən,
Xalqımız qəzəblə deyir: biz vətən
Yolunda hazırıq candan keçməyə,

Alçaq faşistləri qırıb biçməyə.
Bizim partiya tək rəhbərimiz var,
Qalalar fəth edən əsgərimiz var,
Leninin bayrağı əlimizdədir,
Qələbə bizdədir, zəfər bizdədir!

*1942*

## BAŞ TUTMADI

Baş tutmadı hitlerçilərin hiyləsi, rəngi;
Gəl indi düşündür bu dəbəng oğlu dəbəngi.

Bir gör bu şərəfsiz nə qədər şişdi, qudurdu,
Çexlərdə gedib bir yekə sallaqxana qurdu.
Onlar da bunun başçısını qorxmadı, vurdu!
Çıxdı canı bir bombada, tərpənmədi əngi,
Gəl indi düşündür bu dəbəng oğlu dəbəngi.

Bilsin bunu, qoy anlasın Hitler kimi naşı,
İşğal olunan ölkələrin torpağı, daşı
Vulkan kimi bir gün coşacaqdır ona qarşı.
Ellər bu qanın yerdə qoyarmı qala rəngi?
Gəl indi düşündür bu dəbəng oğlu dəbəngi.

Hitlerçilərin dilləri var, gözləri kordu,
Qırdırdı nemes xalqını, haqsız yerə yordu,
Bir toy tutacaq onlara axır Qızıl Ordu.
Tarix özü də qeyd edəcək bir belə cəngi,
Baş tutmadı hitlerçilərin hiyləsi, rəngi,
Gəl indi düşündür bu dəbəng oğlu dəbəngi,

*1944*

## PEŞMANAM İNDİ

*Hitler deyir:*

Hərb etməyimə it kimi mən peşmanam indi,
Bildirki qəbahətlərimə düşmanam indi.

Hər yerdə döyürdüm döşümə, lovğalanırdım,
Qarşımda duran düşmənimi körpə sanırdım;
Lakin özümü şir kimi dəhşətli tanırdım,
Qorxaq tulayam, böyrü batıq dovşanam indi,
Hərb etməyimə it kimi mən peşmanam indi.

Son vaxta başım cəmdəyim üstündə oturmur;
Əvvəldəki sürətlə də nəbzim daha vurmur.
Sərkərdələrim gündə qaçır, cəbhədə durmur,
Gör bir nə qədər bişərəfəm, bişanam indi;
Hərb etməyimə it kimi mən peşmanam indi.

Hess qaçdı, başın dustağa girməklə qutardı,
Çünki o zamanlarda bir ümmid yeri vardı;
Öz qaçmağımın fikri mənim bağrımı yardı,
Milyonla nemes xalqına mən düşmanam indi,
Hərb etməyimə it kimi mən peşmanam indi.

*1944*

## HİTLERİN

El tüpürür vicdanına Hitlerin,
Qorxu düşübdür canına Hitlerin.

Boynu uzanmış hacıleylək kimi,
İylənib hər bir yeri cəmdək kimi,
Qarnı şişib un yemiş eşşək kimi,
Bit daraşıb yorğanına Hitlerin,
Qorxu düşübdür canına Hitlerin.

Qapdı lap əvvəldə daşın zorbasın,
Vurub dağıtdılar qol-qabırğasın,
Ölüm yeli tutub qıçın, ombasın,
İt qanı vurulur qanına Hitlerin,
El tüpürür vicdanına Hitlerin.

Zənn eləyir, evində məhbəsdədir,
Əl-ayağı iflic olub, xəstədir,

Bəzi faşistin qulağı səsdədir,
Od vuracaq ehsanına Hitlerin,
El tüpürür vicdanına Hitlerin.

Yaman düşüb Əzrayılın çənginə,
Rəngü ruxu dönüb meyit rənginə,
Yavaş-yavaş ölüm çatıb ənginə,
Adam qoyulmur yanına Hitlerin,
El tüpürür vicdanına Hitlerin.

Bu tülküyə yaman qurublar tələ.
Bu ölməklə qurtarmayır məsələ.
Dayan, görək Berlin alınsın hələ,
Onda baxım tufanına Hitlerin,
El tüpürür vicdanına Hitlerin.

Bizim bu cənnət kimi sakit vətən
Keçdi faşistin əlinə qəflətən,
Gör, necə əclafdı-deyir hər yetən,
Ay tüpürüm vicdanına Hitlerin,
Gəlin baxın tufanına Hitlerin.

*1944*

## HİTLER DEYİR:

Axtarasan bu dünyanı hər tərəf,
Olmaz özümtək hələ bir bişərəf.
Bütün nemes xalqını etdim tələf,
Gör nə qədər bişərəfəm, bişanam,
İt kimi hərb etməyimə peşmanam.

Vururdum əvvəl döşümə bəy kimi,
Lovğalanırdım hacıleylək kimi.
Döyülmüşəm un yemiş eşşək kimi,
Əvvəlindən qanmamışam, heyvanam,
İt kimi hərb etməyimə peşmanam.

Zənn eləyirdim, itidir ülgücüm,
Mən nə bilim, düşmənə batmaz gücüm?
Çıxdı bütün başçılarım nanəcim,
İndi inandıqlarıma düşmanam,
Gör nə qədər bişərəfəm, bişanam.

Pis günümdə yaman qoyuldum lağa,
Qonşularım başlayıblar qaçmağa.
Qoşulmuşam sizin kimi alçağa,
Həm də öz əclaflığıma heyranam.
İt kimi hərb etməyimə peşmanam.

Mussolin də bir az köpəktək hürdü,
Saqqalına bütün dünya tüpürdü.
Sovet bizi yaman sildi, süpürdü,
Qonşularımdan da acam, üryanam,
Gör nə qədər bişərəfəm, bişanam!

*1944*

## EL DEYİR:

Canın çıxsın anlayaydın həddini,
Keçmiyəydin özgənin sərhəddini,
Nə əymisən bic tülkü tək qəddini?
Sənə bu işdə betər olsun gərək.

Çıxdı boşa eylədiyin lovğalıq,
Tullanar, iylənsə başından balıq.
Bomba yağır üstünə min tonnalıq,
Ölkələrin zirzəbər olsun gərək.

Bu günləri görməyirdi kor gözün,
Öz əlinlə xalqını yıxdın özün.
İndi ölürsən, nədir axır sözün?
Vəsiyyətin müxtəsər olsun gərək.

Böylə döyülmüsən, bu azdı hələ,
Bu günlərdə keçər quyruğun ələ.
Sən ölməklə bitməyəcək məsələ,
Qoşunların dərbədər olsun gərək.

*1944*

## İNDİ

Avropada zənn etmə, səyahətdəyəm indi,
Dünya düşünür, mən nə siyasətdəyəm indi.

Gəzməkdə bu Qərb ölkələrin məqsədimiz var,
Aləm bizə nifrət eləyir, etmirik inkar,
Hərb istəyirik, biz deyilik sülhə tərəfdar.
Zahirdə bu yerlərdə sədaqətdəyəm indi,
Dünya düşünür, mən nə siyasətdəyəm indi.

Dollar veririk, qoy təzədən dava uzansın,
Milyonla qırılsın bəşəriyyət, oda yansın.
Tək bir mənim ölkəm bu siyasətdə qazansın.
İnsan qanı tökməklə ticarətdəyəm indi,
Dünya düşünür, mən nə siyasətdəyəm indi.

Olsam da əgər Qərbi komandanlığa təyin,
Zahirdə beş-on alçaq edirsə mənə təhsin.
Batində edir şənimə dünya hamı nifrin.
Min lənətə, hərçənd, ləyaqətdəyəm indi,
Dünya düşünür, mən nə siyasətdəyəm indi.

*1944*

## CEYRANVURANLAR

Ceyranı atıb vurmaq, əgərçi qadağandır,
Ceyran yatağı Mil düzüdür, bir də Muğandır.

Ceyran ovunun aşiqiyəm, çox gözəl ovdur,
Hər kəs ola çöldə, deyər, əntiqə kinodur.
Ceyran qaçır, ardınca maşınlar qovaqovdur,
Bir kimsə soruşmur, bu nə fəryadü fəğandır?
Ceyranı atıb vurma, yasaqdır, qadağandır!

*İt vuruşduran, qoç döyüşdürən*

Mən düşmürəm itbazlığın əsla həvəsindən,
Könlüm açılır həftədə zingilti səsindən.
Xoşdur mənə yüz yol bu bədən tərbiyəsindən,
Qoçlar döyüşür, itlərin əzaları qandır,
Bir kimsə soruşmur, bu nə fəryadü-fəğandır?

*Balıq oğruları*

Dəryaça olub indi Sarayda yekə şorluq,
Salsın Masazır kəndi badımcan, pamadorluq,
Çəkməz sudan ötrü Bakı bundan sora korluq,
Dəryaça balıqlar yetirir, gəl bunu qandır,
Qoy nəsli çoxalsın, onu tutmaq qadağandır!

*1944*

## ELANIMIZI

Aman, ay Kirpi dayı[1], aç, oxu peymanımızı,
Yaz, bütün hər yerə bildir bizim elanımızı.

Biz əza məclisini on gün əzəldən quranıq,
Həmi dərviş, həmi molla, həmi də rövzəxanıq,
Çox da keçmişdəki toy mütrübü, dünbək vuranıq,
Əfv edər bizcə əza sahibi nöqsanımızı,
Yaz, bütün hər yerə bildir bizim elanımızı.

[1] "Kirpi" jurnalına müraciət edilir

Elə ki, gəldi məhərrəm ayı, saqqal qoyuruq,
Xalqı min hiylə ilə ağladıb, aşkar soyuruq.
Qaramal tək yeyib ehsan əti, sanma doyuruq,
Dolduraq, məqsəd odur, gündə cibişdanımızı,
Yaz, bütün hər yerə bildir bizim elanımızı.

Müftəxor molla bizim tək, demə ki, çox azdır,
Hərə bir nəğmə oxur, kefləri bizdən sazdır,
Köhnə quldur, qoçu, ev oğrusudur, quşbazdır.
Saya salmır biri də molla Süleymanımızı,
Yaz, bütün hər yerə bildir bizim elanımızı.

Bir nəfər yoxsul əgər, düşsə sağalmaz azara,
Onu dəfn etməyə bir molla aparmaz məzara,
Üç gecə, pullu öləndə gedirik pəsməzara,
Satırıq biz pula məzhəbmizi, imanımızı,
Yaz, bütün hər yerə bildir bizim elanımızı.

İncidiblər Xilədə molla Cəhalətqulunu,
Oxudublar, keçən illərdə kəsiblər pulunu,
O "yazıq" da bu "məhərrəmdə" düzəldər çulunu.
Gör nə bihörmət ediblər bu müsəlmanımızı,
Yaz, bütün hər yerə bildir bizim elanımızı.

*1944*

## SABİRABAD PİRİNƏ

Kimdir şəkk eləyən Sabirabad möcüzünə?
Gəlməyibdir belə bir möcüzə dünya üzünə!

Bunu inkar edənin zatı düz olmaz, bic olar,
Əqli, idrakını Allah alar əldən, gic olar,
Gözü görməz, qulağı kar, bədəni iflic olar,
Nə qohum-qonşu, nə öz külfəti baxmaz üzünə,
Gəlməyibdir belə bir möcüzə dünya üzünə!

Neçə ildir, yox idi möcüzənin bir əsəri,
Kim gətirdi Bakıya böylə mübarək xəbəri?
Cumdu tez bir neçə arvadla ora molla Pəri,
O piri yaxşı ziyarət eləyib hər üzünə,
Ağanın türbəti-pakin də çəkib üz-gözünə.

Toz basıbmış nə qədər pəncərələr var, şüşəsin.
Beş nəfər molla gedib məscidi açsın, döşəsin,
Şüşələr əks eləyiblər Ərəbistan meşəsin:
Dəvələr, şirü-pərilər tökülüb yer üzünə,
Salavat səsləri çatmışdır imamın özünə,
Dırmanıb huri, mələklər məscidin gümbəzinə,
Gəlməyibdir belə bir möcüzə dünya üzünə.

Molla Soydullaların bilməli "qiymətlərini",
Orda-burda edirik boş yerə qeybətlərini,
Yazmalı səfheyi-tarixə bu xidmətlərini,
Sən də çək, Kirpi dayı, jurnala surətlərini.
Əyrilər əyrini görsün, düzü baxsın düzünə,
Gəlməyibdir belə bir möcüzə dünya üzünə.
Küfrdür şəkk eləmək Sabirabad möcüzünə!..

*1944*

## CAN AVTOBUS

Ey Bakı şəhrində hər tərif şayan avtobus!
Sən ki, gəldin, çıxdı yaddan konka, dilcan, avtobus!

Biz dedik çıxmaz rayonlarda, balam, bir əngəlin,
Yolda incitməz, gecikdirməz, bu xəlqi get-gəlin,
Dübbədüzdür öz idarəndə qurulmuş cədvəlin,
Görsənir yüzlərcə səndə eyb-nöqsan, avtobus!
Ey Bakı şəhrində hər tərifəşayan avtobus!

Haqsızıq, bir də məzəmmət eyləsək nahaq səni,
Nəqliyyat nazirliyi baxır, sanır qıvraq səni,

Göndərir hər bir yana böylə sınıq-salxaq səni,
Ey qalıb yolda saatlarla verən can, avtobus!
Ey Bakı şəhrində hər tərifəşayan avtobus!

Çox maşın vardır, sənin tək az deyil qəm-qüssəsi,
Bəs neçin parkın rəisi dinməyir, çıxmır səsi?
Bunca fəryad eyləyir şəhrin naqorni hissəsi,
Gözləmək.. hey bashabas... min ah-fəğan... avtobus!
Ey Bakı şəhrində hər tərifəşayan avtobus!

Gec gəlir bəzən tramvay, afərin bu sürətə,
Gözləmək indi bizimçin daxil olmuş adətə,
Eylə ki, gəldi sürənlər, başlayırlar söhbətə,
Gözlə ta qeybət bitincə, olma giryan, avtobus!
Ey Bakı şəhrində hər tərifəşayan avtobus!

Taksidə şoferdir indi qonşumuz Əbdülqədir,
Altı ay anbardar olmuş, yeddi ay da briqadir.
Beş verəndə, əlli metrə sımsığı yerdən gedir,
"Çox sağ ol" da söyləməz versən də milyon, avtobus!
Ey Bakı şəhrində hər tərifəşayan avtobus!

*1944*

## FIRILDAQÇI QALIBDIR

Dərvişlərimiz keçmişə nisbət azalıbdır,
Tən yarı gedib rəhmətə, yerdə nə qalıbdır?

Dərvişsiz olan məmləkətin şöhrəti olmaz,
Dünyası cəhənnəmlik olar, cənnəti olmaz.
Kövsər suyu üqbadə onun qisməti olmaz,
Dərvişlər ilə qiyməti "Şərq"in ucalıbdır,
Tən yarı gedib rəhmətə, yerdə nə qalıbdır?

Bir çarə deyirlər, buna Kirpi özü qılsın,
İclas eləsin, qoy bu camaat da yığılsın.

Məktəblər açılsın, yeni kadro yaradılsın,
Təcili gərək, dərviş Ələkbər qocalıbdır,
Dərvişlərimiz keçmişə nisbət azalıbdır.

Dərvişlik edir bir neçə dünbəkvuran indi,
Toyxanalara olsa kənardan baxan indi,
Guya ki, gəlib məscidə bir rövzəxan indi,
Bilmir neçə əşar oxuyubdur, nə çalıbdır,
Dərvişlərimiz keçmişə nisbət azalıbdır.

Dərviş gərək əvvəlcə ilan oynadan olsun,
Kəndi, obanı gipnoz edib aldadan olsun.
Yüzlərcə yalan satsın, adam ağladan olsun,
Bir bilməsin heç kəs nə satıbdır, nə alıbdır.
Dərvişlərimiz keçmişə nisbət azalıbdır.

Keçmişdə Muğanlı var idi, Əlqulu vardı,
Çiynində əba, əldə qızıl kəşkülü vardı.
Qarnın otaran molla deyildi, pulu vardı,
Dünyanın elə ləzzəti onlarla qurtardı,
Onlar çürüyüb, yarpağı çoxdan saralıbdır,
Mikrobları indi cücərib rişə salıbdır,
Tən yarı gedib rəhmətə, yerdə nə qalıbdır?
Dərvişlərimiz keçmişə nisbət azalıbdır.

*1944*

## QOŞULUB MOLLA HƏSƏN BİR KEŞİŞƏ

Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə,
Qoşulub molla Həsən saqqalı top bir keşişə.

İki mal kəlləsini kim buraxıb bir qazana?
Birisi zəngin əsiri, biri mayil azana.
İstəyirlər bu fırıldaqla olar pul qazana.
Afərinlər belə bir dostluğa, əlbir gedişə,
Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə!

Peyki gördükdə keşiş göydə inanmır tarıya,
İstəmir molla da əmmamə qoyub ağ sarıya.
Belə dinsizliyi bunlar buraxıblar araya
Ki, qoyublar qocaman Allahı da sərzənişə,
Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə!

Zorba bir əmr yazıblar neçə min rövzəxana,
Canına qəsd eləyib, tövlədə xəncər vurana.
Bunların hamını tök zənbilə göndər oyana
Ki, gedib harda əvam varsa ora tez yetişə,
Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə!

Aşnayam molla Fətişlə mən özüm hər üzünə,
İkicə onluq alır bir ölünün hər cüzünə.
Keflənirkən tüpürür falçıların möcüzünə,
Söz deyirsən yenə çatmır qəmiş oğlu qəmişə,
Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə!

Mollalıqda böyük hörmət qazanıb Məşdi Hadı,
Yasini tərsə oxur, çünki boyatdır savadı,
Yayılıbdır kişinin hər yerə şöhrətlə adı,
Məclis heyrətdə qalır onda olan tərpənişə,
Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə!

Bir əfəndi törənib indi deyirlər Qalada,
Mollalıq bir yana qalsın, baxır hər gün fala da,
Qoymayıb müştəri-zad falçı Tükəzban xalada,
Qorxuram molla Həcər də bu kəməndə ilişə,
Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə!

*1944*

## QIŞA HAZIRLIQ

Keçən il bir gəmi təmirə gəlibdir zavoda,
Düşməyibdir hələ də bir ilin ərzində “xod”a.
Altımış birdə, güman var, düzələ “novı qoda”
Yazığın yelkəni də yox ki, küləklə vuruşa,
Belə hazırlıq olarmı, ay aman, indi qışa?

Bayılın neft verən mədəni, düzdür, çoxdur,
Fərli-başlı ora ki getməyə bir yol yoxdur.
Qış gəlir qarlı nəfəslə, elə bil ki, oxdur.
Kim ola donduracaq, baxmaz o, dosta, tanışa,
Belə hazırlıq olarmı, ay aman, indi qışa?

Bizə ət kombinatından belə bir ərzə gəlib
Ki, soyuqdan üşüyən mal-qaralar qeyzə gəlib.
Bu xəbərdən, görəsən, rəisə heç lərzə gəlib?
Bir adam göndər ora, Kirpi, bizimlə danışa,
Belə hazırlıq olarmı, ay aman, indi qışa?

Zavodun zahirinin bər-bəzəyin soxma gözə,
Sexlərin daxili qış vaxtı dönür lap dənizə.
Sel basır damları, palçıq çıxır hər yerdə dizə,
Neçə dəzgah sinəsi olmuş hədəf qar, yağışa,
Belə hazırlıq olarmı, ay aman, indi qışa?

*1944*

## BƏZİ TİCARƏT İŞÇİLƏRİNƏ

Hər kəs mağazinlərdə ki xidmətdədir, oğlum,
Beş gün onların canları rahətdədir, oğlum!

Alverdə adam var ki, onun öz başı vardır,
Yığmış başına hər nə qohum-qardaşı vardır,
Minlərcə hər ayda kişinin daşbaşı vardır,
Vecsiz bir adam gör nə səadətdədir, oğlum!

Vardır birisi, indi bu sistemdə rəisdir,
Qaçmış neçə yerdən, görüb orda işi pisdir.
Dövlət malına gözləri olduqca hərisdir,
Pul-pul ki deyirlər, o, – ticarətdədir, oğlum!

Pudlarla alıb xırda çörək bəzi şatırlar,
Bir az-maz onun böyrünə ağ un da qatırlar,

Bəzən bişirirlər, onu xəlvətcə satırlar,
Gör indi çörəkxana nə halətdədir, oğlum!

Az-maz tanışıq biz də belə “alver” işiylə,
Faktura rəisin verilir göstərişiylə.
Çoxdur bu sayaq müştəriyə işlədən hiylə,
Bax onlara, sən gör nə xəcalətdədir, oğlum!

Gəzsən mağazinlərdə bular kimləri çoxdur,
Bir xeyli müəllim, hələ var bir neçə doktor.
Zənn etmə, bunun axırı bir əngəli yoxdur,
Hər kim ki bu sistemdə “şərafətdədir”, oğlum,
Bir gün görəcəksən ki, qiyamətdədir, oğlum!

*1960*

## ƏNTİQƏ OTAQ

Mən ölüm, gəl bizə bir dəfə qonaq, Kirpi dayı!
Almışıq bir təzə, əntiqə otaq, Kirpi dayı!

Şəxsi evlərdən axırda canımız qurtardı,
Kirayə üstündə böyük mərəkələrmiz vardı,
Xozeyindən də yaman arvadı bədrəftardı,
Toxuyurdu bizə hər gün badalaq, Kirpi dayı!
Mən ölüm, gəl bizə bir dəfə qonaq, Kirpi dayı!

Biz yeni ev alanı düz iki aydan çoxdur,
İndi mənzil cəhətindən gözümüz lap toxdur.
Amma, əfsus... burada eylə rahatlıq yoxdur.
Düzü heç gözləməyirdik bu sayaq, Kirpi dayı!
Mən ölüm, gəl bizə bir dəfə qonaq, Kirpi dayı!

Otağın iç qatı dönmüş bir uçulmuş hasara,
Dam-baca damcılayır, nəm yeriyir daş-divara,
Yerə baxsan – iki barmaq açıb hər taxta ara,
Qapılar, pəncərələr üzdən iraq, Kirpi dayı!
Mən ölüm, gəl bizə bir dəfə qonaq, Kirpi dayı!

Sudan ötrü gəzirik evləri yüz metrə ilə,
Sanki dərman içirik damcı ilə, qətrə ilə,
Qonşulardan alırıq çox kərə borc litrə ilə,
Sən də gəlsən bizə, qəlbin yanacaq, Kirpi dayı!
Mən ölüm, gəl bizə bir dəfə qonaq, Kirpi dayı!

*1960*

## GƏLDİ MƏHƏRRƏM AYI

Gəldi məhərrəm ayı,
Molla fırıldaq dayı!

Qoşul rövzəxanlara,
Köhnə müsəlmanlara,
Gündə get ehsanlara,
Ol hər yerdə sərpayı,
Molla fırıldaq dayı!

Yanla molla Qəvamı,
Tovla beş-on avamı,
Qətlə yetir imamı,
Özün də Şümrün tayı,
Molla fırıldaq dayı!

Batma qəmə, qüssəyə,
Bax Qumriyə, Qüdsiyə,
Oğra beş-on mərsiyə,
Məclisə sal ah-vayı,
Molla fırıldaq dayı!

Toyda oxu saz ilə,
Məsciddə avaz ilə,
Mərsiyə de naz ilə,
Ye bozbaşı, iç çayı,
Molla fırıldaq dayı!

Binadan dolaşıqsan,
Nə molla, nə aşıqsan,
Hər qazanda qaşıqsan,
Bicliyinin yox sayı,
Molla fırıldaq dayı!

Bir "molla"san savadsız,
Məsləksiz, etiqadsız.
Şansız, şərəfsiz, adsız,
Hərcayısan, hərcayı,
Molla fırıldaq dayı!

*1960*

## QIZDI, YA OĞLANDI BU?

Gör necə bir modabaz oğlandı bu,
Sanmayınız cindi, ya şeytandı bu.

Qaşları əyri, qara buynuz kimi,
Bığları qırxıqdı fransız kimi,
Kofta geyib, naz eləyən qız kimi,
Canlar alan qızlara qurbandı bu,
Gör necə bir modabaz oğlandı bu.

Pudralanıb üz-gözü undan da ağ,
Əyri qoyub beretkanı qızsayaq.
Sağrısı enli, şalvarı dar balaq.
Hansı tərəfdəndi, hayandandı bu?
Gör necə bir modabaz oğlandı bu.

Nə işə var meyli, nə məktəb sarı,
Müftə yeyib gəzir bağı, bulvarı.
Bəs kim alır buna bu pal-paltarı?
Sənətə, elmə niyə düşməndi bu?
Gör necə bir modabaz oğlandı bu.

Rəqsdə maildir amerikanlıya,
Oxşamayır azərbaycanlıya.
Heç kəsə yox dəxli, onu danlıya,
Gər deyən olsa ki, xuliqandı bu,
İnanmarıq biz ona, böhtandı bu,
Gör necə bir modabaz oğlandı bu.

*1960*

## CAN SAĞLIĞI

Yaxşı bil, ay kişi, cansağlığının qiymətini,
Yeyib-iç, çəkmə qohum-qardaşının minnətini,

Bax, fərəhlən bu qədəh qaldıran oğlanlarına,
Mum günündə bular hər yerdə yetərlər karına.
Gündə sağlığına içirlər, barı şükr et tarına,
Fövt qılma belə keyf aləminin fürsətini,
Yeyib-iç, çəkmə qohum-qardaşının minnətini.

İndi dörd bir tərəfdən buruğun fantan atır,
Kiçik oğlun mağazinlərdə araq, pivə satır.
Biri bəzzaz malını metrəyə üç sant uzadır,
Biri zavmaq, o da yağ, pendirə şey-mey də qatır.
Gör bu fəxr etdiyin oğlanlarının qeyrətini,
Vətənə, xalqa "sədaqətlə" olan xidmətini.

Sən sovet tərbiyəsin yaxşıca görsəydin özün,
Tez görərdi belə nöqsanları hər yerdə gözün.
İndi varmı bu suala elə layiqli sözün?
Düşünürsənmi, sənə yağdırır el nifrətini,
Yeyib-iç, çəkmə qohum-qardaşının minnətini.

*1960*

## XƏBƏR VAR

Eyb açmağa, ay Kirpi dayı, səndə hünər var,
Qoy mən də yazım, gör nə qədər tazə xəbər var!

Uprovdomu yazsam, deyəcəksən, onu yazma.
Ev damsa, cəhənnəm, uçulur balkonu, yazma,
"Bakqaz"la sudan yaz, işığı, telfonu yazma,
Yüz yol yazılıb, bir də yenə eyləmə təkrar,
Ver izn yazım, gör nə qədər məndə xəbər var...

Vardır hələ nöqsanlı cəhət çox mağazində,
Yaz işçilərin, qorxma, müdirin lap özün də,
Yaz, qənd tozunun un da satırlar əvəzində.
Qəlbirləyən olsa, çıxacaq batmana xalvar,
Ver izn yazım, gör nə qədər məndə xəbər var...

Bir kimsə tramvayların heç qeydinə qalmır,
Parkın da müdiri bu işi sahmana salmır,
Vardır çox adam pul verir, amma bilet almır,
Olmazmı bu sirrin səbəbin eyləmək aşkar?
Ver izn yazım, gör nə qədər məndə xəbər var...

Dəlləkləri də bilmə elə biqanacaqdır,
Onluq verənin tez başına fırlanacaqdır,
Beşlik ki görür, qaşqabağı sallanacaqdır,
Saç-saqqalı qırxdıqca olur müştəri idbar,
Ver izn yazım, gör nə qədər məndə xəbər var...

*1960*

## FƏRSİZ OĞUL

Lap gətirdin məni, ay fərsiz oğul, təngə, zara,
Bir təhər dürt özünü sən də bu kolxozbazara.

Qonşumuz Əkbərə bir bax, yaşın ondan çoxdur,
Kök satır gündə bazarda, elə bil bir oxdur.
Kaş olaydın bu zirəklikdə, yarıncan yoxdur,
Mollalar tək o, gülab-zad da satır pəsməzara,
Bir təhər dürt özünü sən də bu kolxozbazara.

Əsil alverçi bizim molla Sonanın əridir,
Dələduz, oğru uşaqlar da ona müştəridir.
Hər bazarda yeri vardır, neçə ildən bəridir,
Bir gün alverdən uzaqlaşsa, düşər min azara,
Bir təhər dürt özünü sən də bu kolxozbazara.

Məktəbə, elmə mənim tək həvəsin yoxdur, oğul,
Get pasajda rayon alverçilərilə şərik ol,
Gecə-gündüz kefə bax, hörməti hörmət, pulu pul.
Nə xəcalət, nə üzün kütlə yanında qızara,
Bir təhər dürt özünü sən də bu kolxozbazara.

Qorxma, çox iç arağı, çünki düzəldər başını,
Xalqı aldat pulun al, içkiyə ver daşbaşını.
Sonra vurənginə, bir tində uzat yoldaşını,
Sən gedib həbsdə keflən, o da getsin məzara,
Bir təhər dürt özünü sən də bu kolxozbazara.

*1960*

## POÇTALYONUN ŞİKAYƏTİ

Ay Kirpi, mənim dərdimi yaz fürsət olanda,
Poçtalyonu da al nəzərə növbət olanda.

Məktubları, jurnal, qəzeti kənddə, şəhərdə
Mən paylayıram çox evə beşmərtəbələrdə.
Öz işlədiyim yerdə tutulmur bu nəzərdə,
Hər kəs sevinər zəhmətinə qiymət olanda,
Poçtalyonu da al nəzərə növbət olanda.

Keçmişdə də çox yük daşınıb at, qazalaqla,
Carçı dolanardı şəhəri axsaq ulaqla,
Onlar çox əziyyətdə olublar bu sayaqla,
İndi minirəm mən maşına qismət olanda,
Poçtalyonu da al nəzərə növbət olanda.

Poçtalyona bir yaxşı, rahat yer gərək olsun,
Sürətlə gedən saz motoroller gərək olsun,
Poçtalyon olan kəs özü şofer gərək olsun.
Nazirliyə bildir bunu sən söhbət olanda,
Poçtalyonu da al nəzərə növbət olanda.

*1960*

## EHSAN AŞİQİ

İndi ölənin, Kirpi dayı, hörməti yoxdur,
Ehsansız olan məclisin heç ləzzəti yoxdur.

Keçmişki gözəl adətimiz tərk olub indi,
Molla, seyidin hörməti onda birə-mindi.
Lap indikilər mollaların boynuna mindi,
Şərən bu biabırçılığın nisbəti yoxdur,
Ehsansız olan məclisin heç ləzzəti yoxdur.

Ehsan ölünün ruhu üçün bir yaraşıqdır,
Yüzlərlə ona müftə yeyən molla aşıqdır,
Çoxdur eləsi saqqalı yağdan bulaşıqdır,
Tərpənməyə heyvancığazın taqəti yoxdur,
Ehsansız olan məclisin heç ləzzəti yoxdur.

Var molla, gedir alverə kolxoz bazarında,
Axşamlar ölən kimsələrin pəsməzarında,
Ömrün çürüdüb müftə yemək intizarında,
Qarnın otarır, bir kişidən minnəti yoxdur,
Ehsansız olan məclisin heç ləzzəti yoxdur.

*1960*

## TƏMİR EDƏN OLSA

Zəhləm gedir, ay Kirpi, qaranlıq gecələrdən,
Gəl bir gecə keç sən də bu bərbad küçələrdən.

Azdır, demə çirkin küçə, saysan yüzəcəndir,
Lap raysovetin olduğu yerdən bizəcəndir.
Yağmurda bizim məhlədə palçıq dizəcəndir,
Gəl bir nəzər et, burdakı çirkab, selə qardaş!
Çəkdir bu yerin şəklini, tənqid elə, qardaş!

Pul sərf eləyirlər, düzü zəhmət də çəkirlər,
Asfalt küçənin üstünə asfaltı tökürlər,
Bir həftə keçir, bir də görürsən ki, sökürlər,
Vardır küçələr heç qəti asfaltı da yoxdur,
Saymaq nə gərəkdir, belə faktlar hələ çoxdur.

Göyçək Bakı tənqid oluna, indi nahaqdır,
Hərgiz demək olmaz, mədəniyyətdən uzaqdır,
Düzdür, yuxarı məhlələri köhnəsayaqdır,
Tezliklə bu nöqsanlara tədbir edən olsa,
Bərbad küçə qalmaz, onu təmir edən olsa!

*1961*

## TƏZƏ ÇIXAN MOLLALARA

Bəsdir bu fırıldaqların, ay bədyəxan oğlan,
Son ver bu həyasızlığa, bir yol utan, oğlan!

Aç bir gözünü, əsri düşün, gör nə zamandır,
Keçmişki deyil, indikilər dövrü qanandır.
Sən də başını elmlə, sənətlə dolandır,
Ey məsləki pul düşkünü, abrın satan oğlan,
Bəsdir bu fırıldaqların, ay bədyəxan oğlan!

Keçmişləri mövhum ilə kimlər bürümüşlər?
Din noxtasına bağlayıb hər yan sürümüşlər.
Onlardan əsər qalmayıb, indi çürümüşlər.
Elm ilə ayılmış o min ildən yatan, oğlan,
Bəsdir bu fırıldaqların, ay bədyəxan oğlan!

Peykim dolaşır göyləri bir nurlu qəmər tək,
Tutmuş Günəşin dairəsin canlı kəmər tək,
Zülmət gecənin sirri işıqlandı səhər tək.
Ecazına peykin baş əyir kəhkəşan, oğlan,
Bəsdir bu fırıldaqların, ay bədyəxan oğlan!

Dərvişliyə var puldan ötrür meylin əgərçi,
Yalvarma, inanmaz sənə bir fəhlə, əkinçi,
Boş gəzmə, bir iş tap özünə, olma dilənçi,
Ver arxanı bir zəhmətə, rahət dolan, oğlan,
Bəsdir bu fırıldaqların, ay bədyəxan oğlan!

*1961*

## TƏNQİDİMİZ SABİRANƏDİR

Tənqidə eşqi var, qələmim mahiranədir,
Hər söz ki yazdı, baməzədir, Sabiranədir!

Baxmaz yalançı nasirə, ya lovğa şairə,
Sevməz vəzifə, rütbə, yalaqlıq, nə xatirə.
Qorxmaz çıxardar eybini kim olsa zahirə,
Şerə yamaq vuranlara bir taziyanədir,
Tənqidimiz bu kimsələrə Sabiranədir!

Var bəzi şair, indi də əşara nabələd,
Fərq etsə də əruzu hecadan qələt-qələt,
Hər yerdə göstərər özünü "əhli-mərifət".
Bu "təb" ilə sanır ki, "ədibi-zamanə"dir,
Tənqidimiz bu kimsələrə Sabiranədir!

Var bəziləri ki, düz yaza bilmir öz adını,
Bir şer söyləyəndə qırır qol-qanadını,
Diplomda "ali" zənn eləyirsə savadını,
Əslində bunlar elmü sənətdə miyanədir,
Tənqidimiz bu kimsələrə Sabiranədir!

*1962*

## VAR ELƏ OĞLAN Kİ...

Kirpi dayı, hər dəfə keçməz belə,
Öz gələcək günlərini fikr elə,
Jurnala az yaz, bizi tənqid elə.
Biz demirik, tənqidin irad deyil,
Ya bizə təsir eyləyən zad deyil.

Var elə "oğlan" yetişib qırx beşə,
İndiyəcən kəsb eləmir bir peşə,
Müftə yeyir, getməyir tənbəl işə,
Sənətə, elmə əyilən zad deyil,
Tərbiyəsizdir, qanan övlad deyil.

Bir neçəsin danlayıram, – Ay bala,
Budkada telfonları az qurdala.
Pul salıram, bir də qayıtmır dala,
Avtomata, sən demə, bir zad deyil,
Ya onu icad edən ustad deyil.

İndi nəzakətdən açaq söhbəti,
Bəzi cavanlardan edək qeybəti,
Eyləməyirlər qocaya hörməti.
Ədəb və hörmət ki ayıb, zad deyil,
Şəninə layiqsiz olan ad deyil.

Bax qocadan nifrət edən oğlana,
Gördü məni, tutdu üzün tez yana.
Açdı tramvayda qiraətxana.
Guya ki, o, elmi sevir, yad deyil,
Yaxşı görür gözləri, kor-zad deyil.

*1962*

## ÖZÜN ÖL!

Vermə ölmək xəbərin xalqa yalandan, özün öl!
Ölməyib sağdır o sən sevməyən insan, özün öl!

Şaiyə yaymaq ilə hörmətin artmaz, bunu bil!
Qəlbi bədniyyət olan məqsədə çatmaz, bunu bil!
Hər cür uydurma, yalan kimsəyə batmaz, bunu bil!
Pak qılammaz belə murdarlığı ümman, özün öl!

Sevinirsən yenə qarşında orucluq ayı var,
Qurduğun felə uyan bəzi müsəlman dayı var,
Hələ molla-seyidin iftar-obaşdan payı var,
Dolacaq boşqabına sirkə-badımcan, özün öl!

Gah olursan bibiheybətli, gahı maştağalı,
Yoxsa ehsanda bu il az yemisən şorqoğalı?
Ya burax mollalığı, get toya çaldır qavalı,
Söylə dost-aşnaya meyxanada hədyan, özün öl!

Varlı ehsanına getsən kök olar onda dəmin,
Kasıba getməyəcəksən, gər ola doğma əmin,
Vay o mərhuma ki, lap az ola həqqül-qədəmin,
Deyinirsən ki, ölüb kənddə lüt-üryan, özün öl!

Xalqa can sağlığı istə, bir utan, bax yaşına,
Çox hərissən, bilirik, müftəcə ehsan aşına.
Bədniyabətliyin, axır gələcək öz başına,
Durmusan növbəyə əvvəlcə bu başdan, özün öl!

İndiki nəsil, inan, köhnəni qatmaz təzəyə,
El gərək heykəli-mənhusunu hər rəng bəzəyə,
Qoyacaq ibrət üçün nəhs vücudun muzeyə,
Deyəcək cəmdəyinə "saxta rövzəxan", özün öl!
O zaman qaçmağa olmaz sənə imkan, özün öl!

*1963*

## AL QƏLƏMƏ

"Yoxdur eybim, – desə hər kim, – məni tənqid eləmə",
Baxma, bic tülküdür, ay Kirpi dayı, al qələmə.

Bəzi aşxananı tənqid elə əvvəl başdan,
Elə sanc iynələrin ox kimi keçsin daşdan.
Müştəri razı qala istəsə aşpaz aşdan –
Qatmasın yarma ilə kartofu o şor kələmə,
Kim ki, tənqidinə layiqdir, onu al qələmə.

Yeni çayxanalar olmuş mədəniyyət ocağı,
Yuyulub nəlbəki-iskan, silinib qab-qacağı,
Gül-çiçəklə bəzənib hər tərəfi, hər bucağı...
Kül tökür güldana leyk bir para əhli-zələmə,
Kim ki, tənqidinə layiqdir, onu al qələmə.

Hər səhər süd satan arvadları çək imtahana,
Pul verir müştəri, "izdaç" da qayıtmır bu yana.
Qaynayan vaxtda o süd diqqətilə bax qazana,
Gahi pendir suyudur, gahi qatıq, gah dələmə,
Kim ki, tənqidinə layiqdir, onu al qələmə.

Cibkəsənlər, görünür indi yanar bir od olub,
Mollalar tək buların da bazarı lap xod olub,
"Paçkabasmaq" azalıb, palto aparmaq mod olub...
Gec-tez axır bu siçanlar düşəcəklər tələmə,
Kim ki, tənqidinə layiqdir, onu al qələmə.

*1963*

## CİBİŞDAN AYI

Gəldi çün-mahi-məhərrəm, bu müsəlman ayıdır,
Müftəxor mollaların hər gecə ehsan ayıdır.

Sanma sən mollalığı "pak, müqəddəs" sənət!
Görməyirsənmi sənə etmədə aləm nifrət?
Nə qədər yağsa da gər üstünə hər gün nifrət,
Xalqı aldat, pulunu al, ye, cibişdan ayıdır!
Müftəxor mollaların hər gecə ehsan ayıdır.

Toyda meyxana deyən, ehsana get mollalığa,
Bəzi məclisdə aşıqlar tək atıl ortalığa,
Dərviş ol, tut bir əsa əldə, bürün arxalığa,
Get də kəndlərdə oxu, molla Süleyman ayıdır,
Müftəxor mollaların hər gecə ehsan ayıdır.

Xalq ayıqdır, hədər etmə gecə-gündüzlərini,
Hansı bir əsrdəsən, aç bir o kor gözlərini,
Oxuma gənclər üçün lağlağı boş sözlərini...
Ölkəmizdə yeni ildir, yeni dövran ayıdır,
Demə ki, mollaların hər gecə ehsan ayıdır.

Xeyli vaxtdır ki, uyubsan bu fırıldaq sənətə,
Etdiyin fitnə-fəsad sığmaz, inan, yüz qəzetə.
Gün gələr, cümlənizi xalq atar bir səbətə,
Saf-çürük bəlli olar, haqq ilə mizan ayıdır,
Demə ki, mollaların hər gecə ehsan ayıdır.

*1963*

## YENƏ TƏSİR ELƏMİR...

Sirkdə çox tərbiyəni verir bil insan ayıya,
Yenə təsir eləmir molla Məhərrəm dayıya!

Qızışıb mahi-əza mömün olan hər yerdə,
Kef üçün pul qazanır mollanüma minbərdə.
Yerdə şiə çəkir ah-nalə, mələk göylərdə,
Yolu yoxdur bu əza məclisinin hərcayıya,
Yenə təsir eləmir molla Məhərrəm dayıya!

Ayılıb aləm,  a molla, sən ayılma, hələ yat,
Ula bayquştək, avam gördün, onu tez ağlat.
Bəsdir, oynatdı bizi "təntəneyi-mövhumat"!
Bir utan, nifrət edir xalq bütün bihəyaya,
Yenə təsir eləmir molla Məhərrəm dayıya!

Gör nə asanlaşıb insanlar üçün elmi-nücum,
Eyləyirlər kişilər indi də göylərə hücum.
Sən də dərvişlik elə, hər gecə ehsanlara cum,
Dilənib yığdığının yarsını ver sərpayıya,
Yenə təsir eləmir molla Məhərrəm dayıya!

Tanıyıb bilməlidir xalqımız, əlbəttə, səni,
Niyyətindir eləyən yolçu təbiətdə səni,
Nə şəhərmizdə sevən var, nə də bir kənddə səni,
Qovlayırlar o saat kölgəsi düşcək qapıya.
Yenə təsir eləmir molla Məhərrəm dayıya!

*1963*

## EHSANLARIMIZ

Səndən, ay Kirpi dayı, var yeni bir xahişimiz
Sən əgər mərhəmət etsən, düzələr hər işimiz.

Yaz bu elanımı bilsin cavan oğlanlarımız,
Təzədən eşqə düşüb köhnə müsəlmanlarımız.
İndi var keçmişə nisbət gözəl ehsanlarımız,
Nə qədər mollamız artıb, nə qədər dərvişimiz,
Sən əgər mərhəmət etsən, düzələr hər işimiz.

Hərə almış əlinə bir dənə yasin, çərəkə,
Oxuyur şuri-plovla səsi qalxıb fələkə.
Ölənin ruhunu cənnətdə qoşurlar mələkə,
Olmamışdır bu şərafətdə bizim keçmişimiz,
Sən əgər mərhəmət etsən, düzələr hər işimiz.

Yenilikdən danışırsan, görürük bir parası,
Özünün bir tikə yoxdur yeniliklə arası,
Eləmişdir Bakını mərsiyəxan fabrikası,
Bəllidir, məncə, bu gün hər kəsə əzvayişimiz,
Sən əgər mərhəmət etsən, düzələr hər işimiz.

Baxıb indi görürük bir neçə dümbək vuranı,
Üləmadan sayılır, şəhrin olub rövzəxanı,
Aldadır xalqı, beş-on xətt edib əzbər Quranı,
Buna da razı deyildir yüzə bir yetmişimiz,
Sən əgər mərhəmət etsən, düzələr hər işimiz.

*1964*

## SAVADSIZ XANƏNDƏLƏRƏ

Xanəndəsən, oğlan, avazın yaxşı avazdır,
Hərçənd ki, elmin, biliyin bir qədər azdır.

Eylə özünə incəsənət karını peşə,
Çal musiqinin böyrünə min zərb ilə tişə.
Şerin, qəzəlin qol-qanadın sındır həmişə,
Dəryada üzüb, anlama, dərin ya dayazdır.
Xanəndəsən, oğlan, avazın yaxşı avazdır!

“Gənc” kəlməsini “kənc” oxu, “qəm” kəlməsini “xəm”,
“Əqd” isə onu “üqd” oxu, “səlm” isə “səəlləm”
Ya “mütrübü” “mətrüb” oxu, “dum” kəlməsini “dəm”,
Mənasını qanma, bu nə tardır, bu nə sazdır,
Xanəndəsən, oğlan, avazın yaxşı avazdır!

Göstər özünü elmli, hər yerdə xoruzlan,
Salmaz bu qəbahət səni, qəm çəkmə nufuzdan.
Cəh-cəhlə hecanı oxu, fərq etmə əruzdan,
Kimdir düşünən ya bu “Segah”dır, bu “Hecaz”dır,
Xanəndəsən, oğlan, avazın yaxşı avazdır!

Öz qədrini bil, indi ki hər yerdə adın var,
Söz sormağa, öyrənməyə çoxdan inadın var.
Nə elmi düşüncən, nə bir orta savadın var,
Zənn etmə qananlar səni səndən natarazdır,
Xanəndəsən, oğlan, avazın yaxşı avazdır!

Ey börkü göz üstündə, trubkan damağında,
Gündüz-gecə keyfində, çalıb oynamağında.
Şalyapin əgər gəlsə, dayanmaz qabağında.
Fikr eyləmə, bundan belə keyfin daha sazdır,
Xanəndəsən, oğlan, avazın yaxşı avazdır!

Xanəndəliyin hörməti var, yaxşı sənətdir,
Xalqa, səni bil, sevdirən ancaq bu cəhətdir.
Hər söz oxusan, anlama, düzdür, ya qələtdir,
Ver ərzə, bu gündən özünü radioya yazdır,
Xanəndəsən, oğlan, avazın yaxşı avazdır!

*1964*

## MOLLAXANA

Köhnə dostumla gözəl bir gündə,
Görüşərkən mayın on dördündə
"Çox təəccüb, – dedi, – bir böylə zaman,
Laübali keçirirsən güzəran.
Bax bir həmtaylarına, ibrət elə,
Bir işin ardına düş, hümmət elə.
Hamının sənəti, elmi, hünəri,
Oxunur kənddə, şəhərdə əsəri.
Sən də onlar kimi bir şairsən,
Yenə az-çox bu işə mahirsən.
Oxunur hər gecə hər yerdə sözün,
Özünü gör necə məhv etdin özün,
Gəl bu işsizliyi at, əsrə yanaş,
İndi aləm dəyişibdir başabaş;
Əl-ələ ver yeni şairlər ilə,
Yaz, yeni şerlər icad eylə".
" – Xəbərin yox, – dedim, – əhvalımdan,
Büsbütün tərcümeyi-halımdan.
Əvvələn, dövrümü, tariximi bil,
Sonra varsa yeri, aç töhmətə dil.
Bakı şəhrində doğuldum anadan,
Keçmədi bir elə müddət aradan.
Atam öldü, mənim artdı kədərim,
Yoxdu heç şeydən, uşaqdım, xəbərim.
Qaldım avara, səfil, özbaşına,
Elə ki çatdım on-on bir yaşına,
Məktəbə, sənətə artdı həvəsim,
Kimsəsizdim, yox idi dadrəsim.
Möhnətim çox, qəmim ondan artıq,
Baxıram dövrəmə yazıq-yazıq.
Sorma kimlərdi mühitimdəkilər,
Görməsinlər o günü indikilər.

El, qonum-qonşu bütün molla, qulaq,
Hamı quldur, qoçu – gözlərdən iraq.
Məktəbin çəkmək olardı adını?
Yandırarlar adamın həftadını!
Qoy açım söhbəti əvvəl başdan:
Gizli bir dəfə qohum-qardaşdan,
Gedib uşkollada girdim dərsə.
Taleyim, fikr elədim, istərsə,
Oxuyub bir neçə il qatlaşaram,
Mən də insan kimi rahat yaşaram.
Çəkərəm bir neçə il zəhmətlər,
Xalqıma göstərərəm xidmətlər.
Yetmədi məqsədinə, neylim, əlim,
Oldu öz başıma əngəl əməlim.
Qonşular işlərimi anladılar,
Gedib ətrafıma şeytanladılar",
Əmimə söylədilər onlar: – "Ada!
Qardaşın oğlu verib dini bada.
Qalsa uşkollada bu, ruslaşacaq,
Çaşacaq, doğru yolundan azacaq.
Məsləhət, bizcə, bu fərsiz yetimi,
O qədər döy bu gecə sübhə kimi,
Bəlkə, gəlsin bir az ağlı başına,
Görməsin bir də bir iş özbaşına".
İndi bildinmi, düşündünmü işi,
Gəl məni danlama, bəsdir, a kişi.
Göz açıb gənc zamanımda əyər,
Eylədikcə bütün ətrafə nəzər,
Oxumuş olsa idi dövri-bərim,
İndi dünyanı tutardı əsərim.
Nə edim, gördüm, əmim baqqaldır,
Qoçudur, məhlədə ağsaqqaldır.
Yaxın ətrafım hamı molla-kulaq,
Qan tökən, xalqı soyan, bic, alçaq.
Cəhl min iz buraxıb beynində.
Sözləri dildə "vələzzalin"dir,

İşləri kəlməbaşı, “amin”dir.
Hamısı zırrama, bir cahili-tam,
Ata cahil, oğul ondan da avam.
Müxtəsər, keçdi həyatım bu sayaq,
Düşməyək, gəl, daha mətləbdən uzaq.
Gecə yatdım bürünüb əlbəsəyə,
Göndərildim səhəri mədrəsəyə.
Curlarım kimlər olubdur, demirəm,
İndi də, bəlkə, xəcalət çəkirəm.
Bir yığın tərbiyəsiz xırda uşaq,
Biz gərək gördüyümüzdən danışaq.
Onlara mən də qoşuldum səhəri,
Səsimiz çulğalamışdı şəhəri.
Sataşardıq yetənə, yetməyənə,
Tez söyərdik bizə bir söz deyənə.
Yüklü bir hambal ötərkən yoldan,
Tor qurardıq ona sağdan, soldan.
Sərilərdi yerə bir zorba kişi,
Qırılardı bütün ağzında dişi.
Çırılardı donumuz, qurşağımız,
Köhnə cındır çuxamız, başmağımız.
Börkümüz, pambığı çıxmış dirabı,
Bəzinin yoxdu da başmaq, corabı.
Başımız qırxılı, ya birçək idi,
Biri donsuz, biri köynəkcək idi.
Bir-birilə vuruşardıq özümüz,
Gündə qanqeysən idi baş-gözümüz.
“ – Ada, gəl, tut bu kitab, dəftərimi,
Bir ölüncə döyüm Əbdülkərimi.
Ya döyəm, ya gərək indi döyüləm,
Qorxudan qaçsam, atamdan deyiləm!
Bir də gördün, Həsən atdı daşını,
Əhmədin yardı, qanatdı başını.
Tərlan hər gündə döyərdi Laçını,
Sındırardı yazığın qol-qıçını.
Bitməmişdən biz edən mərəkələr,

Qoşulardı işə bizdən yekələr.
Hamı saqqallı, hamı bığlı kişi,
Başlayardı hamı murdar söyüşü.
Hər məhəllə yığıb öz dəstəsini,
Götürərdi hərə qozdəstəsini.
Fısqırıq, mərəkə, vurhavurdu,
Axtaran yox, kim atıb, kim vurdu?
Bu işin baisi kimdi, yenə biz,
Əyər olsaydı gözəl tərbiyəmiz –
Biz də dünyada bir iş anlardıq,
İndi bir elmli insanlardıq.
Vardı məktəb yerinə mollaxana,
Oxuyanlar hamı gəlmişdi cana.
Mirzəmiz çalmalı Molla Hənfə,
Qarşısında iki erkək xəlfə.
Molla hərdən baxıb ətrafı süzür,
Göz ağardır, dlin ağzında büzür.
Eylə bədheybət idi sür-süfəti,
Tökülərdi adamın baxsa əti.
Hirslənirkən götürürdü çubuğu,
Qarışıb bir-birə saqqalla bığı.
Xəlfələr əldə fələqqə möhkəm,
Sarıyardı uşağı müstəhkəm.
Yazığı tez yerə yıxmaqla haman,
Uşağa verməz idi molla aman.
Çubuq hərdən göyə qalxır, bükülür,
Ayağından uşağın qan tökülür.
Dad edir, ərşə yetir fəryadı,
Göz yaşiylə diləyir imdadı.
– Keç bu təqsirimi, ay molla əmi,
Ah, yandırdı çubuqlar dədəmi.
Daha da molla olurdu əsəbi,
Birəmin qat çoxalırdı qəzəbi.
Özü də, bəlkə, düşünmürdü nə var,
Sürüyə sanki soxulmuş canavar.
Varlı, dövlətli idi hansı bir az,

İncidib onları döymək yaramaz.
Mollanın çünki olar sağ əlidir,
Elə də mollanı bilmə dəlidir...
Xeyrini, şərini çox yaxşı qanır,
Onların mərhəmətindən dolanır.
Hər nə olsa yenə dövlətlidə var,
Pulsuz üryandı, kasıbdan nə çıxar.
Kasıbın dərsə gedərkən balası,
Molladan xahiş edərdi atası,
“Verirəm oğlumu qultək sənə mən,
İxtiyarın var, əyər öldürəsən.
Kəs başın da, sənə qurbandı əti,
Yetər ancaq mənə tək iskeleti”.
Belə bir mədrəsədə kütlə tamam
Qalacaq, şübhəsiz, illərcə avam.
Dərsimiz “əbcəd” idi, “rəbbi-yesir”,
Bu da elm oldumu, ağlın nə kəsir?
Qar, soyuqda şüşəsiz pəncərəsi,
Qapılar bir yana düşmüş hərəsi.
Uçulur ev, hələ torpaq tökülür,
Daşa, divara dəyirsən, sökülür.
Quru, boş mənzil hamı tir-tir əsir,
Qabağında qutu, altında həsir.
Diz çöküb lökləyir hərdən dəvətək,
Gündəlik dərsini əzbərləyərək.
Nə bir ustul, nə də skamyası var,
Nə nizamı, nə də bir qaydası var.
Bir para varlı uşaqlar iki-bir,
Bəlkə ayəndə düşər hərdən-bir.
Gətirirlərdi bir az-maz yanacaq,
O da bir manqal olurdu ancaq.
Qaldı ki, mən kimi sahibsizlər
Soyuq altında qalıb tir-tir əsər.
Mollanın haqqını hər ayda gərək,
Hələ-əlbət bizə borc idi, verək.
Mümkün etməzdi yenə bir paramız,

Verə bilməzdi, yox idi paramız[1]
Əvəzində çox idi xidmətimiz,
Bir bilinməzdi yenə qiymətimiz.
İşimiz aftova doldurmaq idi,
Su gətirməklə odun yarmaq idi.
Mollanın evdə olan xidmətini
Biz görərdik çəkərək zəhmətini.
Arvadından da yaman qorxardıq,
Gündə üç dəfə palaz çırpardıq,
Xanımın xırda hamam xalçasını,
Kirli pal-paltarını, boxçasını.
Aparardıq hamama sürətlə,
Gözləyərdik qapıda növbətlə.
Hələ ki, çıxdı hamamdan çaparaq,
Boxça evdəydi xanımdan da qabaq.
O gəlincə samovar qaynardı,
Hər nə istərsə, evində vardı.
Doşabı, bal, kərəsi, qəndi, çayı,
Ət, düyü müftə, un ondan havayı.
Öz cibindən ki, deyil, el puludur,
El ki, var, mollanın ancaq quludur.
Süpürərdik evini, mitbaxını,
Daşıyardıq çölə tor-torpağını.
Aparardıq naxıra mal-qarasın.
Biri itsteydi verərdik parasın.
Qab-qacaq hər gün olurdu bulaşıq,
Məcməyi, çirkli tava, yağlı qaşıq.
Bunları biz yumalıydıq bir an
Gec yusaq, molla qopardar tufan.
Hamının çalğıya vardı həvəsi,
Tütəyin şən, o gözəl incə səsi,
Qəm tutarkən sıxılan qəlbimizi
Şənlədirdi azacıq, bəlkə, bizi.
Molla ney çalmağa qoymaz, lakin
Bəsləyərdi tütəyə, çalğıya kin.

---
[1] Pul

Musiqi sənətinə düşməndi.
Bizə daim bu idi rişxəndi.
Musiqi çalsa bu dünyada biri,
Şübhəsiz, odlu cəhənnəmdi yeri.
Kim tütək çalsa, o azğın qudurur,
Sanki peyğəmbərə min sillə vurur.
Bir uşaq bir dəfə çaldıqda tütək,
Molla yüzlərlə ona vurdu kötək.
Rəsm elmin bir hünər sanmazdı,
Şer zövqün düşünüb qanmazdı.
Biz hara, sənət hara, elm hara?!
Yazı yazsaydıq – o da cızmaqara.
Özümüz rəsm çəkərdik hərdən,
Onu da molla edərdi qədəğən.
Kim şəkil çəksə idi dəftərdə,
Ona can verməlidir məhşərdə.
Xoşu gəlməzdi müəllimlərdən,
Oxumuş gənc mütəllimlərdən.
Xor baxardı yeni məktəblilərə,
Qəlbən aşiqdi kişi köhnələrə.
Qəzetə, jurnala baxmazdı özü,
“Molla Nəsrəddin”i görməzdi gözü.
Çünki çox yazmış onu jurnalda,
Bu da düşmandı ona hər halda.
– Üləmanı qoyur hər gündə lağa,
Bənzədir mollanı erkək ulağa.
Bir neçə dinsizi yığmış başına,
Olub onlarla yaxından aşina.
Biri rəssam, o biri nasirdir,
Biri şair – o ki lap kafirdir!..
Yığılıb bir yerə bu şeytanlar,
Haqqımızda yazırlar böhtanlar...
Biz ona sanki satılmış qulduq,
Onun əmriylə bütün məşğulduq.
Lap daha gəlmişdik təngə, zara,
Nə qədər gündə gedək biz bazara?

Biz məgər mollaya müftə nökərik?
Lap açıq, sanki, nökərdən betərik,
İşlədir gündə bizi hambaltək,
Bir utanmır da bu saqqallı köpək!
Vardı bir yoldaşımız xeyli dəcəl,
Yekə bir mərəkə, hazır cəncəl.
Yox zirəklikdə bu aləmdə tayı,
Unudulmaz bu gözəl haqqı-sayı.
O bizi topladı bir gün başına.
Dedi: – tək görmərəm iş özbaşına.
Bu məsəldir ki, tək əldən nə çıxar,
El əyər birləşə dünyanı yıxar.
Hamımız verməliyik bizəl-ələ,
Ciddi iş görməli, bitsin məsələ.
Qurmuşam mən buna bir yaxşı kələk,
Götürək hər birimiz bir dəyənək.
O yoğun peysərinə qafildən,
Bərk vuraq, taki o düşsün dildən.
Qoy özü asdığı aşda bişsin,
Məhv olub qarnı öküztək şişsin.
Razı olsa buna yoldaşlar əyər,
Edərik bir-birinə indi xəbər.
Hamı bir səslə bəyəndik bu sözü,
Başda Əhməd yenə olmaqla özü.
Biz də söz verdik ona birləşərik,
Olarıq fikrinə bu işdə şərik.
Qalsaq ondan geri namərdik əyər,
Hamımız hazırıq üsyana səhər.
Mollanı salmaq üçün böylə tora,
Günüzün məsləhətindən sonra.
Bu gecə biz iki yoldaş seçdik,
Bu çətin dərsi çox asan keçdik.
Əhmədi məclisin etdik sədri,
Katib etdik ona Əbdülqədiri.
Onlar hər işdə cəsarətliydi,
Bacarıqlıydı, ləyaqətliydi.

Sədri təbrik elədik, əl vurduq,
Sonra sakitcə dayandıq, durduq.
Sədr söz verdi ən əvvəl Səfərə,
O da döndərdi üzün bir nəfərə.
Baxınız, bir bu çəlimsiz uşağa,
Qılçasından dura bilmir ayağa.
Özü yoxsul balası, həm də qərib,
Üz-gözü gör necə gömgöy göyərib.
Yazığı xəlfə salıbdır bu hala,
Molladan qalmaz o zalım da dala.
Elə hiddətli vurubdur gözünə,
Yıxılıb, gəlməyib üç gün özünə.
Əlli yumruq ona vurmuşdur azı,
Ağlamaqdan tutulubdur boğazı.
Əzilən, məhv olan hər yerdə kasıb,
Qatlaşan möhnətə, hər dərdə kasıb.
Oğlu olsaydı bu bir qolçomağın,
Xəlfənin lap qopardı qulağın.
Ya əyər varlı olardı əsli,
Xəlfənin lap qırılardı nəsli.
Yerdə qoysaq bu işi, biz dəliyik,
Hələ dərd çəkməli, qəm çəkməliyik.
Düşmənin yağsa oxu hər yandan,
Yenə qorxan deyilik düşmandan.
Gavənin çatmasa Zöhhakə gücü,
İntiqam almaq üçün var çəkici,
Mən bununla sözümü qurtarıram,
Sizə yoldaşcasına yalvarıram,
Bu gözəl məqsədin üstündə duraq,
Xəlfə vicdansızı da xeyli vuraq.
Birgə bu məsləhəti xoşladılar,
Səfəri əl çalıb alqışladılar;
– Afərin fikrinə! Əhsən! Əhsən!
Yaşa, yoldaş! – dedilər, ölməyəsən!
Bürüdü məclisi səs-küy, bir uşaq
Üz tutub sədrə tərəf söylədi: “Bax,

Mən açıq söyləyirəm, yoldaşlar!
Səfərin burda bir az səhvi də var.
Demirəm, xəlfə bizə yoldaşdır,
Şübhəsiz, qəlbi onun da daşdır.
İlanın, istəsə ağı, qarası
Fərqi yoxdur, yenə birdir yarası.
Vardır ancaq bu işin bir səbəbi,
Xəlfə də molladan almış ədəbi.
Qanmayıbdır, o cavan oğlandır,
Onu yıxmaq bizə bir nöqsandır.
Get-gedə, məncə, o islah olunar,
Belə qalmaz əlimizdə yonular.
Olmuram razı bu işdə Səfərə,
Gəncləri almalı mütləq nəzərə.
Xəlfə gəncdir, onu qandırmalıyıq,
Mollanın nəslini yandırmalıyıq,
Molla məhv olsa bitər mövhumat.
Parladar ruhumuzu şanlı həyat.
Öz sözümdə yenə təkrar edirəm.
Mollanın məhvini israr edirəm.
Bu gözəl təklifi məclisdəkilər,
Hamı bir səslə qəbul eylədilər.
Sədr sürətlə yerindən qalxdı,
Sanki göy gurladı, şimşək çaxdı.
Molladan başladı əvvəlcə özü,
Hamının qəlbini titrətdi sözü:
– Yetər, artıq yaşadıq heyvantək,
Biz də bir an dolanaq insantək.
Yenəmi möhnətə qatlaşmalıyıq?
Bu əsarətdən uzaqlaşmalıyıq.
Nə qədər molla bizi incitsin?
Zalımı məhv edək, artıq bitsin.
Xalq düşmənlərinə rəhm eləmək,
Qoyunu qurda yedirməkdi demək.
Zalımın kim diləyirsə əcəlin,
Mərd iyidlər kimi qaldırsın əlin.

Mollanın qətlinə verdik fitva,
Yaşasın sədrimiz, urra, urra!
Dərsə getdik bu səhər lap tezdən,
Etməsin şübhə görənlər bizdən.
İşi əvvəlcə düşündük, qandıq,
Səs-səmirsiz məscidə yollandıq.
Bu işin gər açılarsa üstü,
Başımızdan çıxacaqdı tüstü.
El bütün mollaqulaq, biz də dəcəl,
Ölümüzdən də götürməzdilər əl.
Lazımınca işə gördük tədbir,
Yeridik məktəbə bir-bir, iki-bir.
Yığışıb orda yenə birləşdik,
Yerimizdə hamımız əyləşdik.
Axtarırdıq ələ fürsət ki, düşə,
Molla bircə bu kəməndə ilişə.
Çıxmasa ovçu özü hövsələdən,
Tülkünün quyruğu çıxmaz tələdən.
Baxtımızdan yenə də molla bu gün
Cinlənib, iz salıb altında düyün.
Baxmayır bir kəsə, kim gəldi döyür,
Nə gəlir ağzına hiddətlə söyür.
Doldurub məktəbə çirkin səsini,
Çırpır hərdən yerə əmmaməsini.
Səs salıb məscidə sanki topdu,
Ya ki günbəzmi yerindən qopdu?
Döndü xalis naxıra mollaxana,
Bəyirir, "mo-mo" edir sanki dana.
Hey tutursan da, tutulmur da köpək,
Görünür, xətrinə düşmüşdü kötək.
Bir kəsə bəlli deyildi səbəbi,
Bizi də eylədi axır əsəbi.
Biz də ki eyləmədik tənbəllik,
Bu əyər ölsə, dedik – dincəllik.
Lazımınca ona vurduq dəyənək,
Qaralıb hər yeri oldu döyənək.

Çox da zənn eyləməyin iş bitdi,
Bu döyülmək də cibindən getdi,
Açıb örkən kimi əmmaməsini,
Yerə yıxdıq o kobud gövdəsini.
Bağladıq mədrəsənin minbərinə,
Yenə də vurduq o kəl peysərinə.
Öldü bildik, qapını tez açdıq,
Mollanı təkcə buraxdıq, qaçdıq.
Görmədik bir neçə il ondan əsər,
Molla qaçmışdır o gündən dedilər.
Mollamız onda bu qansızlardı,
Zülm əlindən yaxamız qurtardı.
Mollanın tərkin edəndən sonra
Bizə bambaşqa göründü dünya.
Yeni bir zövq ilə gəldik həvəsə,
Yeni məktəblərə girdik dərsə.
Gərçi, insanca nəzərdə yoxuduq,
Yenə lənət heçə, az-maz oxuduq.
Cana gəldikcə bu ruhsuz ölülər,
Onu da qoymadı əmmaməlilər.
"Vay, şəriət!" deyərək minbərdə
Asdılar kütlə gözündən pərdə.
Yazdılar mətləbi gizlində çara,
Çar da quyruq buladı mollalara.
Özgələr güldü, bular ağladılar,
Yeni məktəbləri də bağladılar.
Üləma bildirərək adlarını,
Qoydular dərsə öz övladlarını.
Soydular xalqı o vicdansızlar,
Canavarlar – yaramaz, qansızlar.
Keçdi getdi o qaranlıq dəmlər,
Doğdu gün, açdı qızıl rəngli səhər.
Yurdumuz oldu sovetlər vətəni,
Sevir indi hamı elmi sevəni.
Baxsan hər bir yana, kəndə, şəhərə,
Çarpacaq elmü maarif nəzərə.

Açılıb elm evi on minlərcə,
Kimi gündüz oxuyur, kimsi gecə.
Oxumuş elmli insanıq biz,
Var məharətli müəllimlərimiz.
Gələcək nəslin onlar rəhbəridir,
Ölkənin şən, qızıl əskərləridir,
Nə müəllim uşağa nifrət edir,
Nə müəllimdən, o bir qiybət edir.
Vardı yüzlərcə mühəndislərimiz,
Fənni-elmi-mütəxəssislərimiz.
Yüksəlir günbəgün istehsalımız,
Neftimiz, pambığımız, xam malımız.
Özgələrdən daha yox minnətimiz,
Yaradır hər şeyi öz zəhmətimiz.
Kaş bir böylə gözəl aləmdə,
Gənc olub elm oxuyaydım mən də.

# MÜNDƏRİCSAT

SATİRİK ŞEİRLƏR

POEMA

